# QÖVSİ TƏBRİZİ

# DİVAN

**BAKI – NURLAN – 2005**

**Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun 14 yanvar 2005-ci il tarixli 1 №-li iclasının qərarı ilə nəşr edilir.**

**Nəşrə hazırlayan:** **Paşa KƏRİMOV,**
**filologiya elmləri namizədi**

**Redaktoru:** **Məmməd ADİLOV,**
**filologiya elmləri doktoru**

**Qövsi Təbrizi. Divan, Bakı: Nurlan, 2005, 449 s.**

*XVII-XVIII əsrlərin müqtədir Azərbaycan şairi Əlican Qövsi Təbrizinin oxuculara təqdim edilən «Divan»ı filologiya elmləri namizədi Paşa Kərimovun müxtəlif əlyazma versiyaları əsasında orijinal qrafikada tərtib etdiyi elmi-tənqidi mətn əsasında hazırlanmışdır. Şairin lirik yaradıcılıq irsi ilk dəfə tam şəkildə nəşr edilir.*

## QÖVSİ TƏBRİZİNİN «DİVAN»I

Əlican Qövsi Təbrizi XVII-XVIII əsrlərin görkəmli Azərbaycan şairi, Səfəvilər dövründə inkişaf etmiş anadilli şeirimizin ən tanınmış nümayəndələrindən biridir.

Tədqiqatçılar "Qövsi" təxəllüslü üç şairin izinə düşmüş, onların bir nəsildən olduqlarını göstərmişlər. Ancaq tarixi təhlillər daha çox şairin bu təxəllüsü daşıdığını sübut edir. Azərbaycan türkcəsində lirik şerlər toplusu —"Divan" müəllifi olan Əlican Qövsi Təbrizinin kimliyi barədə müxtəlif təzkirələrdə rast gəlinən məlumatları dəqiqləşdirmək üçün şairin özünün əsərləri əvəzsiz mənbədir. Görkəmli ədəbiyyatşünasımız Salman Mümtaz Qövsi ilə bağlı tarixi adlardan çıxış edərək yazır: "Qövsinin yaşadığı əsrə gəldikdə, hicri XI, miladi XVII əsrlərdir. Çünki Şah Abbas Sani, Şah Süleyman, Ağahüseyn Xansari, Mirzə Tahir də XI əsrdə yaşamış tarixi şəxslərdir ki, onların yaşadıqları əsr barədə heç bir ixtilaf ola bilməz. Hələ Qövsinin ustadı olaraq Zülcəmalin ləqəbi ilə məşhur olan Ağahüseyn Xansarinin hicri 1077-də Şah Süleymanı niyabətən Səfəviyyə taxtına oturtduğu nəzəri-etibarə alsaq, Qövsinin *XI əsrin nəhayətində* (kursiv bizimdir—P.K.) hal-həyatda olduğunu qəbul etməyə məcburuq. Mirzə Tahir bağını tərif və tövsif edən Qövsi, şübhəsiz, hər iki hökmdarın, yəni Şah Abbas Sani ilə oğlu Şah Süleymanın zamanlarını dərk edə bilmişdir"[1].

Şairin yaşadığı illər haqqında hipotetik məlumat əldə etmək üçün istifadə olunan tarixi adlardan ən çox maraq doğuranları Mirzə Tahir Vəhid və Uğurlu xan Ziyad oğlu Müsahibdir. Azərbaycan Sovet Ensiklopediyasında deyilir ki, Məhəmməd Tahir Vəhid 1606-cı ildə Qəzvində anadan olmuş, 1701-ci ilədək yaşamışdır. II Şah Abbasın vaqiənəvisi kimi "Abbasnamə" tarixi əsərini yazmış, 1689–1697-ci illərdə əvvəl I Süleymanın, sonra I Şah Hüseynin baş vəziri (etimadüddövlə) olmuşdur[2]. Onun "Vəhid" təxəllüsü ilə yazdığı şeirlər Qövsi yaradıcılığına güclü təsir göstərmişdir:

Nə yaxşı söyləmiş, Qövsi, Vəhidi-pakgövhər kim:
"Məni yandırdı bir atəş ki, düşməndən irağ olsun".

---

[1] Salman Mümtaz. Azərbaycan ədəbiyyatının qaynaqları. Bakı: Yazıçı, 1986, s.103.
[2] ASE. II cild. Bakı, 1978, s.470.

Şeirlərindən birində dövrünün digər tanınmış şəxsiyyəti – Uğurlu xan Ziyad oğlu Müsahibin də adını çəkməsinə, bəzi digər dəlillərə əsasən, Əlican Qövsi Təbrizinin XVII əsrin ortalarından XVIII əsrin əvvəllərinə qədər yaşadığını söyləmək mümkündür.

Qövsinin əsərlərindən nümunələr ilk dəfə 1925-ci ildə Firidun bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı tarixi materialları" əsərinin birinci hissəsində nəşr olunmuşdur. Həmin ildə Salman Mümtaz şairin altmışa yaxın qəzəlini ayrıca kitabçada "Kommunist" qəzetinin nəşriyyatında nəşr etdirmişdir. 1958-ci ildə akademik Həmid Araslı Qövsi "Divan"ının Tiflis və London nüsxələri əsasında onun seçilmiş əsərlərini (buraya şairin 145 qəzəli, 1 mürəbbesi, 2 müxəmməsi, 1 müqəddəsi, 1 tərkibbəndi, 4 tərcibəndi daxil edilib) çap etdirdi. "Azərbaycan klassik ədəbiyyatı kitabxanası" 20 cildliyinin 1988-ci ildə nəşr edilmiş VI cildinə Qövsinin də əsəri daxil edilmişdir.

Qövsi Təbrizi əsərlərinin nəşri tarixi hələlik bununla bitir. Onun yaradıcılığını əhatə edən Azərbaycan türkcəsində "Divan"ının bütövlükdə nəşri ədəbiyyat tariximizin öyrənilməsi baxımından böyük əhəmiyyətə malikdir.

Son illərin tədqiqatları göstərir ki, XVII əsrdə Azərbaycan ədəbiyyatı, bəzi müəlliflərin iddia etdiklərinə baxmayaraq, heç də az məhsuldar olmamış, sadəcə olaraq ədəbiyyatımız bu dövrdə dünya xəzinəsinə Nizami, Nəsimi, Füzuli, Xətai kimi dahiyanə şəxsiyyətlər bəxş edə bilməsə də, əslində bu dövrdə poeziyanın demokratikləşməsi və xəlqiləşməsi prosesi güclənmişdir. Yazılı mənbələr üzərində işin genişləndirilməsi, dövrün bir sıra müxtəlif səviyyəli şairlərinin ədəbi irsinin aşkara çıxarılması XVII əsri Azərbaycan poeziyasında keyfiyyətcə yeni bir mərhələ kimi qiymətləndirməyə əsas verir. Azərbaycan türkcəsini Səfəvilər dövlətinin rəsmi dövlət dili elan edən Şah İsmayıl Xətainin hakimiyyətindən sonrakı dövrlərdə də bu dildə yazılan əsərlərin sayı artmaqda idi. Klassik üslubla bərabər, şifahi xalq ədəbiyyatı janrlarının

inkişafı həmin dövr ədəbiyyatının xarakter cəhəti kimi nəzərə çarpır. Məsihi, Əmani, Saib Təbrizi, Qövsi Təbrizi, Tərzi Əfşar, Təsir Təbrizi kimi sənətkarlar klassik üslubda yaradıcılıqlarını davam etdirdikləri halda, Abbas Tufarqanlı, Sarı Aşıq xalq arasında geniş yayılan qoşma və bayatılar yazırdılar. Bir sıra qəhrəmanlıq və məhəbbət dastanlarımız — "Koroğlu", "Əsli və Kərəm", "Aşıq Qərib", "Şah İsmayıl" məhz bu dövrdə meydana çıxmışdı.

Təqiqatçılar haqlı olaraq göstərmişlər ki, "Füzuli ədəbi məktəbinin qüvvətli davamçısı olan Qövsi klassik şeir dilimizin sadələşməsi, xəlqilik elementləri ilə zənginləşməsi yolunda ciddi addım atmışdır. Bu mənada Qövsini bir növ Şah İsmayıl Xətai ilə müqayisə etmək, onu "XVII əsrin Xətaisi" adlandırmaq olar. Belə ki, ədəbi dilimizin (yazılı şeir qolunun) inkişaf tarixindəki mövqeyinə və roluna görə Xətai Nəsimi ilə Füzuli arasında körpüdürsə, Qövsi Füzulini Vaqiflə birləşdirir"[3]

Qövsiyə elə bir dövrdə yaşayıb-yaratmaq nəsib olmuşdur ki, o həm köhnə Azərbaycan dilinin klassik şeir dili mərhələsini (XV–XVII əsrlər), həm də yeni Azərbaycan dilinin xəlqiləşməsi dövrünü (XVIII) öz yaradıcılığında inikas etdirə bilmişdir. Məhz buna görə də "zərif və xoştəb" şairin "bəzi qəzəllərinin axırıncı fərdində Qövsi əvəzinə Qüdsi və ya Zakir və ya Seyid yazılsaydı, onda Qüdsinin, ya Zakirin və ya Seydin kəlamı olduğuna kimsə şübhə etməzdi"[4]. Başqa sözlə desək, Qövsi özünə qədərki klassik şeir ənənələrindən müəyyən dərəcədə uzaqlaşmış, zəmanəsini qabaqlamış sənətkarlarımızdandır.

Şairin əsərlərini öyrənən müəlliflər Qövsi lirikasının iki mənbədən, xalq yaradıcılığı və klassik ədəbiyyatdan baş aldığını göstərmişlər. Şairin "Divan"ını vərəqlədikcə onun sələflərindən— Nəvaidən, Füzulidən, müasirlərindən —Saib Təbrizi, Mirzə Tahir Vəhid, Sahir və başqalarından nə dərəcədə təsirləndiyini açıq-aydın hiss edirik.

---

[3] Y.Seyidov, S.Əlizadə. Klassik Azərbaycan şairləri söz haqqında. Bakı: ADU nəşri, 1977, s.97.

[4] F.Köçərli. Azərbaycan ədəbiyyatı. I cild. Bakı, 1978, s.219.

Qövsi yaradıcılığına ən böyük təsiri böyük Füzuli şeiri göstərmişdir. Faktiki olaraq bütün "Divan" boyu biz Qövsinin böyük məmnuniyyət və acgözlüklə Füzuli kəlamından ilhamlandığını, onu özünə həkim və müdrik bir müəllim tutduğunu həm duyuruq, həm də görürük. O, Füzuli təsiri ilə yazılmış qəzəllərinin əksəriyyətinin son beytini öz müəllimindən iqtibasla bitirir.

Bu həmin rəna qəzəldir ki, Füzuli söyləmiş:

"Doğru derlər, hər zəman bir aşiqin dövranıdır".

Yaxud:

Qövsi, bu ol qəzəli-nəğzi-Füzulidir kim:

"Necə ah eyləməyim, ah, yanıbdır cigərim"…

Şairin Füzuli adı çəkilməmiş qəzəllərində də biz asanlıqla Füzuli təsirini hiss edirik. Məsələn:

Mən ki əldən getdim, ol sərvi-səbükcövlan gəlir,
Ah, bilməm neyləyim kim, can gedir, canan gəlir.

yaxud:

Daği-cünun yapışmadı könlünə zahidin,
Bu möhrü gər qara daşa bassan, nişan tutar…

Füzuli ilə bu ünsiyyət Qövsi Təbriziyə Füzuli sənətkarlığını davam etdirmək imtiyazı, Füzuli dilini və Füzuli qəzəliyyatını sonrakı əsrlərə ötürmək səlahiyyəti vermişdir.

Məşhur alimimiz Mirzağa Quluzadə yazırdı ki, "Füzuli lirikasının Qövsi yaradıcılığı üzərindəki xeyli qüvvətli təsirini Qövsinin zəif, epiqonçu şair olması ilə izah etmək səhvdir. Söz yoxdur ki, Füzuli yeni ədəbi məktəb yaratmış dahi sənətkardır. Qövsi isə onun ən istedadlı və görkəmli davamçılarından biridir"[5]

Buna bənzər fikirlərlə digər tədqiqatçılarda da rastlaşırıq: "Şübhəsiz ki, Qövsi Füzulini təqlid etməmiş, əksinə, böyük şairin şeirlərindən klassik

---

[5] M.Quluzadə. Füzulinin lirikası. Bakı, 1965, s.356–357.

sənətin gözəl, mükəmməl nümunəsi kimi öyrənərək, öz yaradıcılıq simasını parlatmış, orijinal sənət inciləri yaratmışdır”[6]

Qövsi böyük özbək şairi Əlişir Nəvaidən (1441-1501) də öyrənmiş, öz şeirlərində ondan iqtibas gətirmişdir:

Bu həmin rə`na qəzəldir ki, Nəvai söyləmiş:
“Sürməgun tünlərdə hicran şami tut bidar göz”.

Qövsi poeziyasının zənginliklərinə baş vurduqca onun çoxcəhətli olduğunu, ilk baxışda bir-biri ilə tam ziddiyyət təşkil edən təzadlı dünya duyumlarının, dini-fəlsəfi mövqelərin gen-bol rast gəlindiyini görürük. Qövsi, bir tərəfdən, “insan və onun məhəbbətinə vurğun”[7] şairdir, ikinci tərəfdən, “zahiri hüsni-camal və xəttü xal ilə onun işi” olmadığını, aradığının “sahibi-dil və hüsni-məna”[8] olduğunu görürük.

Qövsi bir tərəfdən nikbin şairdir və gələcəyə böyük inamla baxır, digər tərəfdən, həyatın keşməkeşindən cana gəlmiş şairin sızıltılarını eşidirik.

Zəmanəsinin bütün ədalətsizliklərini görən gözüaçıq şairin bəzi şeirlərində onun yaranmış vəziyyətdən çıxış yolunu tapmadığını görürük:

Cəhanda hər kimi gördüm, unutdum öz-özümü,
Kimin muradı ilə bəs fələk dönər, ya rəb?

Onun bəzi şeirlərində tərki-dünyalıq notları sezilir:

Arxa vermə varına, bel bağlama dünyayə kim,
Xərməni vardır, vəli bərqi-səbükcövlanı var.

---

[6] Ə.Səfərli, X.Yusifov. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı. Bakı, 1982, s.336.
[7] M.Seyidov. Qövsi Təbrizi. Bakı: Azərb. EA nəşri, 1963, s.52–68.
[8] F.Köçərli. Göstərilən əsəri, s. 222–223.

Lakin tərki-dünyalıq çağırışları Qövsi yaradıcılığında epizodik səciyyə daşıyır, bir-iki yerdə rüşeym halında gözə dəyib qalır, inkişaf etmir. Qövsi yaradıcılığında aparıcı mövqedə həyat eşqi, gələcəyə inam və saf məhəbbət ideyaları, vətənpərvərlik motivləri durur. Qövsi əsərlərinin əksər hissəsi həyatla bağlıdır, qəlbi məhəbbətlə dolu olan şair gələcəkdən ümidini kəsmir:

Sənin muradın ilə oldu gər zəman, Qövsi,
Mənim də bir gün olar ruzigar kamımca.

"Mərdümi-çeşmim əgər gahdə bir gün gülər", – deyən şair inanır ki, fələk bir gün onun üzünə güləcəkdir.

Qövsi məhəbbət və gözəllik şairidir. Onun lirikası sevgilisinə qarşı ən səmimi duyğularla doludur. Qövsi sevgilisini vəsf etmir, ona mədhiyyə söyləmir, o şeiri ilə öz gözəlini sevir və sevə-sevə də şeir yazır:

Məndə, ey kaş ki, yüz can ola, qurbanın olum,
Hamı bir-bir sənə qurban ola, qurbanın olum.

və yaxud:

Kimi can etdi, kimi könlünü dildarə fəda,
Bilmənəm mən ki, yoxumdur, nə edim yarə fəda?

Bu kimi misralar Qövsi lirikasının məziyyətlərini səciyyələndirir və Azərbaycan poeziyasının səhifələrinə qızıl hərflərlə yazıla bilər.

İctimai mühit, zəmanənin eybəcərlikləri onu sıxsa da, Qövsinin qəhrəmanı əyilmir, təslim olmur. O, elindən-obasından qüvvət alır, məhəbbətdən ilhamlanır. Şairin surəti qarşımızda qüvvətli insan kimi

canlanır, o, həyat eşqi, həyata bağlılığı ilə diqqəti çəkir. Qövsi qüvvətli, humanist, insanlara, dostluğa və mehribanlığa inanan şairdir:

Sorsan nədir muradın cami-cəhannümadən,
Mərdanə canfəşanlıq, məstanə mehribanlıq.

Qövsi poeziyası ictimai həyatla bağlı olub, vətənpərvərlik ideyalarını özündə ifadə etmişdir. Tədqiqatçılar göstərirlər ki, "XVII əsrdə vətənpərvərlik ideyaları... Qövsi Təbrizi sənətində formalaşdı, problemə çevrildi və bədii ifadəsini tapdı"[9].

Şairin yaradıcılığındakı vətənpərvərlik motivlərini, onun doğma vətəninə, ana dilinə olan məhəbbətini hər şeydən əvvəl yaşadığı dövrlə əlaqəli şəkildə nəzərdən keçirmək lazımdır.

I Şah Abbas 1591-ci ildə ölkənin paytaxtını Təbrizdən Qəzvinə köçürdükdən sonra Azərbaycan dili və mədəniyyəti ciddi problemlər qarşısında qaldı. Sonralar, paytaxt İsfahana köçürüləndən sonra "XIII əsrin sonlarından başlayaraq ədəbi dil halını almış" və "Cəlairlər, Qaraqoyunlar, Ağqoyunlar, Səfəvilər kimi türk dövlətlərinin saray və ordu lisanı olan azəri türkcəsi, yaxud şərqi oğuz ləhcəsi"[10] də Əlican Qövsi Təbrizi zəmanəsində əvvəlki mövqelərini itirdi və şair Qövsini vətənpərvərlik ideyaları ilə silahlandıran amillərdən biri də bu oldu. Təsadüfi deyildi ki, şairin şeirlərindəki siyasi ştrixlər arasında ana dilinin sıxışdırılmasından, bu dilə qarşı diskriminasiyadan şikayət motivləri ilə rastlaşırıq.

Təbrizdə ilk təhsil alandan sonra İsfahana gələn şair azərbaycanlıların mühitindən uzaq düşür. İsfahanda yaşayan azərbaycanlı əyan və ziyalıların öz ana dilinə xor baxması Qövsini sarsıdır. O, vətəni Təbrizə dönmək istəsə də, bacarmır, İsfahanda qalıb yaşamalı olur.

---

[9] Q.Cahani. Azərbaycan ədəbiyyatında Nizami ənənələri (XII-XVII). Bakı, 1979, s.188.
[10] M.F.Köprülüzadə. Türk dili və ədəbiyyatı haqqında araşdırmalar. İstanbul, 1934, s.7.

İsfahanın siyasəti onun arzularının qol-qanad açmasına mane olur, "dilsizlik-bizəbanlıq" onu yandırıb yaxır:

Həray kim, nə dilim var, nə bir dil anlayanım,
Əgərçi ney kimi, cismim fəğan ilən doludur.

Başqa bir şeirində şair:

Dilim yoxdur mənim, ey ney,sənə heç nisbətim yoxdur,
Veribdirlər mənə dərdi, alıbdırlar fəğan məndən, —

deyə sızlayır.

Qövsini ümumiyyətlə saray və ya İsfahan mühitində Azərbaycan dilinin sıxışdırılmasından da çox öz millətdaşlarının ana dilini bilməməsi, ona kəc baxması yandırır və şair onları: "öz dilin, ey tifli-dilbilməz, biləydin kaş ki!"— deyə məzəmmətləyir.

Qövsi Təbrizi nə qədər vətəni və ana dili üçün həsrət çəksə də, birdəfəlik paytaxt İsfahanda məskən salıb yaşamalı olur. Lakin bütün ömrü boyu Təbriz ağrısı, vətən həsrəti onu tərk etmir:

Təbriz cəzbəsi yaxamı tutmuş, aparır,
Qövsi, əgərçi damənimi İsfahan tutar.

Qövsi Təbrizi Kəbəyə bənzədir, İsfahanda yaşamalı olduğu üçün indi ona Təbrizi Kəbə kimi arabir ziyarət etmək, onu Kəbəyə bənzətmək qalır:

Qövsi, gərəkdi Kəbə deyib iqtida qıla,
Təbriz qülləsinə Sifahan dedikləri.

Tədricən bir əyalət şəhərinə çevrilməyə başlayan, dəfələrlə tar-mar edilmiş Təbriz Azərbaycan xalqının hesabına zinətlənmiş, cənnətlə müqayisəyə girişən İsfahandan da üstündür, çünki Qövsinin könlü açılsa-açılsa, ancaq Təbrizdə açılar, İsfahan mühiti isə şairin qəlbini açmır:

Təbriz açar könlümü, Qövsi, gər açılsa,
Hərçənd ki, firdovsi-Sifahanə yetişməz.

Lakin illər ötür, nə qədər ağır güzəran keçirsə də, Qövsi paytaxtın gur həyatına öyrəşir və artıq İsfahanda səbri-qərar tutur, daha Təbrizə qayıtmağa can atmır:

Şükr, yüz şükr ki, hərçənd qəribəm, Qövsi,
Səri-kuyində anın yadimə düşməz vətənim.

Əlican Qövsi Təbrizinin Füzuli poeziyasının bir məktəbə çevrilməsində rolu daha bariz qiymətləndirilməlidir. Belə ki, dahi Füzuli yaratmış, Qövsi, isə bu yaradıcılığı davam etdirmək ənənəsini yaratmış və əslində, Füzuli məktəbini təsis etmişdir və özündən sonra gələn Azərbaycan şairlərinə bir növ dədə Füzuli poetikasından bəhərlənməyin sirlərini öyrətmiş, ədəbi yaradıcılıqda füzulişünas olmağın yollarını göstərmişdir. "Qövsi irsi Füzuli ədəbi məktəbinin ən yaxşı davamı kimi ədəbiyyat tariximizə daxil olur".[11]

Qövsi dövründə anadilli ədəbiyyatımız nə qədər çətinliklərlə üzləşsə də, əsrlərin dərinliyindən gələn milli ədəbi dil ənənələrini davam etdirirdi, "türk dili (Azərbaycan türkcəsi nəzərdə tutulur—R.K.) qaydalarını və

[11] H.Araslı. XVII–XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı: ADU nəşri, 1956, s.169.

təmizliyini saxlamaqla indiki dövrdə (təbii ki, XIX əsrdə —R.K.) olduğu qədər ərəb və fars sözləri ilə təhrif edilməmişdi".[12]

Əlican Qövsi Təbrizi yaradıcılığının da dayağı ana dilidir, o, birinci növbədə Azərbaycan türkcəsindən çıxış etmiş, bu dillə silahlanıb ilhama gəlmiş, bu dilə söykənərək ədəbi mübarizə aparmışdır.

Qövsinin dili sadə, asan və dövrün bütün təbəqələrinin anlayacağı dərəcədə demokratik, xəlqi və kütləvidir. Qövsidə elə şeirlərlə rastlaşırıq ki, bu şeirlərin xalq yaradıcılığı nümunəsi olduğu, onların xalqın nəfəsindən yoğrulduğu, xalqın dilindən axıb gəldiyi haqqında təəssürat yaranır:

Könlümdəki muradım,
Ey yar, sən bilirsən.
Hər dil ki, bilmənəm mən,
Dildar, sən bilirsən.

və ya:

Eylə kim, dərman sənindir,
Dərdi-bidərman sənindir.
Hər nə etsən, padşahım,
Eylə kim, fərman sənindir —

misralarındakı hər bir kəlmə, hər bir təbir nəinki XVII əsrdə Azərbaycan dili üçün adi və bütün xalqın dilində işlənən ən aktiv vahidlərdən idi, bu söz və ifadələr hətta bugünkü poeziyamızda və ümumxalq dilimizdə belə aktiv olaraq qalmaqdadır. Qövsi şeirlərindəki ərəb-fars kəlmələri bugünkü ədəbi dilimizdə belə işlənməkdədir.

---

[12] Л.М.Лазарев. Сравнительная хрестоматия турецкого языка наречий Османлы и Азербайджана. М., 1866, с.3.

Qövsi üsulunun qüsursuzluğu, zərifliyi, xüsusən şairin Azərbaycan şeir dilinə dərindən bələd olması onu çağdaşları arasında seçkin mövqeyə çatdırmışdır. Qövsinin böyük zövq və məharətlə işlətdiyi üçüzlü tərkiblər və mürəkkəb sifətlər şeirə yeni bir söyləyiş qüdrəti vermişdir. Şair ərəb-fars tərkiblərini ən çox azərbaycanlaşdıran bir dilə sahibdir. Sözlərin hər anlamına bir dəyər verərək, yeni ifadə qüdrətilə söz zəncirinə incilər düzən şairin şeirləri incə lirizmi, səmimiliyi ilə seçilir.

Qövsi yaradıcılığı boyu şeirin mənasını, onunla şeirin məzmun vəhdətini düşünmüş, sözləri və ifadələri elə bir ahəng və saf-çürüklə seçmişdir ki, şeirin ana mövzusu və daxili mahiyyəti ilə səsi, xarici qişası arasında bir uyğunluq saxlamağa müvəffəq olmuşdur.

Şair təxəyyülü ilə çatdığı bu ölçüdən, kənar aləmdən və düşüncələrinin yaratdığı zəngin və çeşidli gözəlliklərdən o dərəcədə məmnun olur ki, "bir ümmanə bənzəyən xəyal sahibi istərsə, o dənizin sahilində incidən qalalar tikər" fəlsəfəsi aşılayır. Şair Qövsi öz üslubunun potensial imkanlarından hərtərəfli istifadə edir, öz xəyal və təxəyyül ümmanını qorumaq üçün qüdrətli bir qala tikir.

Əlican Qövsi Təbrizinin lirikası həm öz dövründə, həm də ölümündən keçən yüzilliklərdə görkəmli ədəbiyyatşünaslar tərəfindən yüksək qiymətləndirilmiş, onun şeirləri xalq arasında məşhur olmuşdur. Şairin "Divan"ı müxtəlif xəttatlar tərəfindən dəfələrlə köçürülmüş, Azərbaycanda, Türkiyədə, İranda və türkdilli poeziyaya qiymət verən başqa bölgələrdə yazılmışdır. Lakin təəssüf ki, Qövsi əsərlərinin əlyazma nüsxələri indiyədək tam şəkildə qeydiyyata alınmamış qalır.

Qövsi "Divan"ının elmi-tənqidi mətni tərtib edilərkən onun dörd əlyazma nüsxəsindən (Bakı, Tiflis, London, İstanbul), həmçinin ayrı-ayrı mənbələrdəki şeirlərdən istifadə edilmişdir.[13] Bakı nüsxəsi 918, Tiflis nüsxəsi 4200, London nüsxəsi 3382, İstanbul nüsxəsi 2767 beytdən

---

[13] P.Ə.Kərimov. Əlican Qövsi Təbrizi "Divan"ının tekstoloji tədqiqi və elmi-tənqidi mətni. Namizədlik dis., Bakı: 1991.

ibarətdir. Bunların içində daha mükəmməl hesab edilən və tərtib edilən Qövsi "Divan"ının əsasında duran Tiflis nüsxəsində 448 qəzəl, 1 mürəbbe, 1 müxəmməs, 1 müsəddəs, 3 tərcibənd, 2 tərkibbənd vardır.

Şairin "Divan"ının elmi-tənqidi mətnini tərtib edərkən mətnşünaslıqda hakim olan belə bir fikir əsas götürülmüşdür ki, "yalnız tənqidi nəşr klassik şairin yaradıcılıq irsinin öyrənilməsi və elmi təhlili üçün əsas zəmin ola bilər"[14] və "tənqidi mətn olmadan heç bir digər iş həyata keçirilə bilməz"[15]. Tənqidi mətn tərtib edildikdən sonra "Divan" müəllifinin dövrü və həyatı haqqındakı məlumatları bir daha nəzərdən keçirmək, Qövsi irsini daha geniş tədqiqatlara cəlb etmək imkanı yaranır. Tənqidi mətn üzərində tədqiqatların daha artıq mötəbər olduğunu inkar etmək çətindir.

Beləliklə, 4146 beytdən ibarət Qövsi "Divan"ının elmi-tənqidi mətni orijinal yazıda nəstəliq xətti ilə köçürülərək elmi işə 778 səhifədən ibarət əlavə edilmişdi. Bunlar 513 qəzəl, 3 tərcibənd, 1 tərkibbənd, 2 müxəmməs, 1 müsəddəs, 1 mürəbbeni əhatə edir. Müxtəlif nüsxələrdə rast gələn başqa şeirlərin mətnə salınması üçün əldə kifayət edəcək qədər fakt olmamışdır.

Qövsi "Divan"ının indiyədək əldə edə bilmədiyimiz nüsxələri haqqında da məlumatımız vardır. Belə ki, görkəmli ədəbiyyatşünas alim Məhəmmədəli Tərbiyət vaxtilə göstərirdi ki, onda Qövsinin 6 min beytdən ibarət fars və türk dillərində iki "Divan"ı var.

İran alimi Əhməd Münzəvinin nəşr etdiyi kataloqdan isə öyrənirik ki, Qövsinin "Divan"ı həmçinin Pakistanın Lahur şəhərində yerləşən Pəncab Universiteti kitabxanasında (1882-ci ildə köçürülmüşdür) saxlanılır.

---

[14] Дж.Каграманов. Научно-критический текст и лексика произведений Имададдина Насими. Автореф. дисс… д.филол.н. Баку, 1969, с.16.

[15] Е.Э.Бертельс. От редактора.—Низами Гянджеви. Икбал–наме. (составитель научно-критического текста Ф.Бабаев). Баку, 1947, с.XVII.

Bu məlumatlara əlavə olaraq onu da bildirmək istərdik ki, Almaniyada yaşayan həmvətənimiz Məhəmmədəli Hüseyninin köməyi ilə son vaxtlarda Qövsi "Divan"ının daha iki nüsxəsinin surətlərini əldə etmişik.

Bunlardan birincisi Tehranın Məlik kitabxanasında saxlanan, hicri tarixi ilə 1083-cü ildə (m.1672-1673) Əskər adlı katib tərəfindən nəstəliq xətti ilə köçürülmüş nüsxədir. 156 əlyazma vərəqinə köçürülən "Divan" 3910 beytdən ibarətdir; buraya 368 qəzəl, 2 tərkibbənd, 2 tərcibənd, 1 müsəddəs, 1 müxəmməs, 1 mürəbbe daxildir.

Təbrizin Təməddün kitabxanasında saxlanan ikinci nüsxə üzərindəki möhürdən göründüyü kimi, bu əlyazma vaxtilə Azərbaycanın görkəmli mədəniyyət xadimi Hacı Hüseyn Naxçıvaninin kolleksiyasına daxil olmuşdur. Hicri 1086-cı ildə (m.1675-1676) nəstəliq xətti ilə Əskər ibn Hacı Əli Təbrizi tərəfindən köçürülmüş 127 vərəqlik nüsxədəki şeirlər 4700 beytdən ibarət olub, 547 qəzəl, 2 tərkibbənd, 3 tərcibənd, 1 müsəddəs, 5 müxəmməs, 1 mürəbbe və 1 rübaini əhatə edir. Xətlərin oxşarlığı, köçürülmə vaxtlarının yaxınlığı və nəyahət, katibin adı belə bir fikri irəli sürməyə əsas verir ki, Tehran və Təbriz nüsxələri eyni şəxs tərəfindən köçürülmüş, sadəcə olaraq, Tehran nüsxəsinin sonunda katibin adı tam getməmişdir.

Qövsi "Divanı"ını çapa hazırlayarkən əsərin tərtib etdiyimiz elmi-tənqidi mətni ilə bərabər, sonralar əldə etdiyimiz bu iki nüsxədən də istifadə edilmişdir. Akademik Həmid Araslının 1958-ci ildə çap etdirdiyi Qövsinin seçilmiş əsərlərində beş misra oxunmayaraq yeri boş qoyulmuşdu. Əldə edilən yeni nüsxələrin köməyi ilə həmin misraları oxumaq mümkün olmuşdur. Bunların içərisində Qövsinin yaşadığı dövr haqqında qənaətlərimizi bir daha təsdiqləyən "ki, biz onun qulu, ol bəndeyi-Sultan Süleymandır" misrası daha böyük maraq doğurur. Dövrünün görkəmli ziyalısı, Azərbaycan və fars dillərində şeirlər yazmış, Səfəvilər sarayında yüksək mövqeyə malik Uğurlu xan Ziyad oğlu Müsahibə (şahın

nədimi-həmsöhbəti olduğu üçün ona “Müsahib” ləqəbi verilmişdi) həsr edilmiş bu tərcibənddə o zaman hakim olmuş I Şah Süleymanın (hakimiyyəti illəri: 1666-1994) adının çəkilməsi Qövsinin yaşadığı dövrün dəqiqləşdirilməsi üçün bizə kömək edəcək daha bir dəlil kimi qiymətləndirilməlidir.

Beləliklə, Əlican Qövsi Təbrizinin “Divan”ı ilk dəfə olaraq mümkün qədər tam şəkildə (543 qəzəl, 2 tərkibbənd, 3 tərcibənd, 1 müsəddəs-tərcibənd, 5 müxəmməs, 1 mürəbbe, 1 rübai) oxuculara təqdim edilir. Ümid edirik ki, Qövsi əsərlərinin gələcəkdə əldə ediləcək yeni nüsxələri şairin həyat və yaradıcılığı barədə daha geniş təsəvvür əldə etməyimizə kömək edəcəkdir.

**PAŞA KƏRİMOV,**
*filologiya elmləri namizədi*

## QƏZƏLLƏR

Ey etmiş məddi-bismillahdən tuğrayi-din peyda,
Anın bir nöqtəsi zimnində Qur`ani-mübin peyda.

Bir-iki hərflə olmuş sənin əmrin nizamindən,
Fələk dair, cəhan bahir, zəman zahir, zəmin peyda.

Bieynih-gün çıxıb, aləm görür tək pərtövi-zatın,
Olur hər zərrənin eynül-yəqinindən yəqin peyda.

Bahari-feyzin əhya bəzl qılmaqçün Məsihatək,
Nəsimi-sübhdən qılmış dəmi-ruhüləmin peyda.

Sənin dəryayi-sün`in xəlq edər bir qətrədən insan,
Sədəfdən əbri-ehsanın qılır dürri-səmin peyda.

Tənü can bir-birilə ülfətü aram tutmazdı
Kim, etdin adəmin qəlbində eşqi-dilnişin peyda.

Könüllər kişvərin təsxiri-eşq, tacbəxş etdin,

Süleymani-xirəddən olmadın namu nigin peyda.

Qılıb məhşər günün zahir bieynih xəlqə dünyadə,
Edibsən xublərdən yüz qiyamətafərin peyda.

Füruğin hüsni-paki-bimisalın gər nəhan dutsa,
Kim eylər qarə topraqdən üzarı-atəşin peyda.

Gözəllər lövhi-rüxsarində kilki-surətarayın,
Qılır gəh xali-mişkin, gahi xətti ənbərin peyda.
Nihali-vadiyi-eyməndə söz icad edən yerdə,
Nolur Qövsi də qılsın nitqi-mə`ni afərin peyda.

* * *

Ey olub Qur`ani-e`cazafərin bürhan sana,
Məddi-bismillah mizani-ülüvvişan sana.

Zatına ol qürblə hacət degil merac kim,
Ömrlər möhtac idi pabus üçün keyvan sana.

Bəs degil ol şövkətü şan ilə cövlan etməgə,
Tövsəni-gərdun səməndü laməkan meydan sana.

Zati-bişübhəmisalın bəs ki, aliqədrdir,
Gündə min yol tazələr ərşü bərin iman sana.

Bəs ki, ehsan etməgə möhtacdır lütfün sənin,
Dəmbədəm ehsan uman səndən qılır ehsan sana.

Müxtəsər kaşanədir firdövs, nisbət cuduna,
Bir mühəqqər sərzəmindir rovzeyi-Rizvan sana.

Kəsmə məndən guşeyi-çeşmim tərəhhüm, ya nəbi,
Ey mənü yüz min mənü Qövsi kimi qurban sana.

* * *

Ey ruhi-pak, aləmü adəm fəda sana,
Ey Kə`beyi-ümmid, iki aləm fəda sana.

Me`raca vari yetdilər, ol dəm ki, etdilər
Ərvahin ənbiyayi-müqəddəm, fəda sana.

Yarəb, ola ki, mərqədi-pakində eyləyə,
Gövhərlərini dideyi-pürnəm fəda sana.

Hərçənd can qapında mətai-həqirdir,
Neylim gər etməyim onu hər dəm fəda sana.

Me`rac əzmin eylədin ol qürbi-zat ilə
Kim, bir dəm ola İsavü Məryəm fəda sana.

Ərz etmişəm muradi-dilim cani-şininə,
Ol kim özini etdi dəmadəm fəda sana.

Bir yol məni sifariş ana eylə, ya nəbi,
Ey nəqdi-ruh, həm anəvü həm fəda sana.

Yoxdur əgərçi rütbəsi Qövsinin, istərəm
Kim, ola cümlə xəlqdən əqdəm fəda sana.

* * *

Ey səbz, nəxli-nəsri-minəllah liva sana,
Sən padşahsən, yaraşır kibriya sana.

Səndən kəmali-mərtəbeyi-övliya təmam,
Qaim nizami-silsileyi-ənbiya sana.

Hərgiz bu şanü rüf`ətə bulmazdı ixtisas,
Gər etməsəydi ərşi-əzim iltica sana.

Zünnardır ridası və bütxanə qibləsi,
Hər şiniva ki, eyləməyə iqtida sana.

Qapunda bir hesabdadır hər böyük-kiçik,
Möhtac bir məqamdə şahü gəda sana.

Toprağdən götür məni-biqədri, ya Əli,
Ey münnəsir, mürüvvətü lütfü əta sana.

Qövsi əgərçi bəndeyi-təqsirpişədir,
Əmma ümidvardır, ey padişa, sana.

* * *

Xoş ol zəman ki, gözün eylər iltifat mana,
Alır həyatımı əldən, verür həyat mana.

Mən ixtiyar səri-kuyin etdim ol gün kim,
Behiştə Adəm ilə yazdılar bərat mana.

Gədayi-meykədəyəm, müflisəm, xümarım var,
Yerindədir ki, verə gözlərin zəkat mana.

Ləbin nəzarəsi can tazələr, bu yüzdəndir
Ki, çeşmim oldu mənim çeşmeyi-həyat mana.

Boyun bəlasın alım, saqiyi-xocəstəliqa,
Şərabi-hövsələsuz etdin iltifat mana.

Arayə aldı məni şami-hicr, şəm kimi,
Məgər ki, duci-qiyamət verə nicat mana.

Mənimlə dust gər eylərsə yarlıq, Qövsi,
Nə qəm ki, düşmən ola külli-kainat mana.

* * *

Təəmmül eylə, saqi, yetir xümar mana,
Boyun bəlasın alım, bəsdir intizar mana.

Sənin əlinlə sitəm daşı andən artıqdır
Ki, göhər eyləyələr özgələr nisar mana.

Bu vəchdən ki, sənin hüsnünə bir az oxşar,
Nə cilvələr ki, bu il eyləməz bahar mana.

Dügünlərin yetər, ey səbzrəng, təh gülün,
Nə gül, nə səbzə gərəkdir, nə laləzar mana.

Gərək qiyamətədin yağə, bəs ki, təşnələbəm,
Əgər mürüvvət edər əbri-novbahar mana.

Külli-məhəbbəta düşmən yegan olur Qövsi,
Demə ki, bir-iki gün oldu çərx yar mana.

* * *

Gərçi artıq yaraşır ol cameyi-gülgun sana,
Hər nə geysən, qaməti-mövzun edər mövzun sana.

Hər görən bu dadlı-duzlu ləblərin biixtiyar,
Söylər ey saqi, halal olsun meyi-gülgun sana.

İmtahan üçün əliflərdir çəməndə sərvlər,
Xameyi-qüdrət çəkəndə qaməti-mövzun sana.

Yumşadır daşı bu rəngilə dönüb yalvarmağım,
Eyləməz əfsanəcə tə`sir ol əfsun sana.

Özgə ahulər məni ram eyləmək qəsdindədir,
Axır, ey Leyli, gərəkməzmi məgər Məcnun sana.

Bir gecə ol şəmlə çeşmim sərayın rövşən et,
Olsun ay ilə günin ərzani, ey gərdun, sana.

Ta ki, mənzurun olubdur, Qövsi, ol qamət sənin,
Yeg gəlür bip sərvdən bir misreyi-mövzun sana.

* * *

Tövqi-qəbqəb sağəri-ləbrizi səhbadır mana,
Saqiya, bu zərfilə bir qətrə dəryadır mana.

Şuri-baladəstü səbri-pəstü çeşmi-nimməst,
Şükr-lillah, hər nə istərdim mühəyyadır mana.

Sağərü saqiyü səhba minnətindən fariqəm,
Mən ki, hər bir daneyi-əngur minadır mana.

Olmayınca bir səda, səs verməyəm dağlar kimi,
Özgələr əfğanı, ey ney, naləfərmadır mana.

Səntək, ey Məcnun, bu ahulər məni ram eyləməz,
Həq bilir kim, Kə`beyi-məqsud Leyladır mana.

Qədrdanəm, kimsə bilməz lütf qədrin mən kimi,
Ol ki, qandır özgəyə, sərcuşi-səhbadır mana.

Gərçi mən ərz etmənəm, bilməzmi, Qövsi, yar özi
Kim, təmənna rüsxəti-ərzi-təmənnadır mana.

* * *

Zəxmi-xunəfşanım, ey bülbül, güli-tərdir mana,
Könlümün hər üqdəsi bir üqdi-gövhərdir mana.

Ey nəsimi-dilguşeyi-nalə, imdad eylə kim,
Qönçeyi-təsvirtək və`zim müqərrərdir mana.

Arizulər guşteyi-gülgünkəfəndir, dadxah,
Təngnayi-sinə bir səhrayi-məhşərdir mana.

Qülzümi-xunxari-çərxin ləngəri-təslimiyəm,
Öz-özünə zülm edir, hər kim sitəmkərdir mana.

Əndəlibin xatiriçün istərəm gül, yoxsa kim,
Novbahar ilən xəzan fəsli bərabərdir mana.

Abi-ruyim muri-biqədrin gögərdən sözlərin,
Hər sınıq ayinə bir səddi-Skəndərdir mana.

Guşeyi-üzlət behişti-cavidanımdır mənim,
Xaki-səhrayi qənaət abi-kövsərdir mana.

Gərçi mən surətdə dərvişəm, vəli dana bilür,
Padşahəm, kişvəri-mə`ni müsəxxərdir mana.

Ah kim, Qövsitək, ey şəm`i-bəla, bir gündəyəm
Kim, nəfəs hər şami-hicran badi-sərsərdir mana.

* * *

Kimi can etdi, kimi könlünü dildarə fəda,
Bilmənəm mən ki, yoxumdur, nə edim yarə fəda.

Abi-yaqut degil əşki-rəvanım, mən onu,
Nə yüz ilən edəyim lə`li-göhərbarə fəda.

Bu səbəbdən ki, sənin çeşminə bir nisbəti var,
Eylərəm nəqdi-həyatım dili-bimarə fəda.

Hər gülün başinə dönmək nə həvəsdir, bülbül,
Aşiq oldur ki, özin eyləyə bir yarə fəda.

Çərxə sal, ey meyi-pürzur bəni cam kimi,
Sinsə binayi-fələk saqiyi-xunxarə fəda.

Eylər azadələrin adını aləmdə bülənd,
Sərv edərsə özün ol şiveyi-rəftarə fəda.

Anın içün sevirəm mən dili sədparəni kim,
Çeşmi-bimarinə hər gün ola bir parə fəda.

Dili-pürxunimi hər gün basaram bağrıma kim,
Ola bir gün ki, ola saqiyi-xunxarə fəda.

Yıxmağa, yapmağa layiq deyil ol viran kim,
Dəmbədəm gənci-göhər etməyə me`marə fəda.

Böylə kim, mən görürəm tabü təbin xurşidin,
Zərrə-zərrə olur ol şö`leyi-rüxsarə fəda,

Söz bilənlər arasında ələm olmaz, Qövsi,
Etməyin xamətək öz başını gövtarə fəda.

* * *

İstərəm peyvəstə, ey rə`na, dolanım başına,
Qoyginən əldən inanım, ta dolanım başına.

İstərəm kim, gah qurban, gəh bəlagərdan olum,
Gah, ey sərvi-səhi-bala, dolanım başına.

Hanı ol bəxtrəsa kim, kakili-mişkin kimi,
Ya öpəm hər dəm ayağın, ya dolanım başına.

Tutginən bir yerdə sən, ey mərkəzi-təmkin, qərar,
Ha dönüm pərgartək, mən ha dolanım başına.

Çün yamandır e`timad etmək bu gündən danlaya,
Ta həyatım vardurur, hala dolanım başına.

Ta ayağdən salmamış sağər kimi səhba məni,
Saqinin yadilə, ey mina, dolanım başına.

Şəm tək gər tarü pudum yandırırsan, razıyam,
Bir zaman pərvanə tək əmma dolanım başına.

Ömrlər dövr etmişəm mən, bilmənəm kim handayam,
Hiç məni gördünmü, ey ənqa, dolanım başına.

Bir-birinin halini sormaq gərək divanələr,
Ver xəbər Qövsidən, ey səhra, dolanım başına.

* * *

Ey qaşların duaçılara qibleyi-dua,
Sən əsli-müddəavü gözün eyni-müddəa.

Mövzün görünməz ol qədü qamət yanında sərv,
Yüz mə`niyi-bülənd, bu bir misrəi-rəsa.

Başım yetişsə ərşə, degil çox iraq kim,
Me`racə yetdi Kə`beyi-kuyində nəqşi-pa.

Ey səngdil, nə nalə ki, yadınla eylərəm,
Gərdunə qarlu dağ kimi çulqaşır səda.

Min çeşmeyi-həyat hanı, ey bəhari-ömr,
Kim, can kimi təbəssümünə eyləyim fəda.

Ol sərvdən əgər xəbərin var, ver mana,
Damanını qiyamətədin qoymanam, səba.

Ey ney, bir özgə dərd ilə fəryadə gəl ki, mən,
Hər nalə ilə dağ kimi verməṅəm səda.

Asan yetişmədim meyi-gülgunə kim, mənim,
Toprağım oldu xuni-cigər birlə kimiya.

Hərçənd ney kimi xəbərim var dərddən,
Yüz yerdə dəlsələr cigərim, verməṅəm səda.

Qövsi, bu ol qəzəl ki, demişdir bir əhli-dil:

“Ey gözlərin qəzali-Xütən tək qəra-qəra”.

* * *

Gər iltifat etməyə badi-səba mana,
Gülşəndə əndəlib yetər aşina mana.

Divani-hüsni-eşqdə yazılsa adımız,
Sahibnəva sana yapışır, binəva mana.

Çün dərdim özgədir, gərək, ey çarə eyləyən,
Darüləmani-vəsldə darüşşəfa mana.

Gülşən müyəssər olmaz isə əndəlib tək,
Yetməzmi nalə, ney kimi bərgi-nəva mana.

Çün istədim dəva, dili-bimar verdilər,
Bildim ki, varə-varə verirlər şəfa mana.

Yoqdur bənim nə istiyə tabım, nə savuğa,
Kim, yüz cəfacə kargər olmuş vəfa mana.

Yadınla yadləndilər əhbabü dustum,
Biganələr məgər olalar aşina mana.

Gər övci-dövlət istər isən məndən istə kim,
Ol sərv saldı sayeyi-bali-hüma mana.

Ta hər nihal başın əyər bərgü bardən,
Qövsi, yetər xəcaləti-qəddi-düta mana.

* * *

Məndən, səba, filanə ki, qurban olum sana,
Ərz eylə yanə-yanə ki, qurban olum sana.

Dön başinə, ayağinə düş, de dönə-dönə,
Ol qaşları kəmanə ki, qurban olum sana.

Hərçənd istərəm ona hali-dilim deyim,
Bu söz gəlir zəbanə ki, qurban olum sana.

Mütrib, bu dərdsiz tənə-turnayı neylərəm,
Şədd et, həmin təranə ki, qurban olum sana.

Yadınla bilmənəm necə bir şəm başinə,
Qövsi deyib dolanə ki, qurban olum sana.

* * *

Ruhi-qüdsisən, nəsən, ey mən dolanım başına,
Ey çirağí-vadiyi-eymən, dolanım başına.

Gər yüz il pərvanə pərvaz etsə, yetməz gərdimə,
Böylə kim, mən getmişəm əldən, dolanım başına.

Keçmə məndən böylə tez, ey navəki-xunxari-dil,
Çünki getdin, bir zaman əylən, dolanım başına.

Bal açub pərvanələr bir-bir ururlar şəm tək,
Atəşi-suzanimə damən, dolanım başına.

Əndəlibi-binəvadən kim dönər gül başına,
Qədrdə əksükmiyəm mən, mən dolanım başına.

Təngnayi-sinə hərgah olsa bari-xatirin,
Çeşmim eyvanində tut məskən, dolanım başına.

Gər desən kimdir alan əldən inanın Qövsinin,
Sən dolanım başına, sənsən dolanım başına.

* * *

Mən ol gün eylədim öz canımı nisar sana
Ki, dərdin aldımü tapşırdım ixtiyar sana.

Əgərçi könlümü açmaz behişti-cavidan,
Vəli ümidlərim vardır, ey bahar sana.

Bu od ki, sinəm evin pakü saf yandırdı,
Əsərmi eyləməz, ey atəşin üzar, sana.

Nola gər öz nəzərimdən düşərsəm əşk kimi
Ki, ardır mana həm, hər nə gəlsə ar sana.

Mana bu rəng ilə, saqi, təğafül etməzdin,
Nəsib olaydı əgər məndəki xümar sana.

Mənim qəmim nə bilürsən, sən ey bilür bilməz

Ki, bir sənin kimi həm verməz intizar sana.

Bu taqət ilə məni vermə ruzigar əlinə,
Gözüm, inanımı çün verdi ruzigar sana.

Nə dərdsən, nə bəlasən, könül, nə afətsən,
Ki, hiç qanım içən olmasın düçar sana.

Çəkinmə, olsa fələk səngbar əgər, Qövsi,
Ki, lütfi-şahi-vilayət yetər həsar sana.

* * *

Ta visalın məni dildən sala, hicran nə rəva,
Ta meyi-nab ola, ey bağrı bütün qan, nə rəva.

Yetiribdir gögə torpağımı çün rəftarın,
Bu kəşakəş dəxi, ey sərvi-xüraman, nə rəva.

Aparıbdır məni çün əldən-ayağdan səhba.
Bu təğafül dəxi, ey saqiyi-dövran, nə rəva.

Məni öldürməginən, çün sana təslim oldum,
Seyd kim bimisl ola, zəxm nümayan, nə rəva.

Bülbülün naleyi-bitabinə səbr eylə, könül,
Hər nəsim ilə daşıb şur edə ümman, nə rəva.

Nə rəvadır sana gülçinlər ilə açılmaq,
Bülbülə çini-çəbin, ey güli-xəndan, nə rəva.

Aşiqin şəkvəsinin əvvəli var, axırı yox,
Namə əncamə əgər yetməyə, ünvan nə rəva.

Məni gülçin kimi bipərdə sanan qönqçeyi-naz,
Söylə hər söz dilinə gəlsə, bu böhtan nə rəva.

Qövsiyi-xəstə ki, pərvaneyi-bitabındır,
Ana dilsərdlığ, ey atəşi-suzan nə rəva.

* * *

Gülzari-ömr qönçeyi-xəndanına fəda,
Nəqdi-həyat lə`li-dürəfşanına fəda.

Min sərvi-naz şiveyi-rəftarına nisar,
Yüz novbahar sərvi-xürmanına fəda.

Bağrım kəbabiyü cigərim parə-parəsi,
Çeşmi-siyahməstinə, müjganına fəda.

Abi-bəqa ki, ömri-əbəddir nəticəsi,
Lə`li-ləb adlı çeşmeyi-heyvanına fəda.

Hər gül ki, şəbnəm ilə yumuş çöhrəsin bahar,
Gülbərgi-arizi-ərəqəfşanına fəda.

Kəm tutma simi-əşki-rəvanım əyarını,
Ey mahi-Misr, çahi-zənəxdanına fəda.

Qövsi bu çöhrəyə necə can sədqə qılmasın,
Yüz böylə bülbül ilə gülüstanına fəda.

* * *

Ey mayeyi-həyat, dilü can fəda sana,
Yüz böylə natəvan sana qurban, fəda sana.

Hər şaxi-gül ki, tikmiş onu bağbani-dəhr,
Ey sərvi-səbzpuş, xüraman, fəda sana.

Səndən bu rənglə necə könlüm diriğ edim,
Qoy olsun artıq ol bir avuc qan fəda sana.

Saqi, bu abü tab ilə olmaz ki, olmaya,
Bəzmi-sipəhr gərdişi-dövran, fəda sana.

Məndən yaşurma, söylə nə məzhəbdəsən mana,
Ey küfrü din, firəngü müsəlman fəda sana.

Ol qönçeyi-təbəssüsmü göstər ki, əndəlib,
Etsin çəmən-çəmən güli-xəndan fəda sana.

Ölsəm bu rəşkdən, məni kəmzərf sanma kim,
Qövsi yəman olur sana qurban, fəda sana.

* * *

Can nədir, kimsə onu etməyə canana fəda,

Ola, ya olmaya bir mur Süleymanə fəda.

Vəchi var, bağrımı cəllad gözün doğrar kim,
Ola hər parəsi bir navəki-müjganə fəda.

Bir təbibin yenə bimariyü dilxəstəsiyəm
Ki, məni dərdə nisar eylərü dərmanə fəda.

Yeri var ab ola şimşad xüramından anın,
Qətrə-qətrə ola ol sərvi-xüramanə fəda.

Belə kim, nami-xuda, çeşmin içər qan, saqi,
Et ana sədqə üçün bir neçə peymanə fəda.

Savurur göglərə rəşk atəşi xakistərimi,
Şəm`ə hərgah qılır canını pərvanə fəda.

Mən ki, bir böylə süxənsaz hərifəm, Qövsi,
Nola, yarəb, olum ol çeşmi-süxəndanə fəda.

* * *

Rövzeyi-rizvan fəzayi-kuyi-dilbərdir mana,
Hər nə kim, zöhhadə namümkün, müyəssərdir mana.

Etsə yə`cuci-həvəs hərçənd viran səbr evin,
Pərdeyi-şərmü həya səddi-Skəndərdir mana.

Yadi-ruyindən ki, xurşidi-qiyamət tabdır,

Daməni-dil, daməni-səhrayi-məhşərdir mana.

Hər nəfəs qurban sana, ölmək vəzifəmdir mənim,
Gündə yüz çin başına dönmək müqərrərdir mana.

Çarə dərdindir, təbibim, dərdi-bidərmanıma,
Atəşi-suzan bieynih abi-kövsərdir mana.

Acı eylər ağzımı səfrayi-hicranın, vəli,
Lə`li-sirabi-ləbin qəndi-mükərrərdir mana.

Bəs ki, şövq etmiş məni atəşinan seylab tək,
Mövceyi-dəryayi-biaram ləngərdir mana.

Gərçi, Qövsi, aləmi-surətdə dərvişəm, vəli,
Padişahəm, kişvəri-mə`ni müsəxxərdir mana.

* * *

Ta nigahim nərgisi-yarilə olmuş aşina,
Kafərəm, gər çeşmi-xunbar ilə olmuş aşina.

Əglənibdir gözlərimdə, rəşkdən mən yanıram
Kim, nəçün göz mərdümi yar ilə olmuş aşina.

Üzv-üzvüm hər biri bir pərdədə eylər məqam.
Ta həbibim naleyi-zar ilə olmuş aşina.

Nuri-çeşmim, aşina derlər səni əğyar ilə,
Türfə kim, can nəqşi-divar ilə olmuş aşina.

Guşeyi-darül`əman yox çərxi-bibünyaddə,
Ey xoşa Mənsur kim, dar ilə olmuş aşina.

Gah olur həsrətdən abu gah həsrətdən qurur,
Kim ki, ol ayinərüxsar ilə olmuş aşina.

Sinədə bir dəm nəfəs zəncir ilə çağ eyləməz,
Ta dili-bitab dildar ilə olmuş aşina.

Ta mən etdim əzm, Qövsi, Kə`bədən meyxanəyə,
Rişteyi-təspih zünnar ilə olmuş aşina.

* * *

Ləbinlə dilləşə bilməz nə gül, nə qönçeyi-həmra,
Qədinlə boylaşa bilməz nə sərvi-naz, nə rə`na.

Nəhibi-eşq ilə sinəmdə könlümü gör kim,
Bu növ qönçələnir pərdeyi-hübabdə dərya.

Bu rəngilə dilü dinim alırsa ol sənəm əldən,
Mənimlə yar olacaqdır firəngü kafərü tərsa.

Gedərəm əldən-ayaqdan şərabi-nab üçün, saqi,
Ki, badə ilə olur nəş`eyi-visal dobala.

Səninlə var sözüm çox, əgərçi hiç sözüm yox
Ki, arizu mənə verməz məcali-ərzi-təmənna.

Həvayi-kakilin ilə nə eyb, başına dönsəm
Ki, çərxi-çərxə gətirmiş mənim başımdakı sevda.

Fəğan ki, sübhümü şam etdi intizar ilə axir,
Gözüm qarəsini ağ eyləyən, gedən güli-rə`na.

Həyat buldu ləbindən fəraq küştəsi, Qövsi,
Məsih mö`cizinə verdi aqibət ləbin əhya.

* * *

Hüsn eşq ilə bərabərdir giriftar olmasa
Kim, göhər xak ilə yeksandır xəridar olmasa.

Eyləmə ikrah məndən kim, təbibi-haziqin,
Qədri naməlumdur bir yerdə bimar olmasa.

Daneyi-xalın qılır zöhhadı fariğ səbhədən,
Rişteyi-zülfün yetər tərsayə, zünnar olmasa.

Ruzi-hicran uymasın məndən məhəbbət kimsə kim,
Qaynamaz qanım mənim kim, çeşmi-xunxar olmasa.

Tarü pudum bir-birindən ayrılır simab tək,
Mayeyi-aramim ol ayinə rüxsar olmasa.

Xirməni-ümmidimə öz şöleyi-ahım yetər,
Sabitü səyyarədən gərdün şərabdar olmasa.

Eşq tərkin etməyən bilməz bu dövlət payəsin,

Məstlik qədrin nə bilsin kim ki, hüşyar olmasa.

Üzdü canım riştəsin qəm, kimsə agah olmadı,
Vay, yüz min vay canan həm xəbərdar olmasa.

Bəs ki, müddətlərdir öyrənmiş kəməndi-zülfilə,
Baş qoyar səhralara Qövsi giriftar olmasa.

* * *

Mənimlə saqiyi-gülçöhrə yar ola, nə ola,
Başımda sayeyi-əbri-bahar ola, nə ola.

Bahar fəsli muradınca bülbülün gəldi,
Mənim də kamım ilə ruzgar ola, nə ola.

Əgərçi könlüm evin yıxdı, yaxdı, yandırdı,
Bu dərd ta cəhan var, var ola, nə ola.

Qərarü səbrim alan nazəninim öz könlüm,
Mənim kimi unudub biqərar ola, nə ola.

Qovurdu bağrımı rəşk atəşi, budur dərdim
Ki, qeyr cur ola, həm yar yar ola, nə ola.

Bu abü rəng ilə gər sən gülə-gülə gələsən,
Gülüb çəmən, açılub gül, bahar ola, nə ola.

Müşəvvəşəm bu cəhətdən ki, nəqdi-canım ana,
Nisar olmaya, yarəb, nisar ola, nə ola.

Həman qavurdu məni aftabi-mey, Qövsi,
Başımda sayeyi-əbri-bahar ola, nə ola.

* * *

Əsərsiz ahimə sən verginən əsər, yarəb,
Bu nəxli qoymaginən böylə bisəmər, yarəb.

Əgərçi zəngi-küdurət basıbdır ayinəmi,
Ana təvəccöh ilə eylə bir nəzər, yarəb.

Bir özgə mə`niyi-pünhanə vaqif olmaq üçün,
Özümdən et məni bihuşü bixəbər, yarəb.

Həmin ki, mənzilə Məcnun yetişdi, mən gəldim,
Təriqi-eşqdə olmazmı həmsəfər, yarəb.

Gözüm çırağı, səni kim ki, görsə suyə dönər,
Nə yüzdən olə qurur əşki-bicigər, yarəb.

Visali-şəm` ilə pərvanələr yanan yerdə,
Dözərmi atəşi-hicranə balu pər, yarəb.

Nəsimi-hərzə fərəs, gərçi dağə-daşə düşər,
Düşərmi mən kimi aləmdə dərbədər, yarəb.

Cahanda hər kimi gördüm, unutdum öz-özümü,
Kimin muradı ilə pəs fələk dönər, yarəb.

Fitadəlik məni xar etdi xəlq arasında,
Nə nəng imiş, nə yəman eyb imiş hünər, yarəb.

Bu rəng əgər əridir tabi-şö`leyi-qəm onu,
Qalırmı Qövsiyi-bitabdən əsər, yarəb.

*   *   *

Mənimlə bundan artıq yarimi yar etginən, yarəb,
Oni məndən, məni ondan xəbərdar etginən, yarəb.

İlahi, kakilindən üzmə yarın rişteyi-canım,
Yüz anca kim, giriftarəm, girifar etginən, yarəb.

Edibdir çərxi-müstəcəl məni toprağ ilən yeksan,
Sən ol seylabi-bizinhari me`mar etginən, yarəb.

Nə surət var, nə mə`ni var, nə göftarım, nə kirdarım,
Yox eylə varımı, yoxdan məni var etginən, yarəb.

Əgər bəxtim oyanmaz xabi-qəflətdən, sözüm yoxdur,
Bu qafil könlümü hüşyarü bidar etginən, yarəb,

Usandım, incidim, bidərdlərdən mərhəm ummaqdan,
Məni öz dərdü dağınçün xəridar etginən, yarəb.

Şərərbar etdi çərxi dudi-ahü nalədən, Qövsi,
Anı çeşmim kimi əbri-göhərbar etginən, yarəb.

*   *   *

Dilər könlüm ki, yar əğyar ilə yar olmasın, yarəb,
Cahan ta var olsun, yarü əğyar olmasın, yarəb.

Mənim tək bülbülün qan oldu bağrı, qönçə fariğdir,
Bu dilbilməzlərə hiç kim giriftar olmasın, yarəb,

Könül min dərdə dərman etmək üçün bir nigah istər,
Sənin bimar çeşmindən ki, bimar olmasın, yarəb.

Nə lazım zahidə təğribü eşqü mən`i-zöhd etmək
Kim, ol surət bu mə`nidən xəbərdar olmasın, yarəb.

Müaliclər usanmış ahu zarından, nə dildir bu,
Ki hiç kafər evində böylə bimar olmasın, yarəb.

Əlində zahidin təsbih, min zünnar işi işlər
Ki, kafərlər nəsibi böylə zünnar olmasın, yarəb.

Giran gəlməz ol əksükcə bəhalər mahi-kən`anə,
Sözümə bibəsirətlər xəridar olmasın, yarəb.

Ayağə baş qoyub, qəflət meyindən pasiban olmuş,
Qiyamətdə dəxi ol fitnə bidar olmasın, yarəb.

Sənə Qövsi kimi çox var məhvü layəzal, əmma,
Anın var isə səndən özgəsi, var olmasın, yarəb.

*   *   *

Dustlər, könlüm diyarın etdi viran iztirab,
Eylədi övraqi-tərkibim pərişan iztirab.

Hər kimi kim, yandırar atəş, yanar andan betər,
Neyləsin, gər etməsin ol bərq cövlan iztirab.

Qətrə, gər dərya üçün bitab olur, məzurdur,
Bilmənəm, neyçün qılır dəryayi-ümman iztirab.

Bən deməm kim, durginən axşamadin, ya sübhədin,
Böylə əmma etmə, ey sərvi-xüraman, iztirab.

Nəqdi-can hər vaxt ola, axır sana təslim olur,
Eyləmə qətlimdə çox, ey namüsəlman, iztirab.

Əşk tək getməkdə sübhi-vəsl biaram olur,
Seyl tək gəlməkdə eylər şami-hicran iztirab.

Hər biri bir rəngilə, Qövsi, fəğan kim, qıldılar,
Könlümü ab intizarü bağrımı qan iztirab.

* * *

Saqiya, sunmuş mana nəzzarədən ol göz şərab,
Yoxsa, salmaz kimsəni bu günlərə yalquz şərab.

İstərəm yanmaq, vəli bir atəşin məhfildə kim,
Bəzm məcmər, mən sipənd, od saqi olsun, köz şərab.

Hiç düşmən cami-gülgun başə tənha çəkməsin,
Qanım içən içməsin, ey dustlər, yalquz şərab.

Gör nə keyfiyyət verir səhba əlindən kim sənin,
Qamətin mina, ləbindir cam, lə`l-söz şərab.

Şadmanəm, gər səninlə qan verir dövran mana.
Bir qəimi dəf eyləməz, gər sənsiz içsəm yüz şərab.

Mən` edər naseh məni meydən, deyən yoxdurmu kim,
Müddəa saqidir, ey bidərd, sözdür, söz şərab.

Dürdkəşdir Qövsiyi-məxmur, sən saf istəsən,
Saqiya, zinhar çeşmim pərdəsindən süz şərab.

* * *

Şişəmi, gər çalsa daşdan-daşə ol rə`na igit,
Eləməz səs kim, məbada çaşə ol rə`na igit.

Nisbət ilən yengi ayın başı göylərdən ötər,
Börkini əgri qoyanda başə ol rə`na igit.

Ey sipənd, ahəstə fəryad et anın bəzmində kim,
Zərfi kuçikdir, məbada daşə ol rə`na igit.

Sərv anın vəsfində bir misra, vəli mövzun degil,
Bəs ki mövzundur ayaqdan başə ol rə`na igit.

Çox yaşasın, gərçi zalimdir, tərəhhüm eyləməz,
Gözdən axan qətrə-qətrə yaşə ol rə`na igit.

Göz yumub açınca dünyanı vururlar bir-birə,
Versə gər rüxsət göz ilə qaşə ol rə`na igit.

Qavuşandan sonra xət, axır mənimlə qavuşur,
Kaş, tez düşseydi, Qövsi, başə ol rə`na igit.

* * *

Mey içüb çıxmış şəlayin evdən ol rə`na igit,
Ta kimə pərva edə bir böylə bipərva igit.

Könlümü ol səngdildən bir zəman qurtarmağa,
Yoxmudur aləmdə bir sərvi-səhibala igit.

Bir əlində sağəri-mey, bir əlində şişəsi,
Aləmin girmək dilər qaninə ol rə`na igit.

Hər biri bir rəng al eylər bəni-yekrəngilə,
Gah bir türki-cəfacu, gah bir mirza igit.

Bir özün bilməz, sözün zəbt eyləməz, divanəyəm,
Ey igitlər, istərəm bir məstü bipərva igit.

Qövsiyi-xəmgəştənin yoxdur bir özgə mətləbi,
Başına istər doyunca dönmək, ey rə`na igit.

* * *

Təngzərfəm, məni saqi, əlindən gəlsə hüşyar et,
Əgər ehmal edərsən bəs, xəbərdar ol, xəbərdar et.

Mənə çün rüxsəti-göftar ol şirinzəban verməz,
Ana sən razimi, ey xamə, bir rəngilə izhar et.

Bu halilən şəbi-hicran, birəhm, almadın canım.
Məni məndən alıb, yarəb, mənimlə yarimi yar et.

Təbibimdən dəva umdum, ayağın çəkdi başimdən,
Ana sən dərdi-bidərmanımı, ey zə`f, izhar et.

Söz ilə nazəninlər eşq bidadın inanmazlar,
Bu dilbilməzləri, yarəb, giriftar et, xəbərdar et.

Mənim fəryadıma ol səngdil verməz qulaq, əmma,
Ana sən halimi, ey ney, qulaq dutduqca təkrar et.

Gər ol xurşiddən çeşmim sərayin rövşən istərsən,
Fələk məhdində bəxtim kövkəbin, ey nalə, bidar et.

Sənin çün ağzını qəndi-mükərrər eyləməz şirin,
Həmin, Qövsi, nihan eldən, anın adını təkrar et.

* * *

Canə yetdim dərdi-dil zəbtindən, ey dildar, eşit,
Əndəlibin sərgüzəştin, ey güli-bixar, eşit.

Yox dilim yalvarmağa, əzbəs xümaraludəyəm,
Əl-ayağın sədqəsi, ey saqiyi-xunxar, eşit.

Bağrımı qan etdi qəm, ey yari-səngindil, inan,
Canımı yandırdı hicr, ey atəşin rüxsar, eşit.

Rəhm qıl eşq əhlinə, kəs bülhəvəsdən rəğbətin,
Gər eşitməzsən onu, bari bunu, ey yar, eşit.

Rəngi-zərdü əşki-alim gör meyi-gülrəng üçün,
Ahi-atəşbarımı, ey əbri-gövhərbar, eşit.

Sağərü səhbayə, zalim, ömrlərdir təşnəyəm,
Bir zaman əglən, sözüm, ey əbri-gövhərbar, eşit.

Öldürərsən çünki sən axır məni bidad ilə,
Bir nəfəs zinharım, ey xunxari-bizinhar, eşit.

Çün bu dərdə öz-özün, Qövsi, salıbsan mən kimi,
Hər təbibin acı-adı pəndin, ey bimar, eşit.

* * *

Gətir, saqi şərabi-nab, mütrib, sazını saz et,
Çəkib bir naləvü bülbülləri dört yandan avaz et.

Mənə bülbül kimi hər gül budağı dilnişin olmaz,
Əgər bir böylə sərvin var isə, ey bağban, naz et.

Dilim tutduqca əfğan eylədim, fəryadına yetdim,
Nəfəsdən düşdüm axır, sən həm, ey ney, fikr dəmsaz et.

Əgər aşiq gözündən öz cəmalın görmək istərsən,
Mənim ayinəmi, ey səngdil, zinhar, pərdaz et.

Gözün, hərçənd, sahirdür, həbibim, dilrübaliğdə,
Dəmi-canbəxş ilə göftarə gəl, ol sehri e`caz et.

İtirmə əl-ayağın, ey nigahi-əcz, tanrıyçün,
Ana əhvalımı ərz eylə, əmma çox sözü az et.

Vəfavü mehrlə, ey sərvqəd, xublar arasında,
Özün mümtaz olub, üşşaq ara Qövsini mümtaz et.

* * *

Hüsnündən özgə neylər, zülfində tab bais,
Yüz piçü tabə bəsdir, ol abü tab bais.

Məclis sovulmayınca, saqi, sən olmayınca,
Könlüm açılmayınca, olmaz şərab bais.

Hicrində canə doydum, vəslində canı qoydum,
Gəh intizari-illət, gəh iztirab bais.

Nazü gerişmə ilə tədbiri-qətlim etmə.
Dəf olmağımda bəsdir rəfi-niqab bais.

Məh kimi varə-varə olmaz kəmal bulmağ,

Ta olmayınca, Qövsi, bir aftab bais.

* * *

Mənə deyən ki, nədir bunca yanmağa bais,
Nədir, ana içübən badə, qanmağa bais.

Fəğanların səməri xəstəyə tərəhhüm ikən,
Fəğan kim, oldu təbibim usanmağa bais.

Səni bu rənglə gülşəndə görməyən nə bilir,
Ki, lalə qanlara nola boyanmağa bais.

Deyən ki, vəsl günü gün nə müztərib dolanır,
Gərəkmi başinə yarın dolanmağa bais.

Gerü alurmiyəm ol nəqdi lə`li-nabından,
Nola könül aparıb sonra danmağa bais.

Axır ki, Qövsi, səni bir daş ilə sormazlar,
Şəh öz gədayi-səri-kuyin anmağa bais.

* * *

Əldən gedirəm sərvi-xüramanını görgəc,
Dildən düşürəm qönçeyi-xəndanını görgəc.

Hərçənd mənə tab verir muy miyanın,
Bitab oluram zülfi-pərişanını görgəc.

Ey can alıcı gözləri, şəhbaz baxışlı,
Şahin yaşınır pənceyi-müjganını görgəc.

Hərçənd səməndər kimi rizqim mənim oddur,
Bağrım ərinür atəşi-hicranını görgəc.

Xurşid kim, oldur fələkin çeşmü çırağı,
Pərvanələnür şəm`i-şəbistanını görgəc.

Dil zövrəqi netsin ki, əgər Nuh özü olsa,
Girdabə düşər cahi-zənəxdanını görgəc.

Bülbül necə yanında həyatdan ağız açsın,
Gül qönçələnür lə`li-dürəfşanını görgəc.

Sinəmdə könül qönçeyi-sirabdır, əmma,
Şəbnəm tək ərir qətreyi-peykanını görgəc.

Rəhm eyləyib əhvalına kuyindəki itlər,
Fəryadə gəlir Qövsiyi-nalanını görgəc.

* * *

İç şərabi-nab özün, saqi, mənə məstanə bax,
Gah çeşmi-şəfqət ilə, gah birəhmanə bax.

Hər rəviş var, eyləmə qət`i-nəzər üşşaqdən,
Baxmasan şəfqət gözilə, bari birəhmanə bax.

Ey dəmadəm yandığım keyfiyyətin məndən soran,
Taqətin var isə, ol bərqi-səbükcövlanə bax.

Aşiqəm mən, taətə nisbət verir zahid məni,
Gör yalanın ol sözini bilməzin, böhtanə bax.

Rövşən istərsən könül ayinəsin, dildarı gör,
Görmək istərsən əgər can cövhərin, canana bax,

Eşq dərdindən bəqayi-cavidan istər könül,
Böylə daşqun seyldən təmir umar, viranə bax.

Qəmzə, yarəb, ögrədir, ya rəhm ol xunxarə kim,
Öylə zalim gözlər ilə böylə məzlumanə bax.

Ey deyən kim, badeyi-gülgun içib qan ağlama,
Bir əlimdə sağəri-mey, bir əlimdə qanə bax.

Eşq rövşənrə`ydir hüsni-rəsa məşşatəsi,
Ya ələ ayinə al, ya Qövsiyi-heyranə bax.

* * *

Gərçi gün kimi olur paknəzərlər küstax,
Qarşu durmaz sənə ayinə kimi hər küstax.

Düşsə göz yaşı kimi mey nəzərimdən, nə ola,
Görə bilməm ki, ləbinlə ola sağər küstax.

Nola cəm`iyyəti tiğ ilə əgər dağıdasan,
Çöhrə olmuş yüzinə xətti-müənbər küstax.

Ağladırlar məni mina kimi güldürmək ara,
Girməsin xublərin bəzminə kafər küstax.

Məni qan tərlədir ol ləl nə yüzdən, ya rəb,
Ki, təbəssümlə açıb qönçəni eylər küstax.

Verdi gülbərg tək ahim yelinə rəşk məni
Ki, səba çulqaşub ol zülf ilə oynar küstax.

Ey xoş ol məst ki, bilməzkən özünü, sözünü,
Yalvarıb saqiyə camü məza istər küstax.

Necə saqinin ayağını öpüm, ya əlini
Ki, həyadən öpə bilməm ləbi-sağər küstax.

Məni məst etdi Füzuli kimi bu söz, Qövsi
Ki, olub məst, dutum saməni-dilbər küstax.

* * *

Qəmzeyi-xunxarına cür`əti-nəzzarə yox,
Neyləyim, ah etməyim, dərd çoxu çarə yox.

Tiği-qəzadır, nədir, kirpiyin, ey şux, kim,
Sineyi-sədfakdən qan axıru yarə yox.

Mən kimi sərgəştədir çərx, vəli çərxdə

Daği-dilü əşk tək sabitü səyyarə yox.

Mərdümi-çeşmim əgər gahdə bir gün görər,
Kövkəbi-bəxtim kimi ayi-güni qarə yox.

Yox, demənəm, gər desəm var bəlakeşlərim,
Sən kimi, Qövsi, ğəli aşiqi-biçarə yox.

* * *

Var ümidim ki, genə eyləyə çeşmin məni yad,
Seyd hərçənd zəif olsa unutmaz səyyad.

Əsl özünsən, məni hərçənd gözün öldürdü,
Nə ki, sultan buyurursa, anı eylər cəllad.

Şeşdəri-eşqdən, ey dustlər, əndişə qılın,
Ki, hərifin gözünü bağlar imiş bu nərrad.

Heç kim aşiqi-dilxəstəyə iqbal etməz,
Ah, əgər eyləməsə dərdi-qəmin könlümü şad.

Unudur qətlimi sanmın ki, edər rəhm mənə,
Bəs ki, heyran qalır əhvalıma hər dəm cəllad.

Qoyma Qövsi kimi gərdunə mənim işlərimi,
Ya Əli, yoxsa bu bidadgər eylər bidad.

* * *

Gəlir bahar, açılıb gül həzar edər fəryad,
Bu əndəlibi-xəzanü bahar edər fəryad.

Fəğan ki, halimə ol daş bağırlı rəhm etməz,
Əgərçi naləm ilə kuhsar edər fəryad.

Özü-özün salır oddan-oda sipənd kimi,
Zəbani-halilə hər kim şüar edər fəryad.

Bu hərcü mərcdə hiç bilmənəm nə qovğadır,
Ki, məst nalə qılır, huşyar edər fəryad.

Bieynih öylə ki, oddan sipənd nalə çəkər,
Səni görən kimi biixtiyar edər fəryad.

Nə növ kim, dağıdır tünd bad xarü xəsi,
Binayi-hövsələmi tarümar edər fəryad.

Cərəs kimi yığaram gərçi nalədən dilimi,
Yüz ol qədər bu dili biqərar edər fəryad.

Kimin muradı ilə bəs fələk dönər, yarəb,
Ki, gərdişidən anın kim ki var edər fəryad.

Sipəhri-çərxə düşər girdbadtək Qövsi,
Nə sərzəmində ki, bir biqərar edər fəryad.

* * *

Könüldə qönçələnibdir cəhan-cəhan fəryad,
Dilim bu vəchdən eylər zəman-zəman fəryad.

Çəməndən ötdümü ol şaxi-gül təğafül ilə
Ki, əndəlib bu gün başlamış yəman fəryad.

Boyun bəlasın alım, böylə sərgiran keçmə,
Əgər gəlir sənə üşşaqdən giran fəryad.

Yarar fələk cigərin Bisütuni tişə kimi,
Edəndə aşiqi-məzlumi-natəvan fəryad.

Cəhan-cəhan ələmindən cəhan-cəhan əfğan,
Zəman-zəman sitəmindən zəman-zəman fəryad.

Yetincə bülbülə növbət bahari-ömr keçər,
Əgər mən eyləsəm, ey şaxi-ərğəvan, fəryad.

Nə yerdə kim, mən olam, hacəti-dəlil degil
Ki, əndəlib yuvasın verir nişan fəryad.

Səda əgərçi dolu camdən bülənd olmaz,
Vüsal edər məni ləbrizi-əl`əman fəryad.

Bu ahü nalə məgər bisəbəbmidir, yarəb
Ki, bəzmi-vəsldə həm eylərəm haman fəryad.

Bahar fəsli onu sövti-rə`d sanmagilən
Ki, naləm ilə mənim eylər asiman fəryad.

Kimin muradı ilə bəs fələk dönər, yarəb
Ki, gərdişindən edər yaxşıvü yəman fəryad.

Yetincə saqiyi-xunxardən bir ovuc su,
Kəbab olub cigərim, bağrım oldu qan fəryad.

Usandı mehrsiz əflak əl`amanımdan,
Hənuz eşitmədi ol yari-mehriban fəryad.

Qəmi-zəmanə ilə bəski çəkdi can Qövsi,
Yıxıldı səbr evi, ya sahibəzzəman, fəryad.

* * *

Mənə cahanı qara eyləmiş sipəhri-kəbud,
Görün, görün ki, nə od yandırır bu odsuz dud.

Könül binasını, yarəb, sinəhr yıxmışmı
Ki, ah sinəm evindən gəlir qübaralud.

Ana nə rəng ilə əhvalım eyləyim rövşən
Ki, yandırır məni bir od, nə şölə var, nə dud.

Yetəndə kiyinə cananımın, səba, məndən
Yetir xüzu xüş ilə çox səlamü sücud.

Könül sorağını kuyində almışam vəh kim,
Yəman uzağa düşübdür bu Kə`beyi-məqsud.

Nə eybin olsa, onu eşq edər hünər, zahid,

Vəli bu qapıda mərd olmayan olur mərdud.

Əsərdə eşq sözü əqlə oxşamaz, Qövsi,
Bir odlu naleyi-ney, yüz təraneyi-Davud.

* * *

Əvvəl ləbin şərab verir, sonra qan tutar,
Bu düz, əgərçi gec tutar, əmma yəman tutar.

Daği-cünun yapışmadı könlünə zahidin,
Bu möhrü gər qara daşa bassan, nişan tutar.

Hər söz ki, arizindən onun eyləsən rəqəm,
Xurşid misrəi kimi, axır cəhan tutar.

Ol kuyə, ya behiştə könül bağlamaq gərək,
Bir quş iki çəməndə xaçan aşıyan tutar.

Yegdir ki, şişəyə tuta qanını bülbülün,
Hər qönçənin gülabını ta bağban tutar.

Təsxiri-zülfi-yari səbadan dilər könül,
Oxşar ona ki, özgə əlilə ilan tutar.

Təbriz cəzbəsi yaxamı tutmuş aparır,
Qövsi, əgərçi damənimi İsfahan tutar.

* * *

Qubari-cism biaram düşsə, candan artıqdır,
Bu dəryadə sədəf var kim, düri-qəltandan artıqdır.

Bu qamət kim, ana kütahbinlər sərv söylərlər,
Sözün doğrusu, məddi-ömri-cavidandan artıqdır.

Nə lazım vəsfi-xəttü xal ol qamət duran yerdə,
Bu misra aləmi-mənidə bir divandan artıqdır.

Ləbi-meygun yerini bağban gül yarpağı tutmaz,
Xümaraludəyə hər qönçə bar peykandan artıqdır.

Betərdir intizari-vəsli-biəncam hicrandan,
Sərabın təşnəyə hər mövcəsi tufandan artıqdır.

Bəladır yarı görmək bəzmdə əğyar yanında,
Mənə bu vəchdən vəsli anın hicrandan artıqdır.

Gülabi-qönçənin təlx olmağı ol vəchdəndir kim,
Mürüvvətdən göz örtüb qönçə üzmək qandan artıqdır.

Bu gecə, kim mənim mehmanım ol xurşiddir, Qövsi,
Füruği-kövkəbi-bəxtim məhi-tabandan artıqdır.

* * *

Nə sərkəş şölədir bu, vəh, bu nə qəddü, nə qamətdir,
Qiyamətlər qiyamindən qiyam etmiş qiyamətdir.

Nə kakildir ki, ənbərbiz olub badi-səba ondan,
Cəhan həm ol səba feyzilə rəşki-bağı-cənnətdir.

Fələkdə öylə pozmuş mehrü mahin rövnəqin hüsnün
Ki, yulduzlar bu üzdən hər biri bir çeşmi-heyrətdir.

Gözü qaşın əgər islamü küfri etməmiş yeksan,
Bu nə meyxanədir, bəs ol nə mehrabi-imamətdir.

Nə rəngamizdir, yarəb, bahari-xətti-səbzin kim,
Gülüstanlar onun dövründə rəngamizi-xiclətdir.

Kəlami-möcüzəncamü ləbi-şirin kəlamından
Doludur şurilə dünyavü ləbrizi-həlavətdir.

Bilibdir ta cəmalın mənisin, ey səbzeyi-gülgun,
Nə surət ki, müsəvvir nəqş edər, məşqi-xəcalətdir.

Çəməndən tərlü rüxsar ilə, yarəb, sənmi ötdün kim,
Gülü şəbnəm, biyenih, çeşmi-heyrət, əşki-həsrətdir.

Gəlir sağü solunda hurivəşlər ol mələk, Qövsi,
Nə ölmüşsən, dur, ey bidərd, gör kim, nə qiyamətdir.

* * *

Düşən kuyindən ayru naleyi-ərşaşina neylər,
Nəzərdə olmayınca gülsitan, bülbül nəva neylər.

Yetişdi mehrü mahə göydə əfğanım, sənə yetməz,

Kimə kim, narəsadır bəxt, fəryadi-rəsa neylər.

Dilü dini kim, almaz gözlərin bir işvəyə, neylim,
Mənim kimi tünükmayə mətai-narəva neylər.

Sənə yalvarduğum vəchi budur kim, əczə mailsən,
Və gər nə bir könül kim, müddəasızdır, dua neylər.

Xəridar olmasa, gövhər qara daş ilə yeksandır,
Əgər ərbabi-hacət olmaya, hacət rəva neylər.

İlan zəhrini xəttü xal heç vəchilə kəm qılmaz,
Könül, ta olmaya dərviş, nəqşi-buriya neylər.

Yeri vardır mənə gər madəri-əyyam süt verməz,
Oğul kim, kuri mübrəm düşmiyə, Qövsi gəda neylər.

* * *

Bu sərzəminə xansı çəməndən səba yetər
Kim, nikhəti-dimağimə çox aşina yetər.

Ol qönçələb məgər bu gülüstandan ötdü kim,
Bu pərdədən qulağıma yüz min səda yetər.

Xas etmə hər şikarə bir ayru kəməndü dam,
İki cəhanə ol iki zülfi-rəsa yetər.

Xət hüsnə pərdə tutmaq üçün göz qaraltmasaq,
Gər zülf əlini çəksə, nigəhban səba yetər.

Öldürdün isə Qövsini əndişə çəkmə kim,
Yüz qanə bir qıya-qıya baxmaq bəha yetər.

* * *

Könlüm almaq qəsdinə çün şux tənnazım keçər,
Bəs ki, naz eylər mənə, aləmlərə nazım keçər.

Bəs ki, qan ağlar gözüm, aləmlərə qan ağladır,
Tari-müjganinə xəlqin gövhəri-razım keçər.

Gərçi suyin qətrəsini gövhər eylər novbahar,
Bağrımı bir qətrə su eylər, mənim yazım keçər.

Göz yumub açmağa fürsət yoxdur, ey könlüm quşu,
Bir göz açsan həm özün göstər ki, şəhbazım keçər.

Ahi-həsrət yandırır vari xəsü xaşakimi,
Çün təğafül birlə bərqi-xanəpərdazım keçər.

Öz muradımca bu səhralərdə bir seyd etmədim,
Mən ki, göylərdən xədəngi-övcpərvazım keçər.

Ram olur Qövsi əgər ahuyi-rəna boyninə,
Həlqeyi-çini-kəməndi-tari-avazım keçər.

* * *

Hərçənd gül lətif ola, rüxsarın özgədir,
Nərgis nə olsa, çeşmi-füsunkarın özgədir.

Mən qönçəyə yəman deməném, nüktə tutmanam,
Söz bundadır ki, ləli-göhərbarın özgədir.

Yox vaizin sözinə sözüm kim, behişt var,
Kuyin bir özgə cənnətü didarın özgədir.

Tubada var rüunətü əndam sərvdə,
Əmma xürami-nəxli-bəlabarın özgədir.

Qövsi, əgərçi var cəfapişə dustlər,
Əmma sənin hərifi-sitəmkarın özgədir.

* * *

Aləmi məhv qılan ağzıvü şirin sözüdür,
Qeyrə uyma ki, əgər var, əgər yox özüdür.

Cigərim qan eləyən ləl ki, ləb söylərlər,
Gərçi mən dadmamışam, neməti-hüsnün duzudur.

Çıxıban minbərə Quran oxuyub vəz verən,
Xoş uzatdın, məgər ol zülfilə kakil sözüdür.

Aparan qəmzəvü kakil, əl-ayaq bağlıyanım,
Aldadan, xət buyuran qaşları qanlu gözüdür.

Bilmənəm qanlu dügünlərmi küyür sinəmdə,

Ya sənin bərqi-inanın ayağının izidir.

Zahidin çöhrəsi nurani deyib aldanma,
Qaradır içi, əgər lalə kimi qırmızıdır.

Səri kuyində bulan qurbi-məqam ol gözəlin,
İtinə çıx, demə kim, Qövsinin iki gözüdür.

* * *

Kim ki, bu aləmdə ömrün sərf edib yar axtarır,
Gənci-gövhər dağıdıb viranədə mar axtarır.

Bəs ki, verməz yuxu göz açmağa firsət kimsəyə,
Sübh gün şəm`ilə hər gün çeşmi-bidar axtarır.

Çıxmadı Məcnun gedəndən sonra bir şeyda səsi,
Ömrlərdir kim, təbibi-eşq bimar axtarır.

Bəs ki, xətt ol kövkəbi-hüsnün günün etmiş qara,
Zülfi-rüxsari-çırağilə, giriftar axtarır.

Pərdeyi-dam eyləmiş zahid ridasın xəlq üçün,
Qapılarda səbhə fali birlə zünpar axtarır.

Çox daxi könlüm mənim meyxanəyə mail deyil,
Kim gəzib ev-ev xərabat içrə huşyar axtarır.

Damənindən əl, ayaqdan düşmağ ilə çəkmənəm,

Könlüm ol ayinəruyi ta nəfəs var, axtarır.

Başı əzbəs kim, bizim çöllərdə dəymiş daşlara,
Seyl fəryad eyləyib damani-kuhsar axtarır.

Özgə rövnəq var, Qövsi, hüsn bazarında kim,
Bir məta onda iki aləm xəridar axtarır.

* * *

Ey çeşmi-əşkbar, cigər böyləmi olur,
Yox səndə tab, nimnəzər böyləmi olur.

Ey bad, söylə könlümə, yetdinsə kuyinə,
Key hərzəkərd, seyrü səfər böyləmi olur.

Dünyanı piçü tabə salıbdır hənuz üzü,
Yoxdur aradə hiç kəmər böyləmi olur.

Toprağ ilə gözüm yaşı yeksan gəlir sənə,
Sizlərdə qədri-əhli nəzər böyləmi olur.

Lütfü ətavü rəhmü mürüvvət, vəfavü mehr,
Bidərd xublərdə məgər böyləmi olur.

Qövsi, məlalım artırıb incitdi yar məni,
Üşşaq naləsində əsər böyləmi olur.

* * *

Dövründə arizin xəti-müşkin qəribdir,
Neyçün ki, atəş üzrə rəyahin qəribdir.

Gəlmiş yuxarıdan aşağı, saxla izzətin,
Salma, ayağə, kakili-pürçin qəribdir.

Yol hiç bulmanam diş ilə ağzı sirrinə,
Məhv olmuşam ki, "mim" ara "sin" qəribdir,

Qan yaşimə yığıldı uşaqlar bu türfə kim,
Aşiq sirişki olmasa rəngin qəribdir.

Ol zülf kuçəsində, səba, söylə kakilə
Tutsun əlin ki, Qövsiyi-miskin qəribdir.

* * *

Dərdi-sər çəkməz əgər zahid riyalərdən keçər,
Müddəasın bulmuş ol kim, müddəalərdən keçər.

Olsa gər salik bu yoda qorxulu, məzurdur,
Neyləsin ol kim, iki aləm bəlalərdən keçər.

Məstdirmi gözlərin kim, rəhm edib qanım tökər,
Yolmu azmış navəkin kim, binəvalərdən keçər.

Gər səgi-kuyin keçib məndən fəğan eylər, nola,
Aşinayə güc gəlir, kim aşinalərdən keçər.

Eyləməz, Qövsi, əsər bu  daş bağırlı bütlərə,
Tiri-ahından nə hasil kim, səmalərdən keçər.

* * *

Təğafül eyləmə, saqi ki, novbahar keçər,
Yetincə bir də mənə dövr, ruzigar keçər.

Qəfəs əsiri olan bülbülün gözündən iraq
Ki, bağbani vida eyləyib, bahar keçər.

Qiyamət oldumu, ya bir neçə şəhidlərə,
Qiyamət etmək üçün baxa-baxa yar keçər.

Fəğan ki, məndə ayaq yoxdur, onda təmkin çox,
Keçincə yar ötər ömr, ruzgar keçər.

Nəşati-vəsl təmənnasi ilə olma məlul,
Könül, bu bir neçə gün hər rəviş ki, var keçər.

Giran gəlir sənə zalim demək, vəgərnə mənə,
Nə zülm eyləsən, ey atəşin üzar, keçər.

Çox etmə giryə, göz axir zərur olur, Qövsi,
Gəlib nəzarə günü, şami intizar keçər.

* * *

Dil munca arizu ilə bimüddəalənür,
Hərgah nalə ilə əsər aşinalənür.

Hər bir kiyahə daldalanur, qorxudan səba
Çün seyd qəsdinə xəmi-zülfün həvalənür.

Kafər mənim tək olmasın ol kəmnigahə kim,
Hər bir nəzərə yadlənür, aşinalənür.

Rəsmi-süluk ol büt ilə nola dustlər,
Hərçənd kim, vəfalənürəm, bivəfalənür.

Dil titrərü gözüm qaralur qarə gözlərə,
Gər məğzi-sürməvü sümügüm titiyalənür.

İqbali-bəxt himmət ucaldıqca pəst olur,
Naləm rəsalənürcə əsər narəsalənür.

Hey tərki-bərk eyləmədin bulmaz ol səda,
Surət ki, binəvalənə, məna nəvalənür.

Ey fəqrdən özün əridən kimiya üçün,
Səbr etsən öz-özünə misin kimiyalənür.

Qövsi, qapusi Kə`bələnür hacət əhlinə,
Hər kim ki, eşq qapusinə ilticalənür.

* * *

Üşşaqi-binəvayə qulaq tut, nəvayi gör,
Ney tək bu bizəbanlara dil ver, hərayi gör.

Göz varə-varə könlüm evin göz-göz eylədi,
Dəryayə saldı rəxnələr ol qanlu çayi gör.

Derdim ki, novbahar gələ, könlüm açıla,
Sındırdı şaxü balımı, ol mumiyayi gör.

Aldanma piçü tabına muyi-miyaninin,
Ey qafil, aç gözün, bu görünməz bəlayi gör.

Almaz məhəbbəti həvəsi-qəlb nirxinə,
İnsafa bax, mürüvvəti seyr et, vəfayi gör.

Öz cani düşmənini sevər aşiqəm deyən,
Biəqli gör, səfahəti gör, binəvayi gör.

Zahirdə zə`fdən çəkə bilməm nəfəs, vəli,
Mə`nidə çəkdigimcə nəfəs ahü vayi gör.

İnsaf tərkin etmə, nə istərsən et mənə,
Yəni aradə aşiqi görmə, xudayi gör.

Qövsi əgərsə boynini, çox baxma xar ana
Rənalənən zəmanda bu xəmgəştə yayi gör.

* * *

Qətlimə bel bağlamış ol cahilü nadanı gör,
Susayıbdır qanıma, ol atəşin cövlanı gör.

Əglədi könlüm məni axır bu naxoş mülkdə,
Xaki-daməngir olubdur ol bir ovuc qanı gör.

Gözlərim gəşti kimi hərçənd xuşkü xalidir,
Çak sinəmdən nəzər sal könlümə, tufanı gör!

Ey gözüm nuri, bulanır su, vəli sərçeşmədən
Könlümün halın sorunca çeşmi-xunəfşanı gör.

Eşq qurtardı cəhanın qeylü qalindən məni,
Oldu dərman dərdimə, ol dərdi-bidərmanı gör.

Zəhrdir mə`nidə hər tiryak əgər bina isən,
Sübhi-vəsl ayinəsinə bax, şəbi-hicranı gör.

Görmə, saqi, cam üçün əldən-ayaqdan getdiyim,
Gərdişi-dövranı gör, ömri-səbükcövlanı gör.

Ayinə almaq ələ, Qövsi, nə layiq aşiqə,
Gər özün görmək dilərsən, bax məni-heyranı gör.

* * *

Qönçeyi-gül ta gülüstanın çırağın yandırır,
Əndəlibin pərdeyi-çeşmində yağın yandırır.

Yanaram ah etməsəm, gər ah çəksəm, ah kim,
Bülbüli-biçarənin, bağü budağın yandırır.

Eyləmişdir şami-hicran sinəmi zülmətsəra,

Bu səbəbdən onda canan şəm dağın yandırır.

Eşq əhli aşiq istər cümleyi-əhbabını
Kim, səməndər mizəban olsa, qonağın yandırır.

Gərmdir əzbəs nigahım yandırır göz pərdəsin,
Vəh nə səhbadır bu səhba kim, ayağın yandırır.

Yandırır ol atəş ilə xanimanın aqibət,
Hər kimin gərduni-dunpərvər ocağın yandırır.

Ol gül içün bağban nazın çəkər hər xardən,
Nükhəti-gül gərçi Qövsinin dimağın yandırır.

* * *

İlahi, nola gər lal olsalar şeydayi bülbüllər
Ki, yarın bivəfavü bitəhü hərcayidir güllər.

Məgər pərvanə bilmiş etibarın şəm`i-xudkamın
Ki, öz balü pərindən başə hər dəm savurur güllər.

Xətü xalınıza çox məğrur olmun, ey gözəllər kim,
Bu gün-danla qoyar güllər sizin başınıza kakillər.

Dədü dam ülfəti yegdir bu xəlqin ixtilatından,
Anınçün aşiqi-divanəyə mərğubdur çöllər.

Bu iki namülayim şivədən, yarəb, nolur hasil,

Sənü naxoş təğafüllər, mənü bica təhəmmüllər.

Doludur şur ilə Fərhadü Məcnun çölləri, əmma
Gəlin ki, özgə aləmdir bizim dağlar, bizim çöllər.

Dəxi zülfi-girəhgir arizu eylərmidim, Qövsi,
Əgər gahi tutulmuş könlümü açsaydı sünbüllər.

* * *

Əflak könlümün quşuna aşiyanədir,
Səyyarü sabitü məhü xurşid danədir.

Nisbət mənə hekayəti-Məcnun fəsanədir,
Naləm yanında şivəni-bülbül təranədir.

Yüz min bəhanə istərəm ol kuyə varmağa,
Derlər ki, cənnətin səbəbi bir bəhanədir.

Sübhi-xümar çeşmi-siyahın nəzarəsi,
Keyfiyyətafərini-şərabi-şəbanədir.

Layiq degil əbəs yerə etmək xərab onu,
Ey şahi-hüsn, çün sənə könlüm xəzanədir.

Sən yad isən mənimlə xəyalın bir evlidir,
Biganəsən, özün, qəmü dərdin yeganədir.

Əhbabə sərgüzəştini Qövsi bəyan edər,
Sanmın ki, mətləbi qəzəli-aşiqanədir.

* * *

Nəzzareyi-gül ilə dərdi-yar tazələnür,
Bu səndəl ilə sədai-xümar tazələnür.

Şərabi-nab ilə təşviqi-daği-eşq artar
Ki, hər qədər su içər, laləzar tazələnür.

Fəğan ki, bəxyə ilə zəxminin biri min olur,
Aman ki, mərhəm ilə daği-yar təzələnür.

Mürur ilə kəm olur süzi-təşnə, heyranəm
Ki, vədə köhnələnür, intizar tazələnür.

Təravəti-güli-rüxsari arturur xəti-səbz
Ki, əbr olanda çəmən, novbahar tazələnür.

Qəfəs əsiriyəmü binəvalığım vardır,
Bu gün ki, bərglənüb şaxsar tazələnür.

Nihali-təb`imi qəm günbəgün füsürdə qılır,
Bahar fəsli ki, hər novki-xar tazələnür.

Xəyali-xalü xətü zülfi-müşkbarından,
Nəsimi-ahim ilə novbahar tazələnür.

Gözüm kim, üz çevirir tiği-abdarından
Ki, gər sən avçı olursan, şikar tazələnür.

Görəndə xət əsərin vəslinə anın, Qövsi,
Ümidi-xatiri-ümmidvar tazələnür.

* * *

Nola gər bağrımı qan, çeşmimi giryan eylər,
Mənə fərman özünündür, nə ki, canan eylər.

Murü mar ilə düşübdür sərü karım, neylim,
Könlümi xalı yıxar, zülf pərişan eylər.

Bir uşağın yenə baziçə evidir könlüm
Ki, həman yapdığı saət onu viran eylər.

Nagüvaradır əgər qeyr verə abi-həyat,
Yar əgər dərd verir, dərdimə dərman eylər.

Qönçələtmiş məni ol şaxi-gülün hicranı,
Bibəsirət mənə təklifi-gülüstan eylər.

Kimsənin dəgməmişəm könlünə hərgiz, yarəb,
Yenə hər kim ki yetər, könlümü viran eylər.

Tifldir sevdicigim, yaxşı-yəman fərq etməz
Ki, əgər Kə`bə, əgər bütkədə-viran eylər.

Ola gər Qövsiyə mənzur güli-rüxsarın,
Nəzmi-rəngin ilə dünyanı gülüstan eylər.

* * *

Bu rəsmlə əgər əbruyi-yar işarələnür,
Şəkib riştəsi zəncir olursa, parələnür.

Çəməndən ötdümü ol mah kim, füruğindən,
Gül aftablənür, şəbnəmi sitarələnür.

Təmam daği-bəladır əgərçi hasili-eşq,
Bü dərdə səbr eləsən, öz-özinə çarələnür.

Sədəf də gövhər olan qətrədən olur zahir
Ki, eyn bəhrdə dəryalənən kənarələnür.

Ölürkən atəşi-suzəndə öylə xara nərm,
Fəğan ki, naləm ilə yar könlü xarələnür.

Qılır cəhanı müsəxxər livayi-əxzəri-xətt,
Əgərçi zülf bu gün-danla hiçkarələnür.

Füruğ birlə güli-zəxmi şəm`i-məşhər olur,
Anın ki, tiği-şəhadətlə başı yarələnür.

Ayağdən çək əlin, lalədən qiyas eylə
Ki, yüzi qırmızı olduqca, içi qarələnür.

Diyari-hüsndə həm əl-əl üstə çoxdur kim,
Sözi yanında anın ağzı hiçkarələnür.

Məali-muyi-miyan piçü tabdır, Qövsi,

Haçan xəyal ilə ol ləfzi-məni arələnür.

* * *

Könül almaq rəvişin ol güli-xəndan nə bilir,
Biri kim, vaqifi-dərd olmaya, dərman nə bilir.

Almamış könlünü əldən özü tək kafər anın,
Möhnəti-hövsələsuzi-şəbi-hicran nə bilir.

Ruzigarın qara, öz zülfi anın eyləməmiş,
Dudi-ahi-məni-məhcurü pərişan nə bilir.

Nemətin zövqini pərvərdei-nemət bilməz,
Ana çoxdur dilü can, qədri-dilü can nə bilir.

Sitəmü lütf təmizin edə bilməz aşiq,
Nikü bəd fərqini ayineyi-heyran nə bilir.

Nola gülruxlər əgər bir kimə iqbal edələr,
Bəli, öz qiymətini gövhəri-qəltan nə bilir.

Kim ki, bilməz özünü, öz sözünü həm bilməz,
Ərzi-mətləb nəsəqin Qövsiyi-heyran nə bilir.

* * *

Bir yol demədin kim, könül, ey yar, kimindir,
Ey kaş, biləydin ki, bu bimar kimindir.

Məhcur mənəm, özgəyədir guşeyi-çeşmin,
Məxmur kimü sağəri-sərşar kimindir.

Könlüm mənim avarəvü sən qeyr qəmində,
Kim xanəxərab olmuşü memar kimindir.

Mən təşnələbəm, sən suyu toprağə səpirsən,
Bimarü pərişan kimü timar kimindir.

Getdi könül əldən rüxü zülfün həvəsindən,
Viranə kimin, gənc kimin, mar kimindir.

Bir pillədədir cəm`i-qəra daş ilə gövhər,
Yüsif necə bilsin ki, xəridar kimindir.

Zahid, mənə gəl söyləginən dini sevərsən,
Təsbih sənin, həlqeyi-zünnar kimindir.

Yoxdur xəbərim kim, könül olmuş kimə heyran,
Ayinə nə bilsin səri-bazar kimindir.

Hər niş ilə bir nuş gərək yar ola, Qövsi,
Gər xar sənindir, güli-bixar kimindir.

* * *

Öylə kim, dərman sənindir, dərdi-bidərman sənindir,
Hər nə etsən, padşahım, eylə kim, fərman sənindir.

Təşneyi-didarinəm mən, ey güli-tər, xarinəm mən,

Bir əmanətdarinəm mən, dil sənindir, can sənindir.

Könlümü əvvəl alırsan, axırı gözdən salırsan,
Qibləgahım, sən bilirsən, ev sənin, mehman sənindir.

Ey mənim çeşimim çırağı, könlümün ümmidi saqi,
Qan ilə doldur əyağı kim, bu gün dövran sənindir.

Dinü dildən keçməyimmi, hasilimdir, biçməyimmi,
Qana-qana içməyimmi, kasa-kasa qan sənindir.

Gərçi vəslin oldu müşkil, bəs ki var ortada hail,
Olmuşam hicrana qail, çün şəbi-hicran sənindir.

Gəl məni, ey qafil, öldür, kim, mənim məqsudum oldur,
Xah ağlat, xah güldür, dideyi-heyran sənindir.

Çox da cövrə mail olma, düşməni-canü dil olma,
Hali-dildən qafil olma, çünki ol viran sənindir.

Başın oldu kuyi-meydan, qaməti-xəmkəştə çövkan,
İmdi, Qövsi, eylə cövlan, ərseyi-meydan sənindir.

* * *

Çırağı-dağ ilə könlüm vüsali-yar istər,
Yəqin ki, laleyi-pəjmürdə novbəhar istər.

Aç ağzın ilə fəğan, ey sipəndi-təmkin, bəs
Ki, eşq əhlini məşuq biqərar istər.

Xərabi-cilveyi-bibaki-şami-hicrəm kim,
Nə arizu, nə təqazə, nə intizar istər.

Cəhanda rəsmi-vəfa umma kimsədən zinhar
Ki, qəm əlində ölür kim ki, qəmküsar istər.

Odum kül oldu, külüm axtarur səba, tapmaz,
Hənuz eşq məni xarü xaksar istər.

Yeri, şəbi-qəmim, ey şəm, rövşən eyləməgil,
Bu gündə çün məni ol atəşin üzar istər.

Cəhanda görməlü yüz çünki verməz üz, Qövsi,
Bu yüzdən ayinəsi didəmin qübar istər.

* * *

Gərçi hər aşiqə hicran qatı müşkil görünür,
Mənə bir ləhzə fərağın neçə min il görünür.

Mən düşən vadiyə basmın qədəm, ey aşiqlər
Ki, bu çöllərdə nə Məcnun, nə məhmil görünür.

Şirlər pəncə salır vadiyi-xunxarində,
Eşq əgər bicigərü bixudü bidil görünür.

Cəzbeyi-aşiqə əğyar ola bilməz mane,
Xarü xəs atəşi-suzanə nə hail görünür.

Savurur gülləri öz başinə pərvanə üçün,
Şəm zahirdə əgər sərgəşü qafil görünür.

Özgə taətlərə oxşatma mənim taətimi
Ki, mənə müttəsil ol Kə`bə müqabil görünür.

Vəsl bəzmində ki, əğyar ola əngəl, Qövsi,
Hər ili bir dəmü hər saəti bir il görünür.

* * *

Var isə cəm`iyyəti-xatir, pərişanlıqdadır,
Mə`niyi-aram  surət tapsa, heyranlıqdadır.

Ruziyi-ərbabi-daniş xuni-dildir dəhrdə,
Bir fəraqət var isə aləmdə, nadanlıqdadır.

Alü valasinə dünyanın müxənnətlər kimi,
Mail olma kim, libasi-mərd üryanlıqdadır.

Dərd əhlinin qəmi bidərdə təsir eyləməz,
Bərq xəndanlıqdadır, ta əbr giryanlıqdadır.

Tövbədən, vaiz, mənim daim nədamətdir işim,
Çün dedin kim, tövbə mə`nisi pərişanlıqdadır.

Aləmə fərmanrəvadır zülf ilə xalın sənin,
Marü muri həm bu iqlimin Süleymanlıqdadır.

İstəməz dinü dilin ol namüsəlman Qövsinin,
Gör nə kafər macəralıqlar müsəlmanlıqdadır.

* * *

Nə sözdür bu ki, sən bərqi-bəla, dünya neyistandır
Ki, hüsnündən sənin, ey şaxi-gül, aləm gülüstandır.

Şikayət təngnayi-şəhrdən gər etməyim, neylim
Ki, bu divanəyə səhrayi-imkan təng meydandır.

Gözüm sormaz könül halın, könül bilməz göz əhvalın,
Öz əhvalinə bəs kim, hər biri eşqində heyrandır.

Fəğan kim, iztirab artar, anın gördükcə rüxsarın,
Sanırdım kim, vüsal ol dərdi-bidərmanə nöqsandır.

Təğafül eylərü çıxsın deyər canın ki, aşiqsən,
Məgər ol səngdil bilməz ki, aşiq həm müsəlmandır.

Təbibim, bilmənəm mən öz sözüm, vallahi-billahi,
Bəli, hədyan deyər ol xəstə kim, halı pərişandır.

Xəyalından anın hər kiprigim bir şəm edər rövşən,
Dönüb pərvanələr, Qövsi, sanırlar kim, çırağandır.

* * *

Anınçün mən sənə yalvarmanam kim, yalvaran çoxdur,
Mənim könlüm alan yoxdur, sənə könül verən çoxdur.

Məni-dilxəstənin həm sədqə üçün sorginən halın,
Sənin kim, nərgisi-bimarın əhvalın soran çoxdur.

Dili-sədparəmi sən alginən, ey namüsəlman kim,
Bu gün ol laleyi-sədbərgi dörd yandan dərən çoxdur.

Gözüm, nöqsani-naz olmaz, sual et hali-zarım kim,
Mənim dərdim bilən yoxdur, sənə gər bildirən çoxdur.

Haçan fürsət verir, nazü təğafül dərdi-hicranə,
Bəli, əhya verən azdır, vəgərnə öldürən çoxdur.

Uzaqdır yol, gərəkdir ləngü ləngan başə aparmaq,
Vəgərnə öz səməndin bir havur yortub yoran çoxdur.

Qənimətdir kimin kim, dideyi-mənisi rövşəndir,
Vəgərnə çeşmi-surətbin ilə, Qövsi, görən çoxdur.

* * *

Səba, səlamımı lütf ilə ol diyarə yetir,
Pəyamımı, sözümü hal evində yarə yetir.

Qəfəs əsiri olan əndəlib peyğamın,
Çəməndə bülbülə ərz eylə, novbaharə yetir.

Sükut çağı degil, ey sipənd, aç dilini,
Mənim niyazimi ol atəşin üzarə yetir.

Əgərçi mən kimi, ey şəmi-bəzm, dilsizsən,
Yanıb-yanıb ana sən daxi bir işarə yetir.

Tərəhhüm et mənə, ey nalə, durma tanrı üçün,
Məni anın səri-kuyinə varə-varə yetir.

Bu bəhrdə göhər əl verməz, ey murad yeli,
Səfinəmi, kərəm et, bari bir kənarə yetir.

Götür qübar kimi cismi-zarimi, Qövsi,
Nəsimi-nalə ilə övci-etibarə yetir.

* * *

Ləbi-meynuş, saqi, özgədir, mey gərçi rəngindir,
Həyati-cavidan sərçeşməsi ol cani-şirindir.

Ədəb bir yanə, ol bir yanə kim, məstəm, əlim tutmaz,
Kəsilsin əlləri, ey bağban, hər kim ki, gülçindir.

Könül artıq gedər əldən gözüm gördükcə dildarı,
Bu zəxmi eyləyən nasur ol ahuyi-mişkindir.

Mənim əhvalımı xali-ləbin tək hiç kim bilməz,
Bilir Fərhad şurin hər kimin mətlubi Şirindir.

Rüunət satma bişərmanə ol məhfildə, ey mina,
Ayaq duz qoy, xəbərdar ol ki, saqi könlü səngindir.

Könül titrər, gözüm görməz, əlim tutmaz, ayaq getməz,
Görər heyranlığım canan, xəyal eylər ki, təmkindir.

İlahi, günbəgün artıqraq olsun abi-rəngin kim,
Üzün nəzzarəsindən gözlərim damani-gülçindir.

Gərək, zahid, müvafiq bir-birilə surətü mə`ni,
Nola zünnar bağlarsam ki, məqsudim büti-Çindir.

Gələn Qövsi degil, Məcnun qübaridir bu çöllərdə,
Neçün durmazsan, ey kuhi-giran yerdən, nə təmkindir.

* * *

Mənim gözüm ki, nə gülbün, nə yasəmin yeridir,
Həzar şükr kim, ol sərvi-dilnişin yeridir.

Necə könül götürüm könlüm ülfətindən kim,
Bir öylə tazə nihalın bu sərzəmin yeridir.

Səninlə qanı rəqibin, gözüm, haçan qaynar.
Anın ki, sinəsi yüz rəng, küfrü kin yeridir.

Yaxamdan əl götürüb məndən ötməyən zahid,
Yeri ki, məscidü mehrab əqlü din yeridir.

Əzizdir dili-divanə Kə`bədən artıq,
Bəli, bu məni evi surətafərin yeridir.

Boyun bəlasın alım, hal evində sözlərimi,
Nə məniyə ki, sən anlarsan, afərin yeridir.

Əgərçi ki, meykədədir sərbəsər ana aləm,
Fəğan ki, mədrəsələr Qövsiyi-həzin yeridir.

* * *

Könül əvvəl gəlir gözdən, gözüm hərgah giryandır,
Müdam ol qətreyi-sərgəştə pişa-pişi tufandır.

Ələm qaldırdı ahim, tiğ çəkdi naleyi-zarim,
Deyin gəlsin bu gün meydanə hər kim mərdi-meydandır.

Kəbab olmuş cigərlər nükhəti, gəlməz giran gül tək,
Əgər aşiq min il ömr eyləsə, bir ləhzə mehmandır.

Verirsən baş ana seylabi-bizinhari hər saət,
Gözüm nuri, mənim könlüm məgər dəryayi-ümmandır?

Nihalın görmənəm, əmma yəkəndir, sayeyi-sərvin,
Vüsalın bilmənəm, əmma xəyalın mahi-Kən`andır.

Nə keyfiyyət verir xuni-cigər, sən verməsən sağər,
Dili-bitab, hərçənd olsa saqi, bir avuc qandır.

Bilir ol çeşmi-guya, özgələr bilməz nə dildir bu,
Libasi-ariyətdən sözlərim hərçənd üryandır.

Mənə təklifi-zünnar indi eylərlər brəhmənlər,

Nə bilsinlər bu cahillər ki, Qövsi piri-Sənandır.

* * *

Könlümü almaq haçan ol sərvi-baladən gəlir,
Gər bu məni gəlsə ol ahuyi-rənadən gəlir.

Hər nigahi-məst kim, ol çeşmi-şəhladən gəlir,
Bir firəngizadədir, guya kəlisadən gəlir.

Mən kiməm, ta məddi-ahim eyləsin təsir kim,
Hər əsər, hər nalə, ey ney, nalə fərmadən gəlir.

Gər kiçikdir şişeyi-saət kimi könlüm mənim,
Gəl ki, dəryalərcə mey, saqi, bu minadən gəlir.

Ləxt-ləxt olmuş cigərlər sanma könlümdən gələn,
Namələrdir kim, mənə Məcnuni-şeydadən gəlir.

Sanma ahular gözün bikar kim, ol pərdədə,
Dəmbədəm peyğamlər Məcnunə Leyladən gəlir.

Öylə kim, Qövsi, gəlir bimarə dərman sübhlər,
Nüsxeyi-dərdim mənim hər gün Məsihadən gəlir.

* * *

Odlu dağimdən dəmadəm pənbeyi-mərhəm yanar,
Ah, əgər mən böylə yansam, sərbəsər aləm yanar.

Şöleyi-rüxsarin ilə yandı çeşmim mərdümi,
Bir rəviş ki, çeşmeyi-xurşiddən mərhəm yanar.

Hüsn özü fariğ degil yanmaqdan, ey pərvanə kim,
Qeyri yandırmaqdan artıq şəmi-şami-qəm yanar.

Şəm tək mümkün degil bəzmində yarın giryə kim,
Pərdeyi-çeşmimdə tabi-arizindən qəm yanar.

Gər damağım yansa eyb olmaz bu hal ilən mənim,
Dustlər bəs kim, qalur sinəmdə dərdü qəm yanar.

Ağlaram hər rəng kim, biganələr ağlar mənə,
Yanaram bir növ kim, əhvalimə aləm yanar.

Şəm tək Qövsi əgər gül yansa eşq əhvalına,
Ol oda pərvanə tək əlbəttə bülbül həm yanar.

* * *

Sanmın muradım əhli-həvəs tək nəzarədir
Kim, mətləbim mənim cigəri-parə-parədir.

Fəryad ilə oyanmadı bəxtim haray kim,
Gərdun mənim sitarəm üçün gahvarədir.

Yarəb, unutmasın məni bu rəhgüzardə,
Ol çeşmi-nimxab ki, məsti-guzarədir.

Mina yetirdi başını saqi ayağına.
Zalim, məgər mənim cigərim səngxarədir?

Xal etdi sən kimi günümü qarə, ey sipənd,
Odlarə yandıran məni həm ol sitarədir.

Gülşəndə xar baxma mənə əndəlib tək,
Ey bağban, mənim qərəzim bir nəzarədir.

Zinhar kəm libasına kəm baxma aşiqin
Kim, dağın altı qırmızıdır, üstü qarədir.

Ta düşdü didə daneyi-xalın xəyalinə,
Zahid kimi mənim də işim istixarədir.

Hərçənd xaksar tutarlar öz-özlərin,
Ərbabi-dil yanında fələk hiçkarədir.

Müjgan kimi dələr cigərin səngxarənin,
Hər misram ki, qaşın ucundan işarədir.

Ahi-şərərfəşan ilə yandırdı aləmi,
Qövsi, əgərçi eşq odundan şərarədir.

* * *

Ey şəm, eşit gör ki, nə əfsanələrim var,
Məcnun kimi zəncirdə divanələrim var.

İstər gözü könlüm səni, ey Leyliyi-aləm,

Gəl, başın üçün, gör nə siyəh xanələrim var.

Mən bülbüli-ləbbəstəyəm, ey şəm`i-diləfruz,
Axtar gülümü, gör ki, nə pərvanələrim var.

Rəhm eylə mənə, cismi-zəifim yelə vermə,
Ey nalə, bu topraqda mənim danələrim var.

Əglənmədi, ta yetdi mənə gənci-rəvan tək,
Seylab nə bilsin ki, nə viranələrim var.

Hərçənd ki, divanəsiyəm zövqi-vüsalın,
Ey mah, xəyalınla pərixanələrim var.

Sən`an kimi bir büt mənə mənzuri-nəzərdir,
Tərsa kimi hərçənd ki, bütxanələrim var.

Toprağımı qan nirxinə bitəhlərə satmaz,
Saqi bilir olsa ki, nə meyxanələrim var.

Ey gözləri meyxanə, ayaq çəkmə gözümdən,
Hərçənd əlindən dolu peymanələrim var.

Eşq içrə məni gərçi təhidəst bilirlər,
Ol bəhrdə Qövsi kimi dürdanələrim var.

* * *

Mən ki, əldən getdim, ol sərvi-səbükcövlan gəlir,
Ah, bilməm neyləyim kim, can gedir, canan gəlir.

Gərçi qalmaz məndə can, ey dil, əgər canan gələ,
Can gedir-getsin, nə qəm, kim ömri-cavidan gəlir.

Hiç yerdən türfə odlandım, sipənd oldum, könül,
Zahirən kim, başimə ol atəşin cövlan gəlir.

Kuyinə hərçənd kim, gəlsəm gözüm görməz səni,
Ayinə bazardən heyran gedir, heyran gəlir.

Gül tək, ey gül, ta qulağ oldun mənim avazimə,
Nə qədər kim, artıq əfğan eylərəm, əfğan gəlir.

Ta qonağımdır qəmü dərdin həvadisdən, nə qəm,
Ol evi seylab yıxmaz kim, ona mehman gəlir.

Sən əgər, ey saqiyi-xunxar, gəlməzsən, vəli,
Öz ayağilən xəyalin başimə məstan gəlir.

Ah kim, dağlar kimi ləngər salır, getməz daxi,
Gərçi daşqun seyl tək, Qövsi, şəbi-hicran gəlir.

* * *

Vəsldən göz yaşı, ey dideyi-əhbab, artar
Ki, bahar ayı yağar yağmurü seylab artar.

Ayağa tökmək ilən xuni-cigər qurtulmaz,
Nə qədər artıq içərsən bu meyi-nab artar.

Yuxu girməz gözümə, ta görürəm rüxsarın,
Bu nə sözdür ki, bahar ayi şəkərxab artar.

Mövc urar dideyi-pürnəmdə xəyalın gecələr,
Hər qədər göz yumuram, pərtövi-məhtab artar.

Gözümü silmək ilən ləxti-cigər az olmaz,
Sən ki, gülçin olasan, qönçeyi-sirab artar.

Dəmbədəm mən gedirəm əldənü bitab oluram,
Kakilində məgər, ey şəm, sənin tab artar.

Saqi hərçənd verir cami-ləbaləb, Qövsi,
Bu bəladır ki, xümar artarü xunab artar.

* * *

Böylə əldən getdigim gər bilsə yar, əldən gedər,
İztirabım görsə bəhri-bikənar, əldən gedər.

Xarü xəs seylab önün saxlar kimi öz könlümü,
Ol qədərlər saxlaram kim, ixtiyar əldən gedər.

Qönçə çak eylər giriban, görsə gül tək zəxmimi,
Sineyi-pürdağim açsam, laləzar əldən gedər.

Seyri-bağ üçün sənin, ey sərvi-rəna, damənin,
Qoymənəm əldən, əgər yüz novbahar əldən gedər.

Getmişəm mən huşdən, ey Kə`bərov yoldaşlar,

Siz gedin kim, mən gəlincə ruzigar əldən gedər.

Kuyinə gəlməkdə hər gün öz inanım saxlaram,
Ah, neylim ol nəfəs kim, ixtiyar əldən gedər.

Bənzəməz heç nəstəyə hərçənd miskindir könül,
Ta düşər ayinə, ey ayinədar, əldən gedər.

Varə-varə zəhr ilə adət qılırlar, ah kim,
Hər qədər səbr eylərəm, səbrü qərar əldən gedər.

Nimbismil seydi, ey qatil, tez öldürmək gərək,
Sən bu təmkin ilə tərpənsən, şikar, əldən gedər.

Bir-birinin dərdinin dərmanıdır həmdərdlər,
Mən bu gülşəndən əgər getsəm, həzar əldən gedər.

Olmadin bihuş, vəslin bulmaq olmaz, neyləyim,
Gər mən əldən getməsəm, saqi, şikar əldən gedər.

Tutginən damani-dil varü yoxundan aləmin
Kim, könüldən qeyri, Qövsi, hər nə var, əldən gedər.

* * *

Hər dəm əldən məni ol pənceyi-müjgan aparır
Ki, anın tiği ilə bismil olan can aparır.

Aparır cənət özilə biri kim dünyadən,
Çeşmi-tər, sineyi-suzan, dili-büryan aparır.

Eşq kuyində ərit könlini kim, dərya tək
Gətirən qətrə ana gövhəri-qəltan aparır.

Çeşmi-məstin aparır könlümü nəzzarə ilə,
Badeyi-nab verir, gər bir ovuc qan aparır.

Böylə kim, mən görürəm, zahid anın ehsanın,
Çoxları cənnətə məhşər günü üsyan aparır.

Gərçi öz könlünü hər kim ola, abad istər,
Ey xoş ol kim, bu xərab olmuşu viran aparır.

Bülbül andan nə aparsın ki, bu bağın, Qövsi,
Laləsi dağü gülü çaki-giriban aparır.

* * *

Ey xəyalın həmdəmim, adın mənə yalquz yetər,
Dərd-sər çox vermənəm, əhləm, mənə bir söz yetər.

Kəsmə məndən mehrin, ey xurşid, iqbal eylə kim,
Mən kimi şəbnəmləri yandırmağa yulduz yetər.

Olma qafil məndən, ey səyyad, seydi-lağərəm,
Yollar üstə damlər tək olmuşam göz-göz, yetər.

Şuri-məhşər salmağa dünyayə hər dəm, hər zaman,
Gər zəifəm mən, vücudimdən mənim bir toz yetər.

Munca həm sahibnəzər rəşk eyləməz həm çeşminə,
Könlümin qanını tökdin yerlərə, ey köz, yetər.

Ta dili-bitab var, hacət degil hicran odu,
Müddəa gər dağ isə yüz dağ üçün bir köz yetər.

Gər dilər Qövsi gözüm ol sərvi, binisbət degil,
Qamətim hərçənd xəmdir, nəxli-təb`im düz yetər.

* * *

Bu rəng mənim bağrım əgər qan olacaqdır,
Aləm qamu bir qitə gülüstan olacaqdır.

Ey şaxi-gül, ol qaməti-mövzun həvəsindən
Çox sərv bu gülşəndə xüraman olacaqdır.

Göz yaşına yüz vermişəm, əmma bilirəm kim,
Ol seyl ilə könlüm evi viran olacaqdır.

Sən oxların, ey nalə, yığıb saxla ki, bir gün,
Sinəm hədəfi-navəki-müjgan olacaqdır.

Ölləm dəxi, ey nəqdi-həyatım, bilir olsam
Kim, ruhi-rəvanım sənə qurban olacaqdır.

Sərf etdi cigər qanını israf ilə çeşmim,
Bilməz ki, bu gün-danla pərişan olacaqdır.

Əzbəs ki, bahar ayini, saqi, gözüm istər,
Ol günlər olunca cigərim qan olacaqdır.

Yüz siğə ilə tövbə verir özgəyə zahid,
Əmma özü min qatla peşiman olacaqdır.

Hicran gecəsi gəldi ki, hər qətreyi-əşkim,
Pərvanələrə şəm`i-şəbistan olacaqdır.

Qövsini unutma ki, sənin qaşın ucundan
Hər misrəi bir mətləi-divan olacaqdır.

* * *

Mən təbibəm hər kimin kim, dərdi-bidərmanı var,
İxtiyarilə gərək təslim ola, ta canı var.

Ey anın rüxsarı ilə bəhs edən xurşid, hey,
Sanma kim, hər surətin bir mənisi, bir anı var.

Küfri-zülfündən sənin zahid əsirgər dinü dil,
Qibləgahim, kafərəm mən gər anın imanı var.

Mən anınçün intəhasız qəmlərə şükr eylərəm,
Kim, ölümdəndir betər hər dərd kim, dərmanı var.

Xaki-biqədr ilə yeksandır mənə zahid kimi,
Öz yanında hər kimin kim, izzətilə şanı var.

Arxa vermə varinə, bel bağlama dünyayə kim,

Xərməni vardır, vəli bərqi-səbükcövlanı var.

Piçü tabi-nalədən məlumdur kim, Qövsinin
Bu pozulmuş cism içində bir üzülmüş canı var.

* * *

Əgər min dağ yandırsam, könül bir ayrı dağ istər,
Gəda, gər sərbəsər aləm çırağandır, çırağ istər.

Gözüm görməz həyadan vəsl üçün, əmma könül titrər,
Bəladır böylə sərxoş kim, əli tutmaz, ayağ istər.

Məhəbbət olsa, təklifü təvazö olmaz, olmasın,
Yüzündən bəllidir hər mizbanın kim, qonağ istər.

Mənə gülgüşt təklifin edərlər dərdbilməzlər,
Nə bilsinlər bunu kim, nükhəti-gül həm dəmağ istər.

Məni-divanəyə eşq içrə hər bidərdi bənzətmiş
Ki, Məcnun vüs`əti-səhra sevər, Fərhad dağ istər.

Şəbi-hicran qəradır kövkəbi bəxtim kimi, əmma,
Xəyalın pərtövündən mehrü məh məndən çırağ istər.

Gözü surət görən, mənidən agah olmayan qafil,
Əgər vəsl istəsə, bir kurə bənzər kim, çırağ istər.

Nəsimi-sübhdən hər gün səri-kuyin sorar Qövsi,
Bu qafil öz evinin həm yolun bilməz, sorağ istər.

* * *

Gərçi xublar möhnətin hər aşiqi-heyran çəkər,
Saqiyi-nazafərinin nazını dövran çəkər.

Çıxmaz, ey qatil, xədəngi-dilnişinin sinədən,
Can çəkər, hər kim ki, zəxmimdən mənim peykan çəkər.

Gör nə cahildir edər təqlid əzəl nəqqaşını,
Ol müsəvvir kim, misali-surəti-canan çəkər.

Hər yana getsəm çəkər rəhm eyləyib hicran məni,
Ey deyən kim, zə`f ilə aşiq necə hicran çəkər.

Şükrlillah, şami-hicran həmnəfəssiz qalmışam.
Mən nəfəs çəkdikcə ney həm naləvü əfqan çəkər.

Könlümün göz gövhər eylər qətrə-qətrə qanını,
Əbrdən dəryayi-ümman minnəti-ehsan çəkər.

Eyləməz ehmal Qövsi can nisar etməkdə kim,
Gah-gahi öz inanın, gər çəkər, meydan çəkər.

* * *

Biəsərdir nalə ta ney tək, əsər bəndindədir.
Binəvadır ol qəni kim, bərgü bər bəndindədir.

Qətreyi-bitabımız tez gövhəri-qəltan olur,
Bəlkə gövhərdir, həmin sahibnəzər bəndindədir.

Hüsn özü həm fariğ olmaz piçü tabi-eşqdən
Kim, kəməndi-kakili-müşkin kəmər bəndindədir.

Əbr tək, zinhar, cuşü giryədən göz yumma kim,
Gövhəri-dəryayi-rəhmət çeşmi-tər bəndindədir.

Əl-ayaq altında eşq əhli gərək pamal ola,
Bəs neçün pərvanə, Qövsi, balü pər bəndindədir.

* * *

Qeyr birlə gülsitan səhnində yarın seyri var,
Əldə mey, başında gül, yanında xarın seyri var.

Qönçeyi-gül novbaharın xalıdır, şəbnəm gülün,
Şərmdən qan tərləmiş gül, gülüzarın seyri var.

Xətti-mişkinin xəyalin gözdə təsvir eylədim,
Ol bəyaz içrə bu diqqətli qübarın seyri var.

Dağlar köksümdə, könlümdə xəyali-arizin,
Bir tərəf gül, bir tərəfdə laləzarın seyri var.

Səbzənin məftuni olmam, sünbülün bitabı kim,
Aşiqə xətt ilə zülfi-tabdarın seyri var.

Bağbanə nüktə tutma gülsitan nəzmində kim,
Gər bəsirət var, min il bir növki-xarın seyri var.

Qati ovc, Qövsiyi-şikəstə, yaydan nüdrətlidir,
Navəki-ah eyləsən etkan, şikarın seyri var.

* * *

Qibləgahim, səfheyi-hüsnündə xalın seyri var,
Aləmə qan udduran rüxsari-alın seyri var.

Gər mürüvvət eyləyib möhlət verirsə iztirab,
Bir nigah ilən yüz il şəmi-cəmalın seyri var.

Göstərir lövhi-dilü didəmdə min-min nəqşlər,
Handadır Mani ki, nəqqaşi-xəyalın seyri var.

Məhvi-qəddü xətti-səbzi-yar əgər olsam nola,
Kim çəməndə tazə səbz olmuş nihalın seyri var.

Ey mühəndis, qaşına, rüxsarına, anlinə bax
Kim, müqarin ovc gunə iki hilalın seyri var.

Bilmənəm söz çox da kim, qovğalı inşalər düzəm,
Bitəkəllüf xətti-mişkin ilə xalın seyri var.

Qaşların yayına sədqə, çək bir uc həm Qövsiyə,
Gözlə kim qurbanı, eydi-vüsalin seyri var.

* * *

Məni ol atəşin rüxsar çün yandırmağa başlar,
Sipənd özi-özini rəşkdən oddan-oda daşlar.

Çəkəndə tiğini biri-birilə qaynaşır qanlar,
Əlinə ta alır yayın, qavuşur bir-birə başlar.

Nə bir dəm könlümi alır, nə bir qatla sorur halım,
Heyf ol yaxşıdan kim, eşq əhlilə yəman başlar.

Baharistan olur hər nəqş anın rəngin xəyalından,
Edirlərsə mənim müjganımı gər xamə nəqqaşlar.

Deyirdim kim, desən ol mahə bir söz şəm`i- bəzm əmma,
Niqabın ta götürdi, öz gününə qaldı yoldaşlar.

Gözüm nuri, gözümdən bir nəfəs aram tutmazsan,
Mənim müjganamın curmi nədir, gər qanlıdır yaşlar.

Edərlər başimə topraq uşaqlar bilsələr, Qövsi
Ki, nə miqdar cövrümdə ağır qiymətlidir daşlar.

* * *

Əgər tuba, əgər sərv ol, qədi-rənayə rəşk eylər,
Yəqindir bu ki, hər həmtali bihəmtayə rəşk eylər.

Əgər aləm sənin eşqin oduna yansa, eyb olmaz
Ki, ayü gün çırağı pərtövinə sayə rəşk eylər.

Nola bitab olub qan alğasam, fəryadlər qılsam,
Gözüm nuri sənə məftun olan dünyayə rəşk eylər.

Nə bir həmdəm, nə bir fəryadrəs, nə naliyə rüxsət,
Nəvasızlıq hücumindən vücudim nayə rəşk eylər.

Yeri var əhli-fəqrə rəşk edərsə mərdümi-dünya,
Bəsirətsiz kişi kim, mərdümi-dünyadə rəşk eylər.

Nola rəşkin yükündən çar xəm bulsa cəhan, Qövsi
Ki, daim çərxi-çaçi bəs-hilali-yayə rəşk eylər.

* * *

Yandırmışam könüldə çəpü rast dağlar,
Kim şami-qəmdir, onda gərəkdir çırağlar.

Düşnam ilə, təbəssüm ilə ləli-ləb məni,
Hər dəm bir özgə çaşni ilə qonağlar.

Mütrib tutanda saqiyi-xunxarın adını,
Dillər tutuldu, tutmadı əllər ayağlar.

Bitab olub, fəğanlar edib yalvarım, nola
Kim, dözəməz bu bel büküci dağə dağlar.

Ta bir zaman qədəm basa ol sərvi-simbər,
Su üzrə tutdu mərdümi-çeşmim otağlar.

Qavuşdu dağ-dağə, təbibim qavuşmadı,
Sinəmdə mərhəminlə sənin qanlı dağlar.

Zülfündə könlümi bula madəm səba bilə,
Çox sərsəri dolandımü tutdum sorağlar.

Saqi, təğafül eyləmə kim, qəm yıxar məni,
Gər tutmasa əlim bu günümdə ayağlər.

Ol zülf ucundan asılı qalsa könül, nola,
Kimsə sınamadan birinə belmi bağlar.

Bir dəm ağız yumub, göz açıb həsrət ilə bax,
Ey əndəlib, hərzədəra keçdi çağlar.

Qövsi bu dərd birlə ki, ahın şüar edər,
Həm qeyri ağladar özü üçün, həm ağlar.

* * *

Şikvə nə üçün, cəfa sənindir,
Qurbanın olum, riza sənindir.

Başına dönüm, mənim başımda,
Gər az, gər çox həva sənindir.

Sən qönçə isən, səba mənimdir,
Mən bülbül isəm, nəva sənindir.

Hansı əsər etsə, mətləb oldur,

Çün dərd sənin, dəva sənindir.

Gər pəst isə səbrimin binası,
Gər nalə isə, rəsa sənindir.

Hərçənd artıq bəlalərim var,
Gəlsin mənə, hər bəla sənindir.

Yarəb, saxla yəman nəzərdən,
Ol mahi-mələkliqa sənindir.

Al könlümü, sərgəranlıq etmə
Kim, Qövsiyi-binəva sənindir.

* * *

Aşiqə hərçənd dərdü dağü möhnət yaxşıdır,
Ey dolanım başına, saqi, mürüvvət yaxşıdır.

Mən deməm kim, sərv, ya gülbün yəmandır, bağban,
Ol nihalın qaməti əmma qiyamət yaxşıdır.

Himmətincə hər kimin aləmdə bir mənzuri var,
Əndəlibə gül, mənə ol sərvi-qamət yaxşıdır.

Guşeyi-çeşmin mənimlə gah vardır, gah yox,
Ey gözüm, təb`ində xəlqin istiqamət yaxşıdır.

Gərçi eyni-müddəadır hər nə gəlsə yardan,
Sən məhəbbət canibin tut kim, məhəbbət yaxşıdır.

Ey deyən kim, yaxşıdır etmək nisari-can ana,
Yetsə növbət, düşsə fürsət, versə rüsxət yaxşıdır.

Hər nə saqi iltifat eylər mənə, nuş eylərəm,
Sağəri-mey yaxşıdır, səngi-məlamət yaxşıdır.

Gərçi saqi lütf edib qoymaz ayağın başimə,
Daməni-himmətdən əl çəkməm ki, himmət yaxşıdır.

Bilmişəm kim, can nisar etmək ana mümkün degil,
Niyyətim əmma budur, çün yaxşı niyyət yaxşıdır.

Gər məni sirab edib, gər öldürürsən təşnələb,
Hər nə eylərsən, sən ey dəryayi-rəhmət, yaxşıdır.

Cüstücuyi-vəsldən göz yummuşam, ta bilmişəm,
Sə`y zəhmət artırır, üz versə dövlət yaxşıdır.

Qabili-minnət degil, Qövsi, behişti-cavidan,
Vəsl üçün əmma iki aləmcə minnət yaxşıdır.

* * *

Sərv qəddin kim, qiyamət misrəin mövzun edər,
Şiri ahu eylərü ahuləri Məcnun edər.

Mən səməndərməşrəbəm, ey atəşinrüxsar, hey,
Yandıran əczayi-tərkibim məni məmnun edər.

Qeyr tək hər surəti-divar aparmaz könlümü,
Leyliyi-afaq oldur kim, məni Məcnun edər.

Can verərdim qiyməti-səhbayə, bilsəydim əgər
Kim, meyi-gülfam rəngi-zərdimi gülgun edər.

Ol ki, qismətdir, yetər möhnət nə vəch ilən ki, var,
Hər nə, kim sən eyləməzsən, gərdişi-gərdun edər.

Naleyi-məstanə mütribsiz kəbab eylər məni,
Sənsiz, ey saqi, meyi-gülrəng bağrım xun edər.

Gülbün eylər bülbülün ahin, Qövsi naləsin,
Təb`imi ol qaməti-mövzun mənim mövzun edər.

* * *

Eşqdir kim, səni Leyli, məni Məcnun edər,
Kiminin rəngini səhba, kiminin xun edər.

Bir nəzər görmək ilə arizini illərədin,
Gözlərim könlümi, könlüm məni məmnun edər.

Məni məhrum vüsalindən anın eyləmisən,
Raziyəm hər nə daxi gərdişi-gərdun eylər.

Bir avuc yer səri-kuyində sənin verməsə çərx,
İki dünyanı mənə gər verə, məğbun eylər.

Xuni-dil vermədi təğyir mənim surətimə,

Badə bidərdlərin rəngini gülgun eylər.

Eyləməz səbzələr üstündə meyi-gülgun həm,
Bu ki, ol çöhreyi-səbzü ləbi-meygun eylər.

Gətirir ərsəyə bir qaməti-mövzun, Qövsi,
Fələk ol gün ki, bir əhli-dili mövzun eylər.

* * *

Deyər zahid ki, zahirdir qiyamətdən əlamətlər,
Nə bilsin kim, bu qamətdən qiyam etmiş qiyamətlər.

Görünməz səbzeyi-xabində sərvi-naz olan yerdə,
Anın yanında siz pamalsız, ey sərvqamətlər.

Bu yoldan kim, vüsalın buldumü tapşırmadım canım,
Məni öldürməsən, hicr öldürər axır nədamətlər.

Olub suhani-ruhim qanlı bağrım dağ edən naseh,
Sənin tək özgəyə çox etmişəm mən həm nəsihətlər.

Anın tək bir nigari-paksirət bağlamaz surət,
Vəgərnə aləmi-zahirdə çoxdur yaxşı surətlər.

Nigahi-gərm anın rüxsarinə gər aftab etsə,
Sipənd eylər məni biixtiyar, odlara qeyrətlər.

Kərəm qıl, badeyi-gülgunə adət vermə, başinçün

Ki, daim qan içər saqi, gözü könlümdə həsrətlər.

Bu gün məndən üzün döndərdi canan, bilmənəm, Qövsi,
Ana, yarəb, nə söz ərz eyləmişlər bimürüvvətlər.

* * *

Mən istəmənəm dərdimi canana desinlər,
Əhvalımı ol zülfi-pərişanə desinlər.

Ol Leyliyə qurban oluram mən təhi-dildən,
Qoy bir neçə bitəh mənə divanə desinlər.

Pərvanə yaxar var-yoxun hər oda yetsə,
Razi degiləm kim, mənə pərvanə desinlər.

Onlar ki, deyirlər bu nə fəryadü fəğandır,
Bari bu sözü ol güli-xəndanə desinlər.

Dillər tökərəm bülbülü pərvanəyə, Qövsi,
Ta bir gün olar, halımı canana desinlər.

* * *

Hərçənd sərgiran ola dildar yeg bilir,
Mən bilmənəm nə olduğunu, yar yeg bilir.

Min yol yapıb yıxarsa məni ixtiyarı var,
Viranə macərasını memar yeg bilir.

Min daşə çalsa şişəni, çıxmaz sədası kim,
Dildarlıq yolun özü dildar yeg bilir.

Gər sərbüləndi-deyr edə, gər paymali-xəlq,
Mən bilmənəm, mənə nə gərək, yar yeg bilir.

Hər kimsə anlamaz bu sözün intəhasını,
Dilbilməzəm, mənim dilimi yar yeg bilir.

Pərvanənin hekayətini şəm`dən soruş,
Bülbül fəsanəsin güli-bixar yeg bilir.

Ey söyləyən ki, nalə nə yüzdən, fəğan neçün,
Dildən sorun bunu, dili-bimar yeg bilir.

Mən gərçi yetmənəm dili-bitab sirrinə,
Şükr eylərəm ki, vaqifi-əsrar yeg bilir.

Hərçənd ixtiyar mənə verməmiş qəza,
Qəm çəkməkəm ki, Əhmədi-Muxtar yeg bilir.

Könlündə hər murad ki, şayəstədir sənə,
Qövsi, cəhab Heydəri-Kərrar yeg bilir.

* * *

Piçü tabim yollar üstə həlqeyi-zəncir olur,
Xak həm gər olsa cismim, xaki-daməngir olur.

Sən tək, ey bülbül, nəsimi-nalə açmaz könlümü,
Laleyi-daği-məhəbbət qönçeyi-təsvir olur.

Qibləgahim, çox mənim rüsvalığım mən` etmə kim,
Hüsn aləmgir olanda, eşq aləmgir olur.

Xatirimdən əqli-dun əndişəsin məhv eylə kim,
Eşq edər tədbirini hər kim ki, bitədbir olur.

Dərdü daği-eşqdən qəm çəkmənəm, dərdim budur
Kim, mənim əhvalimi hər kim görür, dilgir olur.

Aşiqin hərçənd könlü yüz tərəfdəndir xərab,
Kə`beyi-məqsudi əmma iki olmaz, bir olur.

Nola dərdin tək tənimdən cani-məxzun çıxmasa
Kim, məhəbbət mülkinin torpağı daməngir olur.

Sözlərindən mən kimi xunabi-dərdü dağ axar,
Sinəsində hər kimin, Qövsi, nəfəs şəmşir olur.

* * *

Əgərçi ol güli-rəna iki dünya ilən başlar,
Məni-yekrəng ilə min rəng istiğna ilən başlar.

Edər qan daş bağırlı bütlərin könlini naz ilə
Bu saqi, bilmənəm, yarəb, neçə mina ilən başlar.

Müsəlmanlar ana zalim demiş, vallahi-billahi,

Dolanım başinə, hərçənd istiğna ilən başlar.

Ayin müşkil degil, gər başlar isə xəlq ilə vaiz,
Əgər doğru deyər, bir məsti-bipərva ilən başlar.

Həsəddən bir-birilə qaynamaz qanlar necə, yarəb,
Anın bəzmində hər dəm gər olur, səhba ilən başlar.

Vüsalından xəyalə qane olmuş mərdümi-çeşmim,
Bu şəbnəmzadə gər gün görməz isə ay ilən başlar.

Sanıram kim, mənim hali-pərişanım deyər ol kim,
Sözini ah ilən axır qılır, eyvay ilən başlar.

Yeri var gər əgilmiş qaşların tək növki-müjganın
Ki, müddətlərdir ol navək bu güclü yay ilən başlar.

Müsəlmanlar, mənimlə başlamaz ol namüsəlman kim,
Firəng ilə kəlisayə varıb tərsa ilən başlar.

Dönər pərvanə hər məhfildə yüz şəm`ə mənim könlüm,
Çirağı olmayan viranələrdə ay ilən başlar.

Əgərçi güc gəlir çərxin cəfası könlümə, əmma,
Düşəndə başimə bir qətrə yüz dərya ilən başlar.

Libasi-ariyətdən ar edər üşşaq, məhvəm kim,
Necə Məcnuni-üryan daməni-səhra ilən başlar.

Əbəs pərvanəyə aşiq demin kim, ol həvəspişə,

Nə bir gün ah ilən qaynar, nə bir dəm vay ilən başlar.

Xəmidə qamətin bihudə ol rənayə ərz etməz,
Haçan öylə igit, Qövsi, bu sınmış yay ilən başlar.

* * *

Əzbəski göz ol atəşi-rüxsar dağıdır,
Xurşid gözüm işığı, çeşmim çırağıdır.

Ol xalü xətli səfheyi-yüzdür mənim gözüm
Kim, qarəsi qərasi anın, ağı ağdır.

Zinhar anın mənə sitəmin, dustlər, demin,
Qurban ilim, günüm ana, hərçənd yağıdır.

Vəsfi-güli-üzaridir ol sərvqamətin,
Hər misrəi kim, məni evinin çırağıdır.

Mən` etmə naləden məni kim, var əsərləri,
Kəsmə nihalımı ki, ərənlər yatağıdır.

Ol məhv bu çəməndə qılır seyr kim, anın
Şəbnəm gözüvü qönçə dili, gül qulağıdır.

Məclis savulduvü uyub əğyar yatdılar,
Ey şəm`i-nalə, gər əsərin var, çağıdır.

Naləm çəməndə sanma həvəsdən ki, lalənin,
Peyvəstə ibrət əhlinə mənzur dağıdır.

Könlüm boyandı qanlara, Qövsi, nəzarədən,
Ondan bu xuni-dil gözə qonşu çanağıdır.

* * *

Dilim fəğan iləvü didə qan ilən doludur,
Könül səhifəsi şərhü bəyan ilən doludur.

Haray kim, nə dilim var, nə bir dil anlayanım,
Əgərçi ney kimi cismim fəğan ilən doludur.

Vurubdur ağzına min qifli-ahənin qeyrət,
Hənuz səqfi-fələk, ələman ilən doludur.

Əgərçi könlümə zahirdə dəymək asandır,
Bu çöl gəmingəhi şiri-jəyan ilən doludur.

Sınıq səbudə su tutmaz qərar, mey durmaz,
Şikəstə könlümə məhvəm ki, qan ilən doludur.

Xümar ilə məni öldürdü saqiyi-birəhm,
Səbuyi-badeyi-gülrəng can ilən doludur.

Bu bir piyalədə, yarəb, nə sehr edib saqi
Ki, üstü badə ilən, altı qan ilən doludur.

Sən öz yəmanlarını yaxşı et, nə hasil kim,
Zəmanə yaxşı ilən, ya yəman ilən doludur.

Bəsirət əhli dəlil istəməz ki, kövnü məkan,
Nişan ilən doludur, binişan ilən doludur.

Yuvada qönçələnir əndəlib bəs ki, çəmən,
Nəvayi-Qövsiyi-atəşzəban ilən doludur.

* * *

Qübar badi-payi-yar üçün kim, tutiyamızdır,
Bu meydanda bizim göz yaşı ilə kəhrəbamızdır.

Sirişki-alımız gülgunumuzdur qət`i-mənzildə,
Nəsimi-ahımız peyğam üçün badi-səbamızdır.

Fəğan kim, qılmışuz bəd nam əhli-tərkü təcridi,
Rəgi-ə`za riyazət guşəsində buriyamızdır.

Bəlayi-qeyddən bülbül kimi yox naləmiz, ey gül,
Bizim çaki-qəfəs peyvəstə mehrabi-duamızdır.

Demin ol xəstənisbət bülbülün yanında gül nəqsin,
Demək olmaz, məbada incinə, çün aşinamızdır.

Bulurdun, bülhəvəstək vəslini, gülçin gər olsaydın,
Bizi məhrum edən andan dili-bimüddəamızdır.

Əgər tövfiq olur bir gün, bilirlər mərdümi-aləm
Ki, hər kim hacətin bizdən dilər, hacət rəvamızdır.

Bədəndə biqəş olmaz can, əgər yüz min güzar etsən,

Bu cismi-natəvan toprağ olanda kimiyamızdır.

Nə xoş bayramdır ol günlər ki, meydani-şəhadətdə,
Qara toz sürmeyi-nazü qızıl qanlar hənamızdır.

Qələmdir nizeyi-gülgunimiz meydan günü, Qövsi,
Əgər söz küçəsinin təngnasında əsamızdır.

* * *

Ləli-nabın bilmənəm, ruhi-rəvandır, ya nədir,
Səvri-qəddin məddi-ömri-cavidandır, ya nədir.

Bilmənəm, ey səbzi-təhgülgun, mənə mənzər olan
Qaşu gözdür, ya ləbi-şəkkərfişandır, ya nədir.

Xəlq deyərlər var dəhan ilə miyanın, söylə kim,
Əsli vardır, doğru sözdür, ya yalandır, ya nədir.

Piçu tabə bir nihani nüktə salmış aləmi,
Hiç kim bilməz ki, ol miyi-miyandır, ya nədir.

Bağrımı bir qan edən vardır, degil məlum kim,
Sən özünsən, ya sözündür, ya dəhandır, ya nədir.

Var bir bidad edən üşşaqə, əmma bilmənəm,
Bəxtdir, ya çərx, ya dövri-zəmandır, ya nədir.

Mur tək hərçənd öldürmək məni asan ola,
Axır, ey bidadgər, ol daxi qandır, ya nədir.

Keçdi ömrüm bu çəməndə, açmadım göz, ta bilim
Kim, bahar əyyamı, ya fəsli-xəzandır, ya nədir.

Yaxşılar ilə yaman başlarsan, ey nazafərin,
Hiç deməzsən kim, bu yaxşıdır, yəmandır, ya nədir.

Söylə, Qövsi, kim, nə verdin, alə bilməzsən ana,
Səndən ol bibak alan bir nəqdi-candır, ya nədir.

* * *

Qanımı içmək dilər saqi, gözündən bəllidir,
Yandırır bir gün məni axır, üzündən bəllidir.

Suzi-eşqim dudi-ahimdən qiyas etmək gərək,
Pəhləvanlar cür`əti meydan tozundan bəllidir.

Danə üçün tikmə göz bu sərnigun qərbalə kim,
Təngi-çeşm olmağı çərxin yulduzundan bəllidir.

Dil bilən yanında özgə dərdi var pərvanənin,
Gərçi bülbül eşqinin suzi sözündən bəllidir.

Xalü xətt bidadi hüsnündən hüveydadır sənin,
Zülmü cövri ləşkərin şahın özündən bəllidir.

Aşiqü məşuq bir, Leyli iki məhmildədir
Kuhkən əndişəsi Şirin sözündən bəllidir.

Mənmiyəm yalquz ki, rəngi-zərdimi pünhan edim,
Ey güli-rəna, bu bir mə`ni yüzündən bəllidir.

Olmadın tarik əncüm zahir olmaz çərxdə,
Qarədir aşiq günü, dağ ulduzundan bəllidir.

Şahidi-hali-dili-üşşaqə rüxsarın yetər
Kim, kəbabın xamü naxami közündən bəllidir.

Nüktə tutmaq, bülbülə, Qövsi, nə lazımdır sənə,
Hər kimin mə`nidə miqdarı sözündən bəllidir.

* * *

Əhli-həvəs anın gözü qaşü yüzün sevər,
Aşiq həm anları sevər, əmma özün sevər.

Mehrabi-taəti bir olur eşq əhlinin,
Məşuq aşiqini sevərsə, yüzin sevər.

Gözdən məni, gözüm işığı, çox da salma ki,
Könlüm səni sevər, necə kim, öz gözün sevər.

Hər xam lalə tək nə bilir dağ qədrini,
Mən tək sitarəsuxtə öz yulduzun sevər.

Rəşk atəşi qiyamətədin yandırar məni,
Bilsəm ki, munca yari-sitəmkar özün sevər.

Məlumdur ki, kuyinə heç düşməmiş yolu,

Məcnuni-hərzəgərd ki, yazi düzün sevər.

Göz yaşimi mənim nola istərsə gözlərin,
Məşhurdur ki, məst kəbabın duzun sevər.

Eşqin yolunda mən sevirəm dudi-ahimi,
Öylə ki, mərdi-mərəkə meydan tozun sevər.

Sənsən anın dilində, gözündə, yerindədir,
Qövsi, sənin sözün kimi gər öz sözün sevər.

* * *

Hər guşədə min aşiqi-xunincigərin var,
Ey qibleyi-ümmid, kiminlə nəzərin var.

Öldürsə məni dərd ki, dərdim daxi yoxdur,
Bilsəm ki, mənim dərdi-dilimdən xəbərin var.

Yarəb, düşəmi yadına, ey şəm`i-təcəlla
Kim, mən kimi pərvaneyi-bibalü pərin var.

Yan mən kimi ta yandırasan aləmi, ey ney
Kim, nalənin olmaz əsəri, ta əsərin var.

Hər kim ki, bu rüxsar ilə bir çin səni görsə,
Min yol mənə söylər ki, gözün var, nəzərin var.

Pərvanə kimi şəm`ləri başinə yığdın,
Ey naleyi-xunin, nə qiyamət əsərin var.

Ol bəzmdə, Qövsi, min ölürsən, dirilirsən,
Sən şəm`i-bəlasən, sənin özgə cigərin var.

* * *

Göz bəyazi rəngi-alından boyanmaq çağıdır,
Şəm tək hər kiprigim bəzmində yanmaq çağıdır.

Ey ki, şahiddir mənim rəngim, sənin ruyin, vəli,
Könlimi aldın əlimdən, imdi danmaq çağıdır.

Badeyi-gülgun içib gəl başimə, ey şəm kim,
Xəstəni bir dəsteyi-gül birlə anmaq çağıdır.

Dürdi-mey tək ta zəmingir olmamışsan, ey könül,
Dur ki, saqi başına dönmək, dolanmaq çağıdır.

Aç gözün, ey bəxt, gör çaki-giribanın anın,
Sübhdür, qafil, nə yatmışsan, oyanmaq çağıdır.

Şəmlər çox yanır, əmma böylə od düşməz ələ,
Gəl, yavuz fürsətdir, ey pərvanə, yanmaq çağıdır.

Qövsiyə bir ömri-cavidan ətək çəkmək yetər,
İmdi insaf etmək, əl çəkmək, usanmaq çağıdır.

* * *

Əgər göz yumsa vüs`ətdən könül damani-səhradır,
Özündən əl götürsə, qətreyi-sərgəştə dəryadır.

Ləbin zövqi, qədin yadilə seyri-gülşən etməkdə,
Mənə hər qönçə bir peymanədir, hər sərv minadır.

Neçün kuyində min vəsl istərəm, hicran olur ruzi
Ki, derlər cənnət içrə hər nə istərsən, mühəyyadır.

Meyü sağər nə lazımdır ki, saqi abü tabindən
Gözü könlüm mənim mina kimi ləbrizi–səhbadır.

Nə hasil bağrımın qan olduğun eldən yaşurmaqdan,
Mənim halim anın rüxsari-alindən hüveydadır.

Eşitməz sərgüzəştin aşiqin ol Leyliyi-aləm,
Sanur guya bu həm əfsaneyi-Məcnuni-şeydadır.

Nihali-dudi-ahim səbzeyi-pamaldır, Qövsi,
Riyazi-hüsndə ol sərvqamət bəs ki, rə`nadır.

* * *

Rüxsarın abü tabını heyran olan bilir,
Peyvəstə gənc qədrini viran olan bilir.

Mövci-nəsimi-cənnəti-didar cövhərin,
Düzəxfiruzi-atəşi-hicran olan bilir.

Hər kimsə ləzzətin nə bilir acı sözlərin,

Ol badə nəş`əsin cigəri qan olan bilir.

Bu qətrə piçü tabini dəryayi-eşqdə,
Girdabi-çarmöceyi-tufan olan bilir.

Mən tək həvayi-Kə`beyi-kuyin səfasını,
Qurban olum sənə, sənə qurban olan bilir.

Dərviş qədrini nə bilir hər xəsisi-dun
Kim mur rütbəsini Süleyman olan bilir.

Qəddim kəmani-həlqeyi-əbru tək olduğun
Qövsi, şikari-navəki-müjgan olan bilir.

* * *

Çərxi-fələk dönər, dili-bitab ta dönər,
Ol bir avuc sudan bu doquz asiya dönər.

Eşqi-şikəstə qədrini hüsni-rəsa bilir,
Bu müşti-üstüxan başına ol hüma dönər.

Hər qönçəsi mənim gözümə bir tikan olur,
Bir gülşənin ki, dövrinə badi-səba dönər.

Bir gündəyəm bəlayi-şəbi-tari-hicrdən
Kim, öz-özinə gəldigi yoldan bəla dönər.

Dönsün öləndə Kə`beyi-məqsuddən yüzi,

Hər kim ki, səndən, ey büti-deyraşina, dönər.

Zinharə gəldigildən olur tünd navəkin,
Sözdür ki, əczdən dəmi-tiği-qəza dönər.

Qövsi, cəfayə sinə sipər qıl, fərağət et,
Kim, dönməsin bəlayi-qəzadan bəla dönər.

* * *

Lə`li-nabin özgədir, çahi-zənəxdan özgədir
Kim, nəməkzar özgə babətdir, nəməkdan özgədir.

Gərçi bülbül hüsni-rəngindir, gülüstan özgədir,
Abü rəngi-şö`leyi-rüxsari-canan özgədir.

Paymal eylər kəməndi-zülf öz seydin, vəli
Dəstbürdi-navəki-xunxari-müjgar özgədir.

Bağlaram zünpar, əmma mərd əlindən bağlaram,
Özgədir dinim mənim, ayini-Sən`an özgədir.

Naxuni-şəhbaz əgər seydin dələr bağrın, vəli,
Qüvvəti-sərpənceyi-girayi-müjgan özgədir.

Öz-özin çoxlar bilir dana, vəli dana bilir:
Özgədir namərdi-lafü mərdi-meydan özgədir.

Qövsini bənzətmək olmaz bağban bülbüllərə,
Özgədir şaxi-gül, ol sərvi-xüraman özgədir.

* * *

Bu yetməzmi ki, seylabi-bəla başimdən aşıbdır
Ki, mövci-əşk həm zənciri-ahəntək dolaşıbdır.

Bu rəngilə məhi-Kən`anə pirahən yaraşmazdı
Kim, ol sərvi-rəvanə pərdeyi-çeşmim yaraşıbdır.

Dağıldı tarü pudi cismimin dil intizarından,
Nədir tədbir kim, kəşti sınıbdır, bəhr daşıbdır.

Anın tək kim şəbi-tarik artır dərdi-bimarın,
Sənin zülfi-pərişanın görüb aşiq, bulaşıbdır.

Nola başımdan aşsa cuşi-əşkim, şö`leyi-ahim
Ki, hüsnün günbəgün əfzun olubdur, həddən aşıbdır.

Nə babət kim, olur gün pərtövündən dideyi-şəbnəm,
Gözüm ol növ rüxsarın görən saət qamaşıbdır.

Yüz ildən sonra öz adını Məcnundan sual eylər,
Bu rüxsar ilə saqi hər kimə bir yol sataşıbdır.

Kimin kim, eşq bağlar əl-ayağın, daxi açılmaz,
Bu müşkil mənini çox kimsədən Qövsi araşıbdır.

* * *

Əgər sitəm sənə hicrandan, ey həzar, yetər,
Təhəmmül et ki, bu gün-danla novbahar yetər.

Mənim hərayimə kim, binəvayəm, ey bülbül,
Bahar yetməz isə, yetməsin ki, yar yetər.

Əgərçi az ola sevdayi-eşq, çoxdur kim,
Bu şö`lədən iki dünyayə bir şərar yetər.

Mənim dilimdən anla, ey sipənd, təkrar et
Ki, hicr odu mənə, ey atəşinüzar, yetər.

Əgər murad məni şəm tək əritmək isə,
Gözüm çirağı, mənə şami-intizar yetər.

Nola gər eyləməsə bərq iltifat mənə
Ki, çərx xirməninə ahi-şö`ləbar yetər.

Nigah qalmadı çeşmi-ümidvarimdə,
Boyun bəlasın alım, gəl ki, intizar yetər.

Sən, ey fələk, sitəm etmə, əbəs cəfa çəkmə
Ki, Qövsiyə dili-kəmzərfi-biqərar yetər.

* * *

Parə-parə cigərim sineyi-suzanda yanar,
Qalanı şəm kimi dideyi-giryanda yanar.

Bir zəman olmaz imiş aşiq olan fariğbal,

Yanmayan vəsl oduna atəşi-hicranda yanar.

Bənzəməz heç oda hicran odu kim, pərvanə,
Yanar ol növ ki, günlər, gecələr handa yanar.

Su ilə dəf olur ol od ki, yanar cism andan,
Neyləsin göz yaşı ol şöləyə kim, canda yanar.

Bir xiyaban kimi kim, xəlq çırağan eylər,
Cigərim parələri hər səfi-müjganda yanar.

Necə bir yanə çıxım eşq diyarından kim,
Qədəm, əvvəl qədəm ol odlu biyabanda yanar.

Dərddən çün xəbərim var, yanaram mən, Qövsi,
Mən kimi aşiqi-dilsuxtə hər yanda yanar.

* * *

Mən özüm bilmənəm əhvalımı, dildar bilir,
Bu sözün mə`nisini, mən bilirəm, yar bilir.

Dilrübalıqda sənə hacəti-təlim degil,
Sən özün bilməyəni qəmzeyi-xunxar bilir.

Necə bülbül kimi fəryadü fəğan eyləməsin,
Kim ki, keyfiyyəti-nəzzareyi-gülzar bilir.

Leyli oldur ki, mənim könlümü Məcnun eylər,
Xaçan ol mə`nini hər surəti-divar bilir.

Görsə gər beldəki zünnarımı zahid, nə deyər
Ki, mənim əldəki təsbihimi zünnar bilir.

Aləmə düşdü, təzəlzül dili-bitabimdən,
Mənim əhvali-xərabim dərü divar bilir.

Vadiyi-eşqdə ol kimsə dərir gül ki, anın
Hər xəsü xarını bir novgüli-bixar bilir.

Ey gözüm, mən nə tutum dərdimi pünhan səndən
Ki, xəyalın gözü könlümdə nə kim var,bilir.

Yarə hərçənd gözüm söylədim, əmma, Qövsi,
Öz gözün aşiq olan daxili-əğyar bilir.

* * *

Çərxi-gərdun, dövri-dövran dövlətü din yaridir,
Hər kimin ol saqidi-nazafərin qəmxaridir.

Mən sənin bimarın, ey aləm bəlagərdan sana,
Nərgisi-məstin sənin, yarəb, kimin bimaridir.

Can verib ol lə`ldən söz çəkmək istər xatirim
Bir nəfəs, ey dil, xəbərdar ol ki, can bazaridir.

Var ümidim qoymaya toprağ ilə yeksan məni,
Ol ki, məhzi-lütfdən alimlərin memaridir.

Ruzigarim qarə ol xurşiddəndir kim, mənim
Şəm`i-bəzmim, nuri-çeşmim sayeyi-divaridir.

Kinəcu, zinhar, özüntək sanma, ey zahid, məni
Həq bilir könlüm mənim tarı evindən aridir.

Sinəmi əzbəs dili-bitab məhcur eylədi,
Sandım ol əbrukəmanın navəki-xunxaridir.

Kakilindir, yarəb, ol suzan, könüllər məcməi,
Ya mənim tək bir əsirin ahi-atəşbaridir.

Bir fələkdir könlümü mehrindir anda aftab,
Odlu dağım, qanlı əşkim, sabitü səyyaridir.

Gərçi Qövsi xuni-dildən öz sözün rəngin edər,
Söz bilən aşiq bilir göftar anın göftaridir.

* * *

Daşə salmaq rəxnələr ol növki-müjgandan gəlir,
Yüz qılıncdan gəlməz onlar kim, bu peykandan gəlir.

Ver xəbər könlümdən, ey mütrib, nişanın var isə
Kim, gəlir bir nalə, əmma bilmənəm handan gəlir.

Sala bilməzsən təzəlzül aləmə, ey sərv, sən,
Gər bu işlər gəlsə, ol sərvi-xüramandan gəlir.

Yandırır ol şö`leyi-rüxsar hicrandan betər,

Dərddən gəlməz mənə onlar ki, dərmandan gəlir.

Aşiqin ömrü uzundur qeyrdən kim, dəhrdə
Bir dəmi yüz min il etmək şami-hicrandan gəlir.

Sən meyi-gülrəng tut, saqi, dolanım başına,
Hər qədər kim, cami-purxun dövri-dövrandan gəlir.

Xar tutma gövhəri-əşkim, götür toprağdan
Kim, onun hər qətrəsi dəryayi-ümmandan gəlir.

Gərçi könlüm sinədə bir qətrə qan artıq degil,
Müttəsil seylablər, Qövsi, bu virandan gəlir.

* * *

Zahid öz təsbihini, küfr əhli zünnarın sevər,
Mən büti-Çin istərəm, hər kimsə öz yarın sevər.

Hiç bilməm kim, nə miqdar istər öz can parəsin,
Dustlər, könlüm mənim əzbəs ki, dildarın sevər.

Guşeyi-çeşmi-tərəhhüm aldı canım, neyləyim,
Öldürür hərçənd səyyad, öz giriftarın sevər.

Şəm istər müttəsil bitab öz pərvanəsin,
Qönçeyi-gül əndəlibin naleyi-zarın sevər.

Pak gövhərlər bilirlər çeşmi-bina qədrini,

Yusifi-pakizədamən öz xiridarın sevər.

Mən` edən naseh məni fəryaddən bilməzmi kim,
Aşiqin məşuqi-bizinhar zinharın sevər.

Saldı Qövsi aləmə şirin söz ilə şurlər,
Çünki ol şirinləbin aləmcə gövtarın sevər.

* * *

Çün xəyalın handa kim var, aşiqin yanıncadır,
Ayü gün rəyincəvü əflak fəryadıncadır.

Xar baxma bülbülə, ey bağban, zinhar kim,
Toprağı dərd əhlinin bidərdlər qanıncadır.

Səhldir naləm, əgər əflak salmış rəxnələr,
Ol səməndin sanma kim, meydanı cövlanıncadır.

Əşki-gülgun aşiqin rövşənraq eylər könlüni
Kim, çırağın pərtövi öz çeşmi-giryanıncadır.

Bülbüləm, əmma məni bənzətmək olmaz, bülbülə
Kim, mənim naləm anın sərvi-xüramanıncadır.

Dustlər məqsudi mənzurü muradımdır mənim,
Asiman kamımcadır, ta yar fəryadımcadır.

Cürmü təqsirim mənim hərçənd dəryalərcə var,
Hansı üsyan ol kərimin məddi-ehsanıncadır.

Ol bəladır kim, mənim mərhəm bitirməz yarəmi,
Yoxsa kim, hər natəvanın dərdi dərmanıncadır.

Yüz çevirməz dərddən Qövsi mənim könlüm kimi,
Hər kimin kim, Nuh tək kəştisi tufanıncadır.

* * *

Şirin təbəssümün sözə ruhi-rəvan verir,
Hər kimsədən ki, can ala, bir özgə can verir.

Mümkün degil xəyal ilə bulmaq dəhanını,
Yüz şükr kim, sözün gəlib ondan nişan verir.

Hacət degil özün edəsən iltifat ana
Kim ol xürami-sərv cəvabın rəvan verir.

Örtər gözü nəzareyi-xurşid, yoxsa kim,
Ey qafil, öz nişanını ol binişan verir.

Zinhar, çapma atını bu sənglaxdə,
Hərçənd çərx hər kimə beş gün inan verir.

Başim fədayi-cövhəri-şəmşiri-yar kim,
Abi-rəvan gər istəsəm, ondan rəvan verir.

Mə`nidə hiç badeyi-gülgunə bənzəməz,
Saqi əgərçi aləmi-surətdə qan verir.

Saqi, mənə yetər könül, əndişə çəkmə kim,
Ol nimqətrə xun mənə aləmcə qan verir.

Qövsi, itir özün, demə kim, böylə mülkdə,
Bikəsləri kim axtarırü kim nişan verir.

* * *

Hərçənd xəlq qanını çeşmin əyan içər,
Əmma nigahi-guşeyi-çeşmi nihan içər.

Sanmın gülabi-qönçeyi-gül bağban içər
Kim, dəhr gülşənində gülü lalə qan içər.

Mütrib, fəğan ki, saqiyi-nazafərin mənim
Qan eylədikcə bağrımı, dövri-zəman içər.

Məxmur gözlərin içər ol rəng qanımı
Kim ömri-Xızr təşnəsi abi-rəvan içər.

Ləbriz qıldı lalə kimi dağ ayağımı,
Ol badədən ki, şaxi-güli-ərğəvan içər.

Məlumdur əlindən anın badə nəş`əsi,
Bir saqinin ki, nərgisi-məxmuri qan içər.

Yarəb, nə yüzdən ola ki, məxmur gözlərin
Sağər səbükinan alırü sərgiran içər.

Ol gülrüxün, görün, nə qədər abruyi var

Kim, su nəzarəsindən anın gülsitan içər.

Hər qətrəsi bir əxgər olur şəm`i-bəzm tək,
Abi-rəvan ki, Qövsiyi-atəşzəban içər.

* * *

Tufani–seyli-əşk göz açıb yumuncadır,
Meraci-çarmövceyi-qəm bir tumuncadır.

Eymən boyun bəlasın alım, gəl ki, xubluq
Bir camədir ki, sərvi-rəvanın boyuncadır.

Hərçənd kim, qiyami-qiyamət irağ isə,
Əmma ayağə saqiyi-dövran duruncadır.

Can təngnayi-cismdə, ol nazənin təbib,
Əhvalımı bir özgə dil ilən soruncadır.

Meydani-nazi-hüsn könüllər fəzasıdır
Kim, cilvəgahi-ahuyi-rəna çölüncədir.

Pərvanə yanıb etdi mənə bu vəsiyyəti
Kim, intizar vədeyi-didar oluncadır.

Müşkül degil əhateyi-kövnü məkan mənə,
Əşki-rəvan inanımı əldən qoyuncadır.

Könlüm mənim ki, bir sonanın cilvəgahidir,
Çeşmim bilir ki, bəhri-mühitin göləndədir.

Qövsi, əgər bu məstlığın olsa axırı,
Peymaneyi-həyati-sipehrin doluncadır.

* * *

Xurşidü mah cilvəsi bir göz görüncədir,
Dövri-sipehr bir-iki sağər doluncadır.

Nərradi-çərx evi bizə baziçəxanədir,
Həngameyi-nişatı anın bir oyuncadır.

Çün mizban kərim ola, bibərklıq-nə qəm,
Həmmal ol ki, tuşeyi-rahi yoluncadır.

Yetməz xəmidə qəddimə, əşki-rəvanimə
Gər seyli-novbahar sipehrin belincədir.

Divanə ol ki, eyd ola hər qarə gün sənə,
Keç əqldən ki, matəmi əqlin toyuncadır.

Gər dövlət arta, payeyi-möhnət bülənd olur,
Qövsi, libasi hər kişinin öz boyuncadır.

* * *

Tutar ahəng mütrib, çün dili-püriztirab oynar,
Məgər bilməzmi kim, dəfsiz bu sərməsti-xərab oynar.

Uşaqlar tək sənin qapında çərxi-pir illərdir
Bu ümmid ilə kim, bir gün olur bir fəthi-bab, oynar.

Necə ətfal ilə divanə həmrəqs olmasın, yarəb
Ki, zövqündən nəsimi-novbaharın şeyxü şab oynar.

Məni rəşk atəşi mey tək edər bir şölə od, saqi,
Sipəndi-şux çün məstanə rəqs eylər, kəbab oynar.

Könül, sən çərxi-bizinhardən zinharə tez gəldin
Ki, hər bir danə başində yüz il bu asiyab oynar.

Özünçün sayəban fikr eylə, çıx gərdunun altından
Ki, bir gün öz yerindən axır ol zərrintənab oynar.

Nola gər biqərar olsam sipehrin piçü tabından
Ki, başımda fəlaxün tək bu ağır asiyab oynar.

Bu ol söz pərtövidir kim, Füzuli söyləmiş, Qövsi:
"Neçün kim, mövclənmiş sudə əksi-aftab oynar".

* * *

Qədin ki, sərvi-xuraman ilən bərabərdir,
Boyun bəlasın alım, can ilən bərabərdir.

Fəzayi-gülşəni-kuyin həvasi başimdə,
Həvayi-rövzeyi-rizvan ilən bərabərdir.

İçərmi su gözüm, ey novnihal, gülşəndən

Ki, sənsiz abi-bəqa qan ilən bərabərdir.

Təbib, əgər çıxa can, çıxmaz üstüxanimdən,
Bu yerli dərd ki, dərman ilən bərabərdir.

Gözüm, könül dedigin gərçi qətrədir, əmma
Bəsirət əhlinə ümman ilən bərabərdir.

Sipehrə tab verən dudi-ahim, ey novxət,
Kəməndi-zülfi-pərişan ilən bərabərdir.

Həsud qanımı içmək dilər, nə bilsin kim,
Bu ab atəşi-suzan ilən bərabərdir.

Məni-mühəqqəri seyd etdi bir şikarəfkən
Ki, xaki-rahi anın qan ilən bərabərdir.

Diyari-eşqdə olmaz böyük-kiçik, Qövsi,
Bu yerdə mur Süleyman ilən bərabərdir.

* * *

Bu nə gözdür ki, sənin var, nə bəla məddi-nəzərdir,
Bu nə dildir məni-bitabdə, yarəb, nə cigərdir.

Etibar eyləmək olmaz bu fəna mülkdə ömrə,
Himmət, ey ruhi-rəvan kim, səri-kuyinə səfərdir.

Türfə aşubdur, ey dustlər, Allahı sevərsiz,
Gəlir ol sərv, qiyamət günüdür, ya nə xəbərdir.

Ərəqi-şərmü həya çöhreyi-səbz üstə gözümdür,
Üqdi şəbnəm kimi hər qətrəsi bir danə göhərdir.

Ta nələr başimə gəlsin, səni, ey şəm, görəndə,
Görməməkdən yüzini könlüm evi zirü zəbərdir.

Nalə bir ləhzə nəfəs çəkməgə verməz ana fürsət,
Zahirən bülbüli-bitab bilir kim, nə xəbərdir.

Ey qoyan sudü ziyan üstünə sərmayeyi-ömri,
Zərərin nəfdir, əmma, sən deyən nəf zərərdir.

Məni hər bülbülə nisbət verən adəm nə bilir ki,
Ana mənzur nəvadır, mənə məqsud əsərdir.

Göz mənim camımə, Qövsi, nə tikibsən, nədən ötrü,
Meyi-gülrəng degil, saqi bilir, xuni-cigərdir.

* * *

Səbr ilə hansı dərdə təbibim dəva verir
Kim, dərd əlində hər sümügüm bir səda verir.

Dünyavü axirətdən edər bixəbər məni,
Hərgah bir xəbər mənə səndən səba verir.

Hərçənd kim, xəzan dağıdır aşiyanını,
Axır bahar bülbülə bərgü nəva verir.

Ey şaxi-ərğəvan, sən özün etmə iltifat
Kim, sərvü gül cəvabını badi-səba verir.

Ayineyi-muradımı gər zəngi-qəm tutar,
Əmma qübari-Kə`beyi-kuyin səfa verir.

Eşqi-qəyur süfreyi-ən`ami üstünə,
Şahü gəda, böyük-kiçigə bir səla verir.

Hər kim ayağı altına baxmaz qürurdan,
Gərduni-pir anın əlinə tez əsa verir.

Kəm tutma binəvaləri, Yusifdən et qiyas
Kim, ruzigar yaxşılərə az bəha verir.

Qövsi, gözüm ğübari-xətin eylər arizu,
Hərçənd nuri-didə alır, tutiya verir.

* * *

Mahi-Kən`anın gözü çahi-zənəxdanındadır,
Handa bir fərmanrəva var, tövqi-fərmanındadır.

Laf urarlar hüsndən hərçənd gülrüxsarlar,
Həq bilir, ol ayeyi-rəhmət sənin şanındadır.

Şuri-həşraşubi-dövran, fitneyi-axırzəman,
Lə`li-şirin, xali-mişkin, çeşmi-fəttanındadır.

Ol qədər kim, abru rüxsari-tabanında var,
Abü rəng, ey şaxi-gül, gülbərgi-xəndanındadır.

Yusifin tutmaz Züleyxa tək giribanın daxi,
Əlləri hər pakdamanın ki, damanındadır.

Yerdən eylər aqibət, çox sərvi, ey nazafərin,
Şiveyi-rəftar kim, sərvi-xüramanında var.

Guşeyi-beytul-həzən, Qövsi, gülüstandır sənə
Kim, xəyalından anın Yüsif giribanındadır.

* * *

Bizim hərçənd üşşaq arasında adımız yoxdur,
Nə gündür kim, qapında dadımız, bidadımız yoxdur.

Dəbistanında eşqin tifli-əbcədxandır Əflatun,
Sanırlar bixəbərlər pirimiz, ustadımız yoxdur.

Bizə öz sərgüzəşti-eşqi-biəncamımız bəsdir,
Səri-əfsaneyi-Məcnunumuz, Fərhadımız yoxdur.

Könül, seylabdən məmurlər çəksinlər əndişə,
Bihəmdüllah ki, biz viranəyiz, abadımız yoxdur.

Bu vadilərdə fariğballar təşviş çəksinlər
Ki, biz seyd olmuşuz, əndişeyi-səyyadımız yoxdur.

Dolanım başına, bəsdir bizə çeşmi-süxənsazın,

Fünuni-nəzmdə hərçənd bir ustadımız yoxdur.

Bu şirin sözlərin aşiq bilir keyfiyyətin, vaiz,
Sənin kim acıdır ağzın, sanırsan dadımız yoxdur.

Təbibi-eşqdən, Qövsi, qəmü dərdin nişan tutma
Ki, bizlər bir-birilə aşinayüz, yadımız yoxdur.

Bu ol şirin qəzəldir kim, demiş bir Sahiri-mahir:
"Könüldəndir şikayət, kimsədən fəryadımız yoxdur".

* * *

Bülbüli-şeyda gülün, pərvanə şəm`in dağıdır,
Binəva könlüm ki, bir dilbilməzin dustağıdır.

Bimürüvvətlər əlindən məndə taqət qalmadı,
Ey sipehri-bimürüvvət, bir mürüvvət çağıdır.

Dustsuz, düşmənsiz olmaz heç kim, fəryad kim,
Dust həm düşmən kimi derlər mənimlən yağıdır.

Gər firəng olsam, müsəlmanlar, məni mən` eyləmin,
Ey xoşa ol kim, firəngizadələr dustağıdır.

Sübhdür, ey gövkəbi-bəxtim, nə yatıbsan, oyan,
Mətləb almaq vaxtıdır, ərzi-təmənna çağıdır.

Girdbad olmaz bu vadilərdə kim, sərgəştələr
Sovururlar başə, Məcnunun fəna toprağıdır.

Guşeyi-xəlvət ki, hiç adəm ona yol bulmaya,
İstədim yoxdur, əgər var isə, cənnət bağıdır.

Saqiyi-nazafərinin qoymaz əldən damənin,
Dürdi-mey guya əli tutmazların torpağıdır.

Dözmədi bir tişəyə Fərhad, ey bidadgər,
Sineyi-Qövsi sanırsan Bisütunun dağıdır.

* * *

Əgərçi naləm ilən naləsin həzar unudubdur,
Fəğan ki, mürği-qəfəs tək məni bahar unudubdur.

Sitəm degilmi, təbibim, bu natəvanı unutmaq
Ki, səndən özgəni aləmdə hər nə var, unudubdur.

Giran degil qəmi-dərdü bəlayə düşdügüm, əmma
Bəla budur ki, məni yari-qəmküsar unudubdur.

Könül, məni kim edər yad məhfilində anın kim,
Özü-özün unudar hər kimi ki, yar udubdur.

Unutma bülbülü, ey bağban, gətir ələ könlün
Ki, yüz sənin kimi gülçini novbahar unudubdur.

Anın kimi məni-bimar, həm əsiri-xümarəm,
Nə vəchdən məni ol çeşmi-pürxümar unudubdur.

Qəmi-zəmanəni kim, nəqsi-ömr düşməni candır,
Unut ki, çoxları Qövsi, bu ruzigar unudubdur.

* * *

Könül gər ram ola, dövlət rəfiqü bəxt yarimdir
Ki, gənci-dərdü dağəm mən, bu viran ev həsarimdir.

Qəmim yoxdur sirişki-çeşmi-xunəfşan hücumundan,
Mənə neylər bu daşqun seyl kim, dərya kənarimdir.

Vücudum yandırır bir növ ahi-şö`ləbarəm kim,
Sanasan kim, bu həm odlarə yanmış ruzigarimdir.

Əgər yüz mehr göstərsə, əgər min tiği-kin çəksə,
Nə vəchilə ki, var ol mah, yarım qəmküsarimdir.

Sənin yadımla, ey gülçöhrə, bir aləm nişatım var,
Bu yüzdəndir ki, xəlvət bağimü üzlət bəhərimdir.

Həman öz nəqdini tarac edər çeşimi bu yüzdən kim,
Əgər dindir, əgər iman, sənindir hər nə varimdir.

Sipehri-nacəvanmərdin sitizindən nə qəm, Qövsi
Ki, lütfi-Şahi-Mərdan, Heydəri-səfdər həsarimdir.

* * *

Mənə mənzurdur hüsnündən, ey şirinzəban, gözlər,

Bəli, hər halda var məxmur olan, rətli-giran gözlər.

Dilər ol kakili-müşkini könlüm bəzmi-vəslində,
Əgər quş rövzeyi-rizvandadır kim, aşiyan gözlər.

Apardı əqlu huşim, qoymadı namü nişan məndən,
Bu gözlər bilmənəm, yarəb, nə ey əbrukəman gözlər.

Əgər yüz dərdü dağım var, həman yüz intizarım var
Ki, hərçənd olsa mehman əhli-himmət mühiman gözlər.

Ayağə düşməyən balanişin olmaz könüllərdə,
Həqiqətdə yaraşur sədr ana kim, asitan gözlər.

Ey örtən öz gözün dərvişlərdən övci-dövlətdə,
Xəbərdar ölginən kim, ol zəmini asiman gözlər.

Nola gər könlümü ol hüsni-baladəst gözlər kim,
Nə olsa, töhfəsin murin Süleymani-zəman gözlər.

Nə şirin sözlərin vapdır ki, çeşmi-şurdur, olsun,
Nə yaxşı gözlərin var kim, iraq olsun yəman gözlər.

Şəbi-hicranın əzbəs kim, gözüm yollarda qalmışdır,
Əgər könlümdə əglənsən, səni çeşmim həman gözlər.

Vüsal əyyamı mə`zurəm gözüm görməzsə rüxsarın
Ki, qalmışdır həman yollarda , ey sərvi-rəvan gözlər.

Bu gün-danla qübarım seyr edər bir özgə aləmdə

Əgər, Qövsi, kəmandarım bu aləmdən nişan gözlər.

* * *

Şaxi-gül, ey bağban, hərçənd gülgun camədir,
Bir qəbadır xublığ, əmma ki, ol əndamədir.

Küşteyi-gülgun kəfəndir əşkimin hər qətrəsi,
Ey qiyamətafərin, gəl kim, əcəb həngamədir.

Könlümü etmiş təsərrüf şahi-eşq, ondan mənə,
Əşk-ünvan, ləxt-ləxt olmuş cigərlər namədir.

Abü rəngin şərhini gülşəndə təhrir etməgə,
Qönçə bir tumardır, minqari-bülbül xamədir.

Ey müəllim, etmə çox təhvili-istedad kim,
Hər uşaq eşqin dəbistanında bir əllamədir.

Çün səvadi-daği-gülgunü bəyazi-çeşmdən
Bəllüdür, məzmun nə hacət, naməvü peyğamədir.

Hiç kafər bir təbibin olmasın bimarı kim,
Dərd təşxisi ana mövquf yüz e\`lamədir.

Ruzigarim qarədir bir namuşəxxəs mülkdə
Kim, füruği-mehrü məh məxsus sübhü şamədir.

Tez məni, Qövsi, xəbərdar et ki, canım tapşırım,
İmtiyazi-dərd ana mövquf, əgər e\`lamədir.

* * *

Sipəndi biqərarız biz, vəli fəryadımız yoxdur,
Əgər bidad ilə yüz yandırırlar, dadımız yoxdur.

Sən, ey çərxi-sitəmkər, qətlimizlə çəkmə zəhmət kim,
Şəhidi-tiği-eşqüz, hacəti-cəlladımız yoxdur.

Betərdir yüz qılıcdan süfleyi-dun himmət ehsanı,
Bihəmdüllah, fələkdən minnəti-imdadımız yoxdur.

Çəkər hər tifl bir dami-bəla Məcnun güzarinə,
Sanur ahuyi-rəna kim, bizim səyyadımız yoxdur.

Gəl, ey pərvanə, şərh et sərgüzəştin şəm yanında
Ki, bizlər bir-birilə aşinayüz, yadımız yoxdur.

Əgər var isə insafın təhəmmül umma bizdən kim,
Bizim, ey səxtbazu, pənceyi-fuladımız yoxdur.

Bu misra tərcümanımdır, budur virdi-zəbanım kim,
Bəla dildəndir, ol dildar əlindən dadımız yoxdur.

Bu beş gün kim, veribdirlər aman, sən nalə çək, Qövsi,
Gələr bir gün ki, bülbüllər sanurlar adımız yoxdur.

* * *

Demə bitab könül gövhəri-qəltanə dəgər
Ki, bu bir qətreyi-kəmhövsələ ümmanə dəgər.

Nola ol səxt kəmangər mənə meyl etməsə kim,
Məndə can yoxdur, anın hər oxu bir canə dəgər.

Görməyən Yusifimin hüsni-cəmalın nə bilir
Ki, mənim əxtəri-bəxtim məhi-Kən`anə dəgər.

Yeri, ey çarədə ehmal qılan qafil kim,
Məni bir dərd həlak etdi ki, dərmanə dəgər.

Bilməyib qədrimi, Qövsi, məni odlarə salır,
Nə bilir hüsn ki, yüz şəm`ə bu pərvanə dəgər.

* * *

Deyin Fərhadü Məcnun xabi-qəflətdən oyansunlar,
Əgər doğru deyirlər, dərdimə bir dəm dayansunlar.

Mənəm, ey çərxi-napakizəpərvər, safdır könlüm,
Nola seylabi-əşkim birlə dəryalər bulansunlar.

Anın ta kakilin gördüm, bu saman ilə bildim kim,
Pərişanlar gərək aləmdə sərgərdan dolansınlar.

Məni bu şə`mi-gülrüxsar yandırmış ki, qeyrətdən,
Gərək bülbüllərü pərvanələr odlarə yansunlar.

Ölürlər rəşkdən, gər bilsələr xuni-cigər qədrin,

Bunu bidərdlər məndən eşitsinlər, isansunlar.

Bu xublar kim, cəfavü cövr qılmaqdan usanmazlar,
İlahi aşiq et, ta özlərindən həm usansunlar.

Mürüvvət olmasaydı maneim, Qövsi, deyərdim kim,
İlahi, mən kimi əğyar həm odlarə yansunlar.

* * *

Fəğan ki, bilmənəm öz könlümün bəlası nədir,
Bu hal ilən nə bilim yar müddəası nədir.

Fəğan ki, fariğ olub əl çəkər əlacimdən,
Təbib bilsə ki, dərdim nədir, dəvası nədir.

Anın rizası mənim mətləbim, muradımdır,
Bəla budur ki, anın bilmənəm rizası nədir.

Eşitsə naləmi zahid həvayi-kuyində,
Bilir ki, rövzeyi-rizvan nədir, həvası nədir.

Məni xəyali-vüsalində görməyən nə bilir
Ki, şəm`i-bəzm ilə pərvanə macərası nədir.

Mən istərəm səni, ey mah, yoxsa dünyanın,
Sitarəsi nəvü mehri nəvü vəfası nədir.

Neçün müzayiqə qətlində Qövsinin, yarəb,
Anın bu zə`f ilə qanı nədir, bəhası nədir.

*   *   *

Fariğ olsam giryədən könlüm evi viran olur,
Bir nəfəs gər nalə ehmal etsə, bağrım qan olur.

Ülfətin, zinhar, məndən kəsginən, ey Xızr kim,
Abi-heyvan taleimdən atəşi-suzan olur.

Ah kim, gər dinməsəm dil nalə başlar sinədən,
Gər nəfəs çəksəm, qübari-xatiri-canan olur.

Açılırmı könlüm, ey sərvi-rəvan, gülzardən
Kim, behişti-cavidan sənsiz mənə zindan olur.

Bəs ki, ey ahuyi-kəmnəzzarə, kiradır gözün,
Öz nigahın həm əsiri-pənceyi-müjgan olur.

Ey mənim rüsvalığımdan inciyib ikrah edən,
Gün çıxar, aləm görər, aşiq haçan pünhan olur.

Xah üz döndərsən ondan, xah iqbal eyləsən,
Axır, ey əbrukəman, Qövsi sana qurban olur.

*   *   *

Məni-bitab əgər çəksəm nəfəs, bülbül fəğan başlar,
Əgər mən başlasam bir nalə, gül  həm ələman başlar.

Çəməndə sərv qalmaz dudi-ahim piçü tabindən,
Mənimlə gər bu təmkin ilə ol sərvi-rəvan başlar.

Yəman olmaz demək yaxşilərə, əmma budur dərdim,
Kim, ol bidadgər hərçənd yaxşidir, yəman başlar.

Keçər aşiqlərə gər dad, əgər bidad edər canan,
Zəmin eylər təhəmmül hər rəviş kim, asiman başlar.

Mənim həm vəslü hicrandan hesabım var, kitabım var,
Əgər ərbabi-dünya qisseyi-sudü ziyan başlar.

Əgər aləm mənimçün mayeyi-səbr olsa, bitabəm,
Bu dərd ilə könül gər sənsiz, ey arami-can, başlar.

Demin kakil sözün bu Qövsiyi-sövdai yanında
Ki, nagəh yengidən bir intəhasız dastan başlar.

* * *

Gözümdə lütf edib əglənməsən, gözüm yoxdur,
Bu bəs degilmi ki, xurşiddən gözüm yoxdur.

Zəkati-hüsnini, ey mah, məndən etmə dəriğ,
Bu gün ki, yeddi fələkdə bir ulduzum yoxdur.

Bu çeşmi-məstilə məndən məhəmmül istərsən,
Gözüm çırağı, mənim zahirən gözüm yoxdur.

Ayağın altına yüz qoymaq istərəm, əmma

Məgər sən yüz verəsən kim, mənim yüzüm yoxdur.

Məni həmin gözü könlüm cəhanda yandırdı,
Vəgərnə hiç cəhətdən odum, közüm yoxdur.

Həsudi-kəcnəzərin ağzı təlxu biməzədir,
Xəyal edər ki, mənim dadımü duzum yoxdur.

Sən eylə ərzi-süxən əndəlib tək, Qövsi,
Mənim ki, gülrüxüm anlar sözüm, sözüm yoxdur.

* * *

Aşiqi-bitab üçün arami-candır novbahar,
Xanimansız bülbülə darüləmandır novbahar.

Saqiyi-gülçöhrə zəhmət çəkməsin, gül verməsin,
Mən kimi məxmur üçün rətli-girandır novbahar.

Bülhəvəs bibəhrədir keyfiyyəti-didardən,
Laləzari-dağ əgər yoxdur, xəzandır novbahar.

Munca bərgü barına, ey bağban, fəxr etmə kim,
Tutmaq olmaz damənin, gənci-rəvandır novbahar.

Bir nihaləm kim, nə bərgim var, nə barım var mənim,
Sanma bica, gər mənimlə sərgirandır novbahar.

Saqiya, kimdir gülü gülzarə iqbal eyləyən

Kim, sənin dövründə binamü nişandır novbahar.

Səndən, ey novgül, mənim balü pərim pəjmürdədir,
Yoxsa kim, bülbüllərə ruhi-rəvandır novbahar.

Hər güli-sirab açarmı könlümü, ey əndəlib
Kim, mənə əzbəs ki dilgirəm, girandır novbahar.

Nəxli-ahim heç bu il sərsəbz olub bar vermədi,
Zahirən, Qövsi, əracifü yalandır novbahar.

* * *

Mənim canım ki, bir dərd anlayan canane layiqdir,
Fəğan kim, bəxt əlindən atəşi-hirmanə layiqdir.

Məni-bitabdən tutmaq kənar, ey şəm, bicadır
Dolanıb yanmağa, aləm bilir, pərvanə layiqdir.

Xətadır üstüxanımdan mənim qət`i-nəzər qılmaq,
Bu neylər yaxşı neylərdir, gözüm peykanə layiqdir.

Nəfəs çəkmək xətadır mərdümi-hüşyar yanında,
Nə hər məhfildə, ey ney, naleyi-məstanə layiqdir.

Mənə sənsiz hilali-eydini izhar edər gərdun,
Sanur guya ki, hər əbrukəman qurbanə layiqdir.

Nə qəm gər natəvanəm kim, məhəbbət karsazında,
Biri kim, baş ilə candan keçər, meydanə layiqdir.

Cünun səhrasının Məcnunları vardır, vəli, Qövsi,
Bu meydan bir sənin tək atəşin cövlanə layiqdir.

* * *

Bülbül kimi baharü xəzan bilmənəm nədir,
Məstəm, təfavüti-meyü qan bilmənəm nədir.

Saqi müdam mey yerinə qan verir mənə,
Bilmiş, məgər ki, yaxşı-yaman bilmənəm nədir.

Sən məstü laübaliyü mən xaniman xərab,
Namusü nəngü namü nişan bilmənəm nədir.

Billah mundan özgə ki, isari-yar ola,
Aləmdə hasili-dilü can bilmənəm nədir.

Bir nalə ilə fəsli-baharım keçir mənim,
Hər dəm bir özgə ahü fəğan bilmənəm nədir.

Hərçənd şəm tək yanaram sübhədin, vəli
Pərvanəyəm ki, ahü fəğan bilmənəm nədir.

Sındurməsinmi şişəmi gərduni-səngdil
Kim, səngsar edərsə, aman bilmənəm nədir.

Bəsdir şərabdən mənə, saqi, bu nəş`ə kim,
Cövri-sipehrü dövri-zəman bilmənəm nədir.

Eşq ilə var mənim dəxi bir özgə aləmim,
Qövsi, cəhanü xəlqi-cəhan bilmənəm nədir.

* * *

Heç şəm ilə ram olmaz, pərvanələriz bizlər,
Zəncirə baş endirməz, divanələriz bizlər.

Dünya ilə surətdə var ülfətimiz, əmma
Mə`nidə bu aləmdən biganələriz bizlər.

Seylabi-həvadisdən neylər bizə gərdun kim,
Tufani-kəşakəşdən viranələriz bizlər.

Hərgiz səsimiz çıxmaz, heç kim dilimiz bilməz,
Hərçənd ki, dillərdə əfsanələriz bizlər.

Yox taqətimiz, əmma fariğ degilik, Qövsi,
Ol mah büti-Çindir, bütxanələriz bizlər.

* * *

Ey şəm, bu günlərdə mənim halımı gəl gör,
Hicran gecəsi surəti-əhvalımı gəl gör.

Ey sayeyi-sərvin ələmi-səbzi-qiyamət,
Məhşər günüdür nameyi-e`malımı gəl gör.

Sinəmdə əliflər çəkər oldum sitəmindən,
Divani-məhəbbətdə mənim falımı gəl gör.

Məlum degil danla, təbibim, nolacaqdır,
Zinhar, bu gün bir nəfəs əhvalımı gəl gör.

Hərçənd məni dövri-fələk saldı ayaqdan,
Qət`i–rəhi-kuyində pərü balımı gəl gör.

Bütxanə məni Kə`bə kimi şəm ilə istər,
Ey qibleyi-ərbabi-dil, iqbalımı gəl gör.

Qövs kimi əzbəs ki, zəmingirü zəifəm,
Can nəqdini tapşırmağa ehmalımı gəl gör.

* * *

Dəhr hər beş gündə bir atəşinan meydanıdır,
Hər zəman bir saqiyi-nazafərin dövranıdır.

Ol ləbaləb cam ki, çeşmin mənə təklif edər,
Mey degil, yarəb, bu hansı bigünahın qanıdır.

Çün kəbab olmuş cigərlər rizqidir eşq əhlinin,
Hər kimin mehmanı olsa, aşiq öz mehmanıdır.

Türfə rövşəndir üzarın, xoş uzundur kakilin,
Hansının şəm`i kimin, yarəb, şəbi-hicranıdır.

Rişteyi-mehrü vəfadır aşiqi zəncir edən
Kakilin tək öz-özinin zarü sərgərdanıdır.

Vardır nəzzarədə bir rəhm, bir iman, vəli
Çeşmi-məstin tək firəngin bəndeyi-fərmanıdır.

Çaki-sinəmdən mənim bilməzmidir peykan çəkən
Kim, bu ol əbrukəmanın navəki-müjganıdır.

Bağlamış bəs kim, hicabi-eşq Qövsinin gözün,
Gündə yüz qurban olur, bilməz kimin qurbanıdır.

Bu həman rəna qəzəldir kim, Füzuli söyləmiş:
"Doğru derlər, hər zəman bir aşiqin dövranıdır".

* * *

Yarəb, bu il nə növ gəlib, keçdi novbahar
Kim, mən hənuz açmamışam çeşmi-intizar.

Ey söyləyən ki, səbrü şəkib ixtiyar qıl,
Tanrı bilir, nə səbr qalıbdır, nə ixtiyar.

Məcnun özün mənimlə bərabər xəyal edər,
Əmma bilir təfavütümüz, kim ki, əqli var.

Məlum olurdu kim, nə çəkir biqərarlar,
Çəksəydi öz yolunda gözüm nura intizar.

Bilməm nəzarənin necə tutmuş inanını
Əzbəs siyahməstdir ol çeşmi-pürxümar.

Hiç kimdə rəng qoymadı ol hüsni-nimrəng,
Hərçənd xəlqə tabu təravət verir bahar.

Zinhar, qəmzəsindən anın ehtiraz edin
Kim, ol bəlayə qanım içən olmasın düçar.

Məşuq aşiq olduğu sözdür, fəsanədir
Kim, böylə intizar çəkən verməz intizar.

Qövsi, bu ol qəzəl ki, demişdir bir əhli-dil:
“Axır gözüm qarasını ağ etdi ruzigar”.

* * *

Biz kimüz kuyində yarın, bir bölük avarələr,
Xəstələr, sərgəştələr, bitablər, biçarələr.

Eşq fərmanilə gərdun tirərüz eylər məni,
Tifl tək kim, bimi-ustad ilə məşqin qarələr.

Ahü naləm navəkindən göz-göz olmuşdur fələk
Kim, deyər xəlq onlara sabitlərü səyyarələr.

Əqldən biganə eylər aşina sözlər, ğəli
Aşiqi-divanəni zəncir edər nəzzarələr.

Yanginən məhfildə öz kamincə, ey pərvanə, sən
Kim, məni ab etdilər bir parə atəşparələr.

Çəkmənəm əl kakilindən ol səhi sərvin əgər
Şaneyi-şümşad tək yüz yerdə bağrım yarələr.

Büt kimi vari gərəkdir səcdə etsinlər ona
Versələr insaf kafərgişlər, xunxarlər.

Ol kəlamidir Nəvainin bu, Qövsi, kim demiş:
"Bəs ki, tofrağ oldu eşqin dəştidə avarələr".

* * *

Ol gün ki, zülfün ol sənəmin şanə qıldılar,
Zəncirə çəkdilər məni, divanə qıldılar.

Ol gün ki, rövşən etdi fələk şəm`i-arizin,
Mehr ilə mahın adını pərvanə qıldılar.

Bir tazə güldən ötrü məni əndəlib tək,
Sərfi-nəvayi-naleyi-məstanə qıldılar.

Ol gəncdən nişan mənə bir kimsə vermədi,
Bilməm nə vəchdən məni divanə qıldılar.

Eşq ilə kim ki yandı, mən oldum kəbab ana,
Hər şəm`i yaxdılar, məni pərvanə qıldılar.

Çox mən kimi əsiri özündən bu xublər,
Bir azca iltifat ilə biganə qıldılar.

Gər xəlq unutsalar, nola Məcnun fəsanəsin,

Qövsi, bu növ kim, səni əfsanə qıldılar.

* * *

Yüz min qəm ilə xatirimi şad qıldılar,
Viranə etdilər məni, abad qıldılar.

Düşməz vətən sənin səri-kuyində yadıma,
Guya bu xakdən məni icad qıldılar.

Yalquz riyazət ilə Fəlatun mən olmadım
Kim, çoxları bu tifllər ustad qıldılar.

Üşşaq naləsini sevər bəs ki, rüzigar,
Bidad qıldı, hər nə qədər dad qıldılar.

Fəryad kim, yetişmədi fəryad bir yerə,
Hərçənd əhli-dil səni fəryad qıldılar.

Onlar güli-murad gülabını tutdular
Kim, əndəlibi bir gün ilə yad qıldılar.

Hər yerdə Qövsi başladı öz sərgüzəştini,
Üşşaq ahü naləni bünyad qıldılar.

* * *

Ey ki, hüsnün aşiqin xurşidi-aləmtabidir,
Qibleyi-taət mənə əbrulərin mehrabidir.

Mən sənin bitabın, aləm bəlagərdan sənə,
Zülfi-purtabin sənin, yarəb, kimin bitabidir.

Surətin ayineyi-ərbabi-mə`nidir, vəli,
Aşiqi-bitab ol ayinənin simabidir.

Arizuyi-badeyi-biğəm qılan bilməzmi kim,
Xuni-dil xümxaneyi-çərxin şərabi-nabidir.

Əhli-halın bəzminə hüşyar olan layiq degil,
Bəkləyin meyxanə qapusin, bu cənnət babidir.

Sineyi-sədçakdir eşqi-cigərxarın gülü,
Qanlı peykanlar bu bağın qönçeyi-sirabidir.

Zahidəm, qövsi, mənü könlüm evidir məscidim,
Ol yıxılmış məscidin xəm qamətim mehrabidir.

* * *

Odlu dağimdən dəmadəm pənbeyi-mərhəm yanar,
Ah, əgər mən böylə yansam, sərbəsər aləm ynar.

Şö`leyi-rüxsarın ilə yandı çeşmim mərdumi,
Bir rəviş kim, çeşmeyi-xurşiddən şəbnəm yanar.

Hüsn özü fariğ degil yanmaqdan, ey pərvanə, kim,
Qeyri yandırmaqdan artıq şəm`i-şami-qəm yanar.

Şəm tək mümkün degil bəzmində yarın giryə kim,
Pərdeyi-çeşmimdə tabi-arizindən nəm yanar.

Gər dimağım yansa, eyb olmaz bu hal ilən mənim,
Dustlər, bəs kim qalur sinəmdə dərdü qəm yanar.

Ağlaram bir rəng kim, biganələr ağlar mənə,
Yanaram bir növ kim, əhvalıma aləm yanar.

Şəm tək, Qövsi, əgər gül yansa eşq əhvalinə,
Ol oda pərvanə tək, əlbəttə, bülbül həm yanar.

* * *

Ey ki, çeşmim həlqeyi-zülfi-pərişanındadır,
Əqlimü huşum əgər vardır, sənin yanındadır.

Göz tikər tək sübh üçün bimar olan rövzənlərə,
Ömrlərdir gözlərim çaki-giribanındadır.

Almamış nərgislərin bir yerdə məndən könlümü
Kim, anın hər parəsi bir növki-müjganındadır.

Dilrübalıq özgədir, hərçənd ahulər gözü,
Qarədir ol sürmədən kim, çeşmi-fəttanındadır.

Mümkün olmaz zəxmi-tiğ açsın tutulmuş könlümü
Kim, bu güllər qönçeyi-sirabi-peykanındadır.

Sənsən ol şirin ki, hər şur olsa sübh həşrədin,

Bir nəmək çeşdir bu düzdən kim, nəməkdanında var.

Bəndeyi-hər süfləsən, Qövsi, həvayi-nəfs ilə,
Çərx fərmanındadır, gər nəfs fərmanındadır.

* * *

Nola gər könlümdə eşq naləfərma gizlənir,
Bu könül bir qətrədir kim, onda dərya gizlənir.

Aşiqi-pakizəgövhər sinəsində xuni-dil,
Gizlənir, gər pərdeyi-minadə səhba gizlənir.

Bərqi-əbr altında pünhan qılmağı mümkün degil,
Naleyi-atəşinan könlümdə bica gizlənir.

Dərd əlindən dudi-ahim çün fələkpeymalənir,
Yaşınır xurşidi-tabanü Məsiha gizlənir.

Durmıyan, oturmıyan xəlq ilə bilməz kim, neçin
Yer üzündən qaçıban göylərdə İsa gizlənir.

Balü pərsiz bülbüləm, mümkünmidir görmək məni
Kim, yuvamın xarü xaşakində ənqa gizlənir.

Bir pəri peyvəstə vardır şişəsində Qövsinin,
Səngdil bütlər gözümdən sanma bica gizlənir.

* * *

Hər kimə ol səngdil səhba verir, qan ağladır,
Güldürür sübhi-vüsalü şami-hicran ağladır.

Fariğ olmaq bir nəfəs qəmdən mənə mümkün degil,
Saqiyi-xuni-dərm güldürsə, dövran ağladır.

Üz tutub mehrabə ağlarsam, demin, zahid mənə,
Ey müsəlmanlar, məni ol namüsəlman ağladır.

Ey məni bəzmində yarın nalədən mə`n eyləyən,
Bülbüli-bitabi neyyir tək gülüstan ağladır.

Hər kimi gülməkdə görsəm, məhv edər heyrət məni,
Bəs ki, müşkil güldürür gərdun, asan ağladır.

Piçü tabi-zülf ilə ol qönçeyi-xəndan mənəm,
Tarü pudim şəm tək eylər pərişan, ağladır.

Rövzesi-rizvan həvası məndə yox, əmma məni,
Arizuyi-rövheyi-şahi-Xorasan ağladır.

Ağlayan Qövsimidir, ya piri-Kən`an kim, onu
Guşeyi-beytül-həzəndə mahi-Kən`an ağladır.

* * *

Aftabi var sipehrin, ana qarşı ayı var,
Səndən özgə xublardan hər kim olsa, tayı var.

Nola gər yoxdur səgi-kuyindən əndişəm mənim,
Hərcü mərci-həşrdə kimdən kimin pərvayi var.

Xublərdən saxla, ey kim, cilvəgahindir könül,
Avçisi var hər çölün kim, ahuyi-rə`nayi var.

Rind cami-badə, zahid şirü aşiq xuni-dil,
Piri-çərxin süfrəsindən hər kimin bir payi var.

Dinivü üqbə muradın bulmuş ol kim mən kimi,
Taleyi-nasazi varü yari-bipərvayi var.

Xüşkləb qoymaq məni mümkünmidir ol bəhr kim,
Əbr feyzindən anın hər qətrənin dəryayi var.

Natəvandır Qövsi, əmma qafil ondan olma kim,
Gər zəmingir olsa həm ahi-fələkpeymayi var.

* * *

Aşiqəm, binəvalığım vardım,
Yollar üstə gədalığım vardır.

Kəsmişəm ülfət aşinalərdən,
Binifaq aşinalığım vardır.

Dolanım başına nə mətləb üçün,
Mən ki, bimüddəalığım vardır.

Mey  müvafiq degil məzacım ilə,

Sanma kim, parsalığım vardır.

Hər qədər eşqdən rəsayəm mən,
Əql ilə narəsalığım vardır.

Buriya fərşimü evim məscid,
Nə gözəl kədxudalığım vardır.

Uymuşam ta sənin xəyalın ilə,
Öz-özümcən cüdalığım vardır.

Qönçeyi-naşüküftəyəm, əmma,
Gül kimi dilgüşalığım vardır.

Görmənəm ruyi-aşina, Qövsi,
Nola deyr aşinalığım vardır.

* * *

Ah kim, səbrim binasin etdi viran intizar,
Eylədi odlarə yanmış bağrımı qan intizar.

Sayə salmaz başimə, bir gün güzar etməz mənə,
Ey səba, bilməzmi ol sərvi-xüraman intizar.

Tab vermiş hər biri bir yanə canım riştəsi,
Sübhi-ümmid iztirabü şami-hicran intizar.

Yollar üstə mən kimi, bir sən kimi birəhm üçün,

Hiç kafər çəkməsin, ey namüsəlman, intizar.

Mən bu dərdi, dustlər, çox çəkmişəm, məndən sorun,
Düşmən ilə olmasın dəstü giriban intizar.

Aşiqi-bitabdən damənkəşan olmaq neçün,
Bəs degilmidir ana ya bərqcövlan intizar.

Sinədir bir zərreyi-naçizü həsrət kuh-kuh,
Didədir bir qətreyi-dəryayi-ümman intizar.

Təşnə çeşmü xüşkləb hasil ki, bir ümmid ilə
Ömrlərdir çəkimişəm, ey əbri-ehsan, intizar.

Asimanın daşinə Qövsi kimi üz sürməyə,
Bağrımı ab etdi, ya şahi-Xorasan, intizar.

* * *

Fəğan ki, söz deməyə doğru sözlü yar azdır,
Şəbi-siyah çoxü şəm`i-şami-tar azdır.

Bu qəm ki var mənim cani-natəvanimdə,
Təmam xəlq mənə olsa qəmkusar azdır.

Güriz çağı sipahi-bəlavü möhnətdən
Ümid bağlamalu arxalu həsar azdır.

Hüzur qədri bilən əndəlibdən sor kim,
Xəzan bir-iki nəfəs çox, yüz il bahar azdır.

Bulunsa yari-vəfadar, qoymənəm ətəgin,
Əlim-dilim kimi kütahdır ki, yar azdır.

Vəfavü mehrdə hərçənd imtiyazın var,
Hənuz ol ki, gərək yoxdur, ol ki var, azdır.

Bu arizulər ilə kim əhatə etdi məni,
Min il muradım ilə dönsə ruzigar, azdır.

Əgər şərab verirsən, ayağə dur, saqi
Ki, nagüvar çoxü abi-xoşgüvar azdır.

Əgərçi bülbüləm, əmma bahar üçün, Qövsi,
Gözümdə həsrətü könlümdə xar-xar azdır.

* * *

Şö`leyi-atəş ki, derlər çöhreyi-cananədir,
Mən xəvir atəşpərəstəm, könlüm atəşxanədir.

Surəti var eyləsə biganəlik canan vəli,
Yar hərçənd aşinadır, məniyi-biganədir.

Sərgüzəştim fərqi Məcnun macərasından budur
Kim, bu sözlər doğru sözlərdir, olar əfsanədir.

Gər sipahi-eşqdən salsam sipər, eyb eyləmə
Kim, hərifi-mərd ilə pürxaş namərdanədir.

Ah kim, abü həvasından cünun gülzarinin,
Qönçeyi-sirabi-şəm`ü bülbüli pərvanədir.

Aşiqi-bitab seylabü təhəmmül xarü xəs,
Hüsn gəncü əjdaha eşqü cəhan viranədir.

Yansalar odlarə bitabanə bülbüllər, nola
Kim, bu gülzarın gülü həm şəm, həm pərvanədir.

Mən təəyyün, ya təkəllüf, ya təvazö bilmənəm,
Kim ki, viran könlümə yol bulsa, sahibxanədir.

Kə`beyi-məqsuddən kim, bəzmi-vəslindir sənin
Baş qoyar səhralərə Qövsi, məgər divanədir.

* * *

Ey fələk, canə yetirdin məni, cananə yetir,
Dərdi-gəncayişi yoxdur daxi, dərmanı yetir.

Öz ayağımla yəman getmişəm əldən, yarəb,
Başım üstə mənim ol sərvi-xüramanı yetir.

Mütribü bərgü nəvavü meyi-nab istəmənəm,
Mənə, ey dövri-zəman, saqiyi-dövranı yetir.

Suyə döndü ləbi-ləlin həvəsindən bağrım,
Cigərim başı kəbab oldu, nəməkdanı yetir.

Özünə eyləmə asan işi müşkil, Qövsi,

Sənə gər yetməsə canan, sən ana canı yetir.

* * *

Səba, durub yola düş, var ana, səlam yetir,
Alıb cəvabi-səlamım, dönüb pəyam yetir.

Səba, mənim yerimə yollar üstə dur neçə gün,
Ana səlamımı sübhü duamı şam yetir.

Məsih tək ki, gəlib mayeyi-həyat verir,
Yetir özün mənə, saqi, yetincə cam yetir.

Bu niyyət ilə ki, qanım sənə həlal olsun,
Əgər həlal ola səhba, əgər həram yetir.

Sirişki-al ilə ləxti-cigər gərək, Qövsi,
Meyi-rəsidə yetibdir, kəbabi-xam yetir.

* * *

Kuyində peyki-badi-səba hiçkarədir
Kim, Kə`bə içər qiblənüma hiçkarədir.

Üşşaq ilə uzundur əli zülfü kakilin,
Seyd olmasa kəməndi-rəsa hiçkarədir.

Bəzmində bəs sənin nədir, ey səngdil, əlac
Kim, nalə hərzəgərdü dua hiçkarədir.

Darüşşəfayi-eşqdə kim, dərddir Məsih,
Məzuldir təbibü dəva hiçkarədir.

Mənzur hansı mənsəb ola mülki-eşqdə
Kim, onda şah, kədavü gəda hiçkarədir.

Fəxr etmə malü cahə ki, iqlimi-fəqrdə
Dövlət şikəstəbalü hüma hiçkarədir.

Ta Xızri-rahın olmaya öz sidq niyyətin
Qövsi, bu yolda rahnüma hiçkarədir.

* * *

Fəğan ki, anlamanam söz nədir, nəzarə nədir,
Niyazü nazü təbəssüm nəvü işarə nədir.

Dilin zəkati üçün, ey təbib, söylə mənə,
Əsiri eşq ki, biçarə düşsə, çarə nədir.

Gözün gər içməz isə bigünahlər qanın,
Sözün həlaki olum, bəs bu qanlu yarə nədir.

Məhəbbət ortada ta safü pak mümkün ola,
Boyun bəlasın alım, naz, ya kənarə nədir.

Görər nigah ilə qətlimdə məsləhət çeşmin,
Gözüm çirağı, bu xeyr işdə istixarə nədir.

Mənə ki, bir sözü min yol demək hənuz azdır,
Bu hal ilə nə bilim, qəmzə, ya işarə nədir.

Əgər gülün yox isə iztirabı bülbül üçün,
Deyin ana ki, giribani-parə-parə nədir.

Sipehr anın gözünü ac edər, günini qara,
Biri ki, bildi bu məktəbdə ağü qarə nədir?

Əgər nə çərx evi baziçəxanədir, Qövsi,
Bu təxteyi-fələkü möhreyi-sitarə nədir?

* * *

Can piçü tabi cismdə canan yetincədir
Kim, dərd kamranlığı dərman yetincədir.

Səhni-çəməndə bülbüli-novxiz cilvəsi
Ol sərvi-səbzpuşi-xüraman yetincədir.

Qalmaz anın yanında daxi xublərdə rəng,
Gül abü tabi mehri-dirəxşan yetincədir.

Cövlanları aləm kimi gülçöhrə bütlərin
Ol şəhsüvari-ərseyi-meydan yetincədir.

Saqi əgər sitəm qıla, fəryadə kim yetər?
Gər cövri-dövr saqiyi-dövran yetincədir.

Dilmancı könlümün gözüm olmuş, həray kim,
Əşki-rəvanım ol güli-xəndan yetincədir.

* * *

Hər dəm könüldə cilveyi-canana yaxşıdır,
Bir böylə şişəxanə, pərixanə yaxşıdır.

Ol şəm`i-naz kim məni yandırdı ömrlər,
Gər bir zəman mənim oduma yanə yaxşıdır.

Səncidə nəğmənin əsəri cəstə-cəstədir,
Təsir üçün təraneyi-məstanə yaxşıdır.

Məşuq aqil olsa, qürur eyləməz, vəli
Eşq əhli hər qədər ola, divanə yaxşıdır.

Məndən kəsilmə, özgəyə binisbət olma kim,
Gənci-rəvan yaşurmağa viranə yaxşıdır.

Məndən, gözüm çirağı, əbəs yüz çevirmə kim,
Dönməkdə şəm başına pərvanə yaxşıdır.

Təhsili-xab üçün gecələr sübhədin mənə,
Naseh deyən lövün-lövün əfsanə yaxşıdır.

Saqi, sənin əsirin olan binəvalərə,
Dərüləman guşeyi-meyxanə yaxşıdır.

Hərçənd olmaya sözünə kimsə aşina,

Qövsi, təlaşi-mə`niyi-biganə yaxşıdır.

* * *

Sinəmdə könül mürği-giriftar ilə birdir,
Çeşmimdə mənim hər müjə minqar ilə birdir.

Sözdür bu ki, yarın dili əğyar ilə birdir,
Heç əbləh inanurmi ki, gül xar ilə birdir.

Bir şuxi-sitəmkarə əsirəm ki, büti-Çin,
Yanında anın surəti-divar ilə birdir.

Olmaz bir ola yar ilə əğyar, neçün kim,
Əğyar ilə könlüm ikidir, yar ilə birdir.

Aşiq ki, səri-zülfinə can riştəsi bağlar,
Təsbihi anın həlqeyi-zünnar ilə birdir.

Ol yandığı saətdə bu zirü zəbər eylər,
Seylabi-həvadis dili memar ilə birdir.

Eşq eylədi bir bağdə gülçin məni, Qövsi
Kim, xari anın novgüli-bixar ilə birdir.

* * *

Bəzmi-vüsalə baxma, dili-biqərari gör,
Başimdə gül görən, gəl ayağımda xari gör.

Bülbül, neçün xəzan sitəmindən məlulsan,
Gəl baxgilən, mənim gözüm ilə baharı gör.

Hərçənd sayə tək düşürəm xaki-pakinə,
Baxmaz ayağı altına, bimehr yarı gör.

Kuyində qədrdə itin ilə bərabərəm,
Xari-təmami-aləm ikən e`tibarı gör.

Aldanma şikvə adını şükr eyləyənlərə,
Şükr adını şikayət edən həqgüzarı gör.

Könlümdə məskən eyləginən, iztirabə bax,
Əylənginən gözümdə mənim intizarı gör.

Qövsi qəmində ah ilə yandırdı aləmi,
Yüz bərqdən ötürdi işi, bir şərari gör.

* * *

Aləmdə bu gün aşiqi-xunincigər azdır
Kim, xuni-cigər qədri bilən simbər azdır.

Çoxdur həvəs ərbabı, vəli aşiqi-sadiq
Azdır, necə kim, nəğmeyi-tər çox, əsər azdır.

Ey sinə verən qülzümi-xunxarinə eşqin,
Qövr et ki, bu dəryadə sədəf çox, göhər azdır.

Ol kuy sorağında verir xüld nişanın,
Vaizdə, sözün doğrusu, doğru xəbər azdır.

Məndən dilə, hərgah kəbab istəsə könlün,
Hərçənd bu bitabdə, saqi, cigər azdır.

Gər olsa sözü mehrü vəfanın, özü olmaz,
Dünya doludur laf ilə, əmma hünər azdır.

Ney daxi həzin nalə ilə bağrımı doğrar,
Guya dili-bimarə verən dərdi-sər azdır.

Əndişeyi-tufan çox olur bəhrdə, əmma
Sən ləngəri-təslim ələ alsan, xətər azdır.

Ol çeşmi-siyəhməsti görən kimsə bilir kim,
Qövsi kimi sahibdilü baliğnəzər azdır.

* * *

Nizami-gərdişi leylü nəhar bir dəmdir,
Cəhanda ağü qara, hər nə var, bir dəmdir.

Mənim gözümdə qiyamət günilə tov`əmdir,
Sənin yanında əgər intizar bir dəmdir.

Qulağ ver, gözün aç, bağban, qənimət bil
Ki, mövsumi-gülü bangi-həzar bir dəmdir.

Boyun bəlasın alım, başına dolanmaq ilə

Əgər yüz il dolanur ruzigar, bir dəmdir.

Nə eyb, saqiyi-gülçöhrə, damənin tutsam,
Əlimdə çünki mənim ixtiyar bir dəmdir.

Bu növ kim, görünür ilcə bir nəfəs sənsiz,
Min il səninlə böylə ruzigar bir dəmdir.

Güvənmə malına, aldanma etibarına kim,
Səbati-dövləti-napaydar bir dəmdir.

Nə rəng ilə ötə əyyam, nalə çək, Qövsi
Ki, gər xəzandır əgər, novbahar bir dəmdir.

* * *

Səba, təqsirimi, zinhar, ol bidadgərdən sor,
Səri-kuyinə gər yol bulmasan, ahi-səhərdən sor.

Nə bilsin sən kimi hüşyar olan bihuşlər halin,
Mənim əhvalımı mən tək özündən bixəbərdən sor.

Nihali-dudi-ahim səbz olur, əmma səmər verməz,
Səba, hər ikinin vəchin bu nəxli-basəmərdən sor.

Sipehrin təngnasindən cünun səhrasinin fərqin
Sözün doğrusunu aqil deməz, divanələrdən sor.

Sən, ey ney, bağrımın surax-surax olduğu vəchin
Nəvayi-nalənin təqsiri yoxdur, var, əsərdən sor.

Mən ol deyir aşinanın müddəasın bilmənəm, Qövsi,
Ləbi-şirinkəlamın sorma məndən, çeşmi-tərdən sor.

* * *

Desəm nəzzarə qıl rüxsarını, məndən nihan eylər,
Desəm kim, bağrımı bidad ilə qan etmə, qan eylər.

Büti-Çin, ey brəhmən, bəndəpərvərlik yolun bilməz,
Bunu ol səngdil yaxşı bilir, əmma yəman eylər.

Onu könlüm dilər, sinəmdə əglənməz sitəmdir bu
Ki, bülbül gül sevər, əmma xəsü xar aşiyan eylər.

Məgər ol şəm`ə halim röşən olmaz kim, məni, yarəb,
Dirildir, öldürür, hər gündə yüz rəng imtəhan eylər.

Vücudim zə`fdən əmvatə rəşk eylər, yəqindir bu,
Həruz ol ahənin dil məndə canü dil güman eylər.

Nə qəm gər könlümü qılsam müşəbbək, dağ-dağ etsəm
Ki, aşiq pişə bir limuni yüz yerdən nişan eylər.

Təğafül iltifatamizü ülfət naz ilə töv`əm,
Bu ahu qanı mişknab, mişknabı qan eylər.

Nə qəm gər mən zəmingirəm kim ol sahir xüram etgəc,
Verir can surəti divarəvü hər yan rəvan eylər.

Məhəbbət kişvərində dudi-ah etməz əsər, Qövsi,
Anın abü həvasi sərvi pamali-xəzan eylər.

* * *

Qətrəni hərçənd derlər kövhər eylər novbahar,
Əşkimin hər danəsin bir əxkər eylər novbahar.

Göz yaşım xak ilə yeksandır mənim, fəryad kim,
Şəbnəmə gül yaprağından bəstər eylər novbahar.

Qalmışam bidəstü pa, insaf qıl, ey sərv kim,
Bülbülə gül bərgini balü pər eylər novbahar.

Haşəlillah kim, qoya biəşk çeşmim mərdumin,
Böylə kim, hər xar müjganın tər eylər novbahar.

Gər bu abü tab ilə gül şəm\`ini rövşən qılır,
Bülbülün balü pərin xakistər eylər novbahar.

Dəmbədəm doğrar anın nəzzarəsindən bağrımı,
Səbzə tiğin bəs ki, sahibcövhər eylər novbahar.

Rövşən oldu əbri-gövhərbar feyzindən mənə
Kim, mənim torpağımı, Qövsi, zər eylər novbahar.

* * *

Əndəlib ilə gülü hərçənd yar eylər bahar,

Bimi-hicran ilə bir dərdin həzar eylər bahar.

Gər bu rəng ilən mənim bağrım kəbabın qan edər,
Aləmi bir göz yumunca laləzar eylər bahar.

Safgövhərlər bilirlər eşqi-pakin qədrini,
Bülbülə peyvəstə gül nəqdin nisar eylər bahar.

Bağlasın meyxanə qapusın bu il meyxanəçi,
Bəski, abü tabdan dəf`i-xümar eylər bahar.

Böylə gər, çin-çin qılır mövci-nəsimin türrəsin
Çoxların huşin bu dam ilən şikar eylər bahar.

Artırır şurin, alır əqlin, üzür zəncirini,
Püdü tarin əhli-eşqin tarü mar eylər bahar.

Hər xəsü xaşaki, Qövsi, qaldırır toprağdən,
Aşiqi, yarəb, nə yüzdən xaksar eylər bahar.

* * *

Əgər bir namə məndən dustlər dildarə yazsınlar,
Gözüm əhvalın ağü əşki-çeşmim qarə yazsınlar.

Bəyani-surəti-əhvalıma kağız vəfa qılmaz,
Məgər kuyində cananın dərü divarə yazsınlar.

Səri-kuyində toprağ üstünə göz yaşımın şərhin,
Qələm müjganlarımdan eyləsinlər yarə yazsınlar.

Əgər Məcnun, əgər Fərhad ola kim, dərd çəkmişlər,
Yığılsınlar, mənimçün hər biri bir çarə yazsınlar.

Çox etdim şikvə,heç şükr etmədim,yarəb ki, məhrəmlər
Onu bir parə pozsunlar, bunu bir parə yazsınlar.

Salır əşkim kimi şəbnəm gülü, gül şəbnəmi gözdən,
Sənin gər abü rəngin şərhini gülzarə yazsınlar.

Yazanda əhli-eşqin halını ərbabi-dil, Qövsi,
Məni-gümnamın adın yazsalar, avarə yazsınlar.

* * *

Etməmişdir, dustum, bağrın sənin qan intizar,
Düşməninlə olmasın dəstü giriban intizar.

Etməsin, yarəb, mükafat əməli-ruzi sənə
Kim, mənə çox verdi, ey sərvi-xüraman, intizar.

Gəlsə ol Leyli, mən, ey Məcnun, nə isar eyləyim,
Ruhi-pakinçün ki, məndə qoymadı can intizar.

Halimi, yarəb, nə rəng ilən ana məlum edim
Kim, mənə düşvardır, cananə asan intizar.

Özgələr məşuqimi derlər ki, aşiqdir, vəli
İftiradır iztirab ol mahə, böhtan intizar.

Sevdigim qeyrin səri-rahin tutar, fəryad kim,
Heç bir az ol kafəri etməz müsəlman intizar.

Abruyi-xaki-rahinçün ki, Qövsi tək mənə
Mundan artıq vermə, ya şahi-Xorasan, intizar.

* * *

Qərəz könüldür əgər sinəm üzrə dağ yanar,
Məzarı üstə bu pərvanənin çırağ yanar.

Şərab birlə necə tərdimağ olum mən kim,
Ləbimdə sağəri-bütxanə tək ayağ yanar.

Oduna zahidi-xüşkün nəfəs-nəfəs aşiq,
Yanar nə növ ki, kibritdən çırağ yanar.

Əgərçi sinələri dağ yandırar, əmma
Hərarətimlə mənim lalə-lalə dağ yanar.

Kənar tutmagilən eşqdən, yaxın gəl kim,
Yanarsa atəşi-xurşiddən irağ yanar.

Füruğ buldu gözüm pərdəsində çöhreyi-yar
Ki, şəm`i-şö`lə çəkər hər qədər ki, yağ yanar.

Nəzarəsindən anın gözlərim füruğ istər,
Sanur ki, məş`əli-xurşiddən çirağ yanar.

Haçan təmiz qılır eşq küfri imandan,
Bu xeyrə bərq ilə, Qövsi, qaravü ağ yanar.

* * *

Eşq baladəstü hicran lazimü məlzumdur,
Atəşü daği-nümayan lazimü məlzumdur.

Tirbarani-həvadis qarşu vacibdir sipər,
Dövri-sağər, dövri-dövran lazimü məlzumdur.

Hüsni-xətt dövründə olmaz aşiqə lütf etməyə
Novbaharü əbri-ehsan, lazimü məlzumdur.

Könlüm əglənməz mənim zəncir ilə sinəmdə kim,
Şuri-Məcnunü-biyaban lazimü məlzumdur.

Gözləri sahibdilin giryan olur peyvəstə kim,
Gövhəri-sirabi-ümman lazimü məlzumdur.

Müttəsil aşüftədir ərbabi-dünya xatiri,
Arizu, xabi-pərişan lazimü məlzumdur.

Sübhi-vəsl, ey şeyxi-kəman, Qövsi gərək qulluqda kim,
Eydi-qurban ilə qurban lazimü məlzumdur.

* * *

Mən ki, təsliməm sana, bəs dəxi istiğna nədir,
Başin üçün, mətləbin, ey ahuyi-rə`na nədir.

Bitəfavüt hər nə lütf etsən mənə, nuş eylərəm,
Bilmənəm ki, xuni-dil, gahi meyi-səhba nədir.

Söyləyin məndən səgi-kuyinə yarın, düstlər,
Müddəa gər can isə, qoy tapşurum, qovğa nədir.

Gər təbib anlarsa, dərd izharinə sima yetər,
Dil bilən anında qəmzü rəmz, ya ima nədir.

Ömrlər bəsdir, mənə bir gün zəbani-hal ilə
Sorsa kim, halın sənin, ey aşiqi-şeyda, nədir.

Fəhm edərmi eşqə könlün verməyən bidərd kim,
Macərayi-qətreyi-sərgəştəvü dərya nədir.

Qövsinin əndişəsi yoxdur ölümdən, qorxuram
Ol həyati-cavidandan etdiyi pərva nədir.

* * *

Gözümdə qönçələnmiş könlümü canan yolun gözlər,
Yığılmış xirmənü bərqi səbükcövlan yolun gözlər.

Dili-xunin degil sinəmdə, yüz dərd intizarında
Bu sərmənzil xəlilüllahdır, mehman yolun gözlər.

Üzülməz rişteyi-ümmidi-aşiq can üzülməkdən,
Öləndən sonra həm biçarəmiz dərman yolun gözlər.

Bu hamı zəxmi-xünəfşan degil, sinəmdə kim könlüm,
Açıbdır hər tərəfdən gözlərin peykan yolun gözlər.

Qalur tək xəsteyi-bitab dərman intizarında,
Mənim biçarə könlüm dərdi-bidərman yolun gözlər.

Ərəq qonmuşmu şəbnəm tək güli-rüxarına yarın,
Bu gözlər birlə ya bir aşiqi-heyran yolun gözlər.

Dili-bitabdan kim, navəki-bidadə peykandır,
Sərapa göz-göz olmuş Qövsivü canan yolun gözlər.

* * *

Həvasın ol pərinin mən kimi divanələrdən sor,
Bu gənci-rayiganın qədrini viranələrdən sor.

Bu şəm`i-dudmani-hüsni hər əfsürdədən sorma,
Anınçün ruhi pərvaz eylən pərvanələrdən sor.

Onu bilməzlər ərbabi-xirəd, sən eşq əsrarın
Özün bilməz, sözün zəbt eyləməz pərvanələrdən sor.

Məni biganə qıldın aşinalərdən, inanmazsan
Mənim əhvalımı, ey səngdil, biganələrdən sor.

Məni gör, eşqi məndən sor, yetər, ey Leyliyi-aləm,
Eşit Məcnunun əhvalın, keçən əfsanələrdən sor.

Nə bilsin qədrini ayinə rüxsari-ərəqnakın,
Sən ol əbri-gövhərbari bu yanmış danələrdən sor.

Sipənd agəh dili-suzi-nihanımdan mənim, Qövsi,
Sorarsan sərgüzəştin aşiqin, pərvanələrdən sor.

* * *

Naləm ilə bəs ki bülbüllər səsi ahəng olur,
Bərgi-gül mizrabü şaxi-gül bieynih çəng olur.

Bülhəvəs şövqi bulur nöqsan bülənd olduqca xət,
Şükr kim, cövhər anın ayinəsində zəng olur.

Rəncü rahət cami-gülgun ilə artar hər nə var
Badə, saqi, məndə atəş, səndə abü rəng olur.

Atəşi-ahinlə könlün hiç yumşalmaz sənin,
Taleimdən hər qədər ol şişə qaynar, səng olur.

Hər çəmən səhnində kim, ol padşahi-hüsn ola,
Dudi-ahim əbri-gövhərbar tək övrəng olur.

Kasə-kasə xuni-dil kim, gərdişi-gərdun verir,
Başə biikrah əgər çəksən, meyi-gülrəng olur.

Can quşi ölmək dilərsən, natəvan et cismini
Kim, bu sazın tari barik olsa, seyrahəng olur.

Gah titrər vəhşət ilə, gah heyrətdən qurur,
Aşiqi-bitab əgər yüz rəng olur, yekrəng olur.

Açsa könlün, şuri-eşqi-laməkan pərvaz açar,
Kim ki, Qövsi, təngnayi-çərxdən diltəng olur.

* * *

Niyazımdır nəmazım, qibləgahim əbruyi-xəmdir,
Mənə ol taəti-məqbul əzəl başdan müsəlləmdir.

Məni həm mərdümi-aləm sanıb vəhşət qılan ahu,
Yavuq gəl kim, məhəbbət aləmi bir özgə aləmdir.

Məhali əqldir izhari-razi-eşq məndən kim,
Bu gənc üstündə ol viranənin bünyadı möhkəmdir.

Yüzün xurşidi-taban, sübhi-sadiqdir mənə guşin,
Ləbin gül yaprağıdır, dişlərin xod əqdi-şəbnəmdir.

Nisari-xaki-rahinçün ki, abi-Xızrdan yegdir,
Təbibim, məndə can yoxdur,əgər yüz can desəm,kəmdir,

Məni xəndan görüb surətdə, könlümdən xəbərsizlər
Nə bilsinlər ki, toydur munda, əmma onda matəmdir.

Özin şirü şəkər zövqilə şirinkam edən zahid
İnanurmi ki, cənnət vəsldir, hicran cəhənnəmdir.

Zəbani-hal ilə dərdim sorub, etdin əlac, əmma

Yəman halim pərişandır, təbibim, bilmirəm nəmdir.

Bəladır qeyr odinə yanmaqü dəm urmamaq, Qövsi,
Tərəhhümdür ana kim, aşiqin razinə məhrəmdir.

* * *

Ol səri-kuy mənə vəsldən, ey yar, yetər,
Gün əgər görməz isəm, sayeyi-divar yetər.

Nola eşq əhli əgər olmaz özündən xəbəri,
Bu qədər kim, ola mə`şuq, xəbərdar yetər.

Şəm`i-pərvanəyə, bülbüllərə gül ərzani
Məni yandırmağa ol şö`leyi-rüxsar yetər.

Sitəmindən sənin əflakə fəğanım yetdi,
Demə yetməz, yetər, ey şuxi-sitəmkar, yetər.

Gər təbib istəyə fəhm eyləyə aşiq dərdin,
Qanlı kiprikləri nəbzi-dili-bimar yetər.

Dilbərim cövrü-cəfasın mənə məxsus etmiş,
Yox isə dərd, vəfa onda bu kim var, yetər.

Əşki-gülrəng mənim bağu baharım bəsdir,
Mənə öz didələrim əbri-göhərbar yetər.

Natəvanlıq məni hərçənd zəmingir etdi,
Kuyinə əşk rəvan etdigi ilqar yetər.

Səri-tumari-nəsihət nə açarsan, zahid,
Sənin olsun dilü din, Qövsiyə dildar yetər.

* * *

Mənim gözümdə qiyamət gün ilə toəmdir,
Sənin yanında əgər iztirab bir dəmdir.

Mənin bu bağrımı ab etdi eşq, məhvəm kim,
Nə növ rişeyi-dərd onda böylə möhkəmdir.

Sədəfmi ağzınü gövhərmidir dişin, ya kim,
Bu qönçeyi-gülü ol qətrə-qətrə şəbnəmdir.

Dönə-dönə nola gər yandı şəm`ə pərvanə,
Yanar mənim də muradım çırağı, aləmdir.

Güvənmə bağına, ey əndəlib, kim, dəhrin
Qəravü ağı baharü xəzanı toəmdir.

Həmin nisar zərü sim edən degil Hatəm,
Kim öz muradi-dilindən keçərsə, Hatəmdir.

Şükuhi-hüsn ilə Qövsi görəndə Məcnun tək,
Siyahi-xeymeyi-Leyli səvadi-ə`zəmdir.

* * *

Rəfiqəm kim ki, üşşaq içrə tərki-xaniman eylər,
Şərikəm eşq sevdasında mən hər kim, ziyan eylər.

Əgər çeşmi-siyahməstin kəbab istər, mühəyyadır,
Dili-bisürfə neyçün bağrımı bir qətrə qan eylər.

Muradi nola, yarəb, navəkin bilməm nədir vəchi
Ki, tiğin zəxmini yüz yerdə təmğalər nişan eylər.

Məni mə`zur tut, gər nalə qılsan bəzmi-vüslətdə
Ki, bülbül hər qədər gül çox görər, artuq fəğan eylər.

Dolanıb başinə ol sərvi-nazin, göz yaşın tökdüm,
Uşaq tək kim, dəmadəm təprənüb dərsin rəvan eylər.

Qərəz gər piçü tabi-can isə pərvanə lazımdır.
Məni öldürsə həm muyi-miyanın kim, güman eylər.

Çəkibsən tiğ, qanın tök anın, göz yaşına baxma
Ki, Qövsi afərin etmək yerinə əlaman eylər.

* * *

Gözlərin nərgisi-məxmur, özü xümmar özüdür
Ki, təbibi-məni-bimar özü, bimar özüdür.

Gəh məni gözdən edən, gah sərapa göz edən,
Mahi-Kən`an ki, deyir xəlq, əgər var özüdür.

Gül özü, şəm özü, bülbülü pərvanə özü,

Yananü yandıranü nalə özü, nar özüdür.

Nə deyim halimi, bax zülfü xətü xalına kim,
Kimi şahid, kimi məzmun, kimi tumar özüdür.

Dilrübalıqda gözü qaşü xətü xalü ləbin
Hamı həmdəstdir, əmma buyuran yar özüdür.

Gahi sağər tutanü gah verən tövbə mənə,
Məni-yekrəngini yüz rəng qılan yar özüdür.

Məni bu bağda, Qövsi, nə səbəbdən, yarəb,
Xari-bigül sanır ol kim, güli-bixar özüdür.

* * *

Axır bu dərdü dağə təbibim dəva qılar,
Hərçənd bilmənəm deyər, əmma yəqin bilər.

Meyxanəçi təkamül edər fəthi-babdə,
Zinhar salma, getmə kim, ol qapı açılar.

Ahəstə sanma aşiqin ahini kim, bu övc,
Peykani gərçi mum isə kim, daşə sancılar.

Bimarəm öylə gündə ki, göydən enib Məsih,
Əhvalimi sorub, gözümün yaşini silər.

Ney naləsilə mən daxi bir nalə başlaram
Kim, bənd-bəndi cümləsi bir-birdən ayrılar.

Cuşi-bahar əgər bu isə başla nalə kim,
Bir əndəlib açılmağa yüz qönçə açılar.

Derlər ki, Qövsi ilə sənin var, şəfəqqətin,
Qurban olum sənə, onu Allah yeg bilər.

* * *

Bir-birinin tədarikidir rüzigarlər,
Həmzurdur xəzanlar ilə novbaharlər.

Məhfildə gəh sipənd qılır nola, gah ney
Cəm oldular qərarım alan biqərarlər.

Təqdim üçün həlaki-dəmi-tiğin olmağa
Bir-birləri ilən çəkişirlər şikarlər.

Əndişə ilə səngi-cəfadan yetirmədin
Əflakə xaksarlıq ilən həsarlər.

Hər sübhü şam kövkəbi-xurşiddən fələk
Saqi, sənin ayağına eylər nisarlər.

Sərmənzili-kəmalə yetərlər mürur ilə,
Gər bilsələr öz-özlərini kəm əyarlər.

Məcnuni dəşt unutdu görüb vəhşətim mənim,
Əhbabi gərçi yadə salır yadigarlər.

Əflak dönsə-dönməsə gəlməz giran mənə,
Qövsi, gərək ki, dönməyələr xaksarlər.

* * *

Anın zülfün əsiri-həlqeyi-zünnar olandan sor,
Mənim halım xərabi-nərgisi-bimar olandan sor.

Gözün bidadını bir mən kimi bimar olandan sor,
Mənim halım xərabi-sağəri-sərşar olandan sor.

Bu şəm`i hər yetən pərvaneyi-əfsürdədən sorma,
Anın halın səməndər tək bir atəşxar olandan sor.

Həqiqət aləmində güldərən gül qədrini bilməz,
Onu bülbül kimi bidəstü pavü zar olandan sor.

Mənim peymanəmin əndazəsin, saqi, bu məhfildə
Dəhandan sorma kim,yoxdur, ləbin tək var olandan sor.

Nə bilsin hər özündən bixəbər sahibdil əhvalın,
Bu gövhər razını bu məxzəni-əsrar olandan sor.

Onun muyi-miyanın sorma, ey dil, piçü tabın gör,
Bəli, yoxdan sual etmək nə lazım, var olandan sor.

Məni ta qullarından saydı canan, padşahəm mən,
Bu bəxtü talei iqbali-dövlət yar olandan sor.

Dəhanın fikrini kim, qönçeyi-təsvir edər xəlqi,
Sözün imdadı ilə hiç yerdən var olandan sor.

Əgər olsaydı ondan qeyri yarım xəlqi-aləmdə,
Deyərdim halımı, Qövsi, mənimlə yar olandan sor.

* * *

Olmuşam dilgir özümdən, qəmküsarım qandadır,
Şaxü balım sındı, yarəb, novbaharım qandadır.

Ey məni təmkinü, səbrü taqət üçün mən` edən,
Gör mənim təskinim, aramım, qərarım qandadır.

Novbahar, əzbəs ki, biqədrəm fəramuş eyləmiş,
Daneyi-bihasiləm, bərqü baharım qandadır.

Yollar üstə bəs ki, pamal olmuşam, hiç olmuşam,
Əl götür, ey sərsəri-hicran, qübarım qandadır.

Var təqsirim, bəli, Qövsi, məni mə`zur tut,
Mən əsirəm öz əlimdə, ixtiyarım qandadır.

* * *

Badeyi-vəhdət içən aləmi-meyxanə bilir,
Fələkin gərdişini gərdişi-peymanə bilir.

Tifli-əşkim qərəzin aqil olan fəhm etməz,
Bu uşaqlar dilini aşiqi-divanə bilir.

Doludur bəski nifaq ilə cəhan, sahibdil
Aşina surətini mə`niyi-biganə bilir.

Xalü xət seyrinə, zinhar, könül bağlama kim,
Damdır ol ki, anı əhli-həvəs dana bilir.

Bu gün ol şəm`i ki, mən mərdümi-çeşmim bilirəm,
Safi-müjganımı balü pəri-pərvanə bilir.

Cigərim qanını saqi meyi-gülfam sanır,
Təpişi-dil səsini naleyi-məstanə bilir.

Hər kişi eşq ilə pürxaş elə bilməz, Qövsi,
Kim ki, bir ömr yanıbdır, bu oda yanə bilir.

* * *

Mənü məhəbbətü yüz rəng binəvalıqlar,
Sənü rüunətü neyrəngü dilrübalıqlar.

Hənuz xanəxərabəm, həman təhidəstəm,
Yolunda hər nə qədər eylədim gədalıqlar.

Şərabi-nabə, gözüm verdi bir rəvac axır
Ki, oldu zahidə həm eyb parsalıqlar.

Fəğan ki, ahuyi-məqsud bəs ki, vəhşidir,
Kəməndi-naləvü ah etdi narəsalıqlar.

Vəfavü mehr əgər yarə qatı müşkildir,
Yüz oncadır mənə düşvar bivəfalıqlar.

Yetişdi bir yerə sevdayi-eşq ilən Qövsi
Ki, yüz min il edə Məcnunə müqtədalıqlar.

* * *

Qəradır rüzigarım, rüzigarım handadır sənsiz,
Xəzan pamalıyam, zövqi-baharım handadır sənsiz.

Məni-bitabdən gəh səbr umub, gəh taqət istərsən,
Mənim, ey səngdil, səbrü qərarım handadır sənsiz.

Deyər canan, təriqi-əql tut, səbr ixtiyar eylə,
Deyin məndən ana kim, ixtirarım handadır sənsiz.

Vücudim gərçi olmuşdur qübari-xatirin, əmma
Mənim, ey gözlərim nuri, qübarım handadır sənsiz.

Anın kuyinə həm, Qövsi, xəbərsiz getmənəm səndən,
Mənim cənnətdə, ey qafil, qərarım handadır sənsiz.

* * *

Günüm gecəm kimi peyvəstə qarədir sənsiz,
Gözüm çırağı, gözüm hiçkarədir sənsiz.

Cəhanda rəml ilə gənc axtaran həris kimi,
Mənim təmam işim istixarədir sənsiz.

Səninlə həm bu imiş qismətim, sanurdum kim,
Mənə nəsib dili-parə-parədir sənsiz.

Əcəb ki, mərhəmi-kafuri-vəsl ilən bitsin,
Bu növ kim, cigərim başi yarədir sənsiz.

Nə növ Qövsiyi-məhcur yanmasın gecələr
Ki, hər sitarə ana bir şərarədir sənsiz.

* * *

Zə`f ilə gərçi qönçələnibdir sitarəmiz,
Əflak xirməninə urar od şərarəmiz.

Qaş ilə göz dilini bilən əhli-dil bilir
Kim, bir kitab söz başıdır hər işarəmiz.

Aylar keçər ki, şəm`i-vüsalini bulmanuz,
Bu il bizi nə günlərə saldı sitarəmiz.

Hər bəxyənin gözü bizə bir çeşmi-zəxmdir,
Tutdum ki, bəxyə etmək ilə bitdi yarəmiz.

Bülbüllərə xəzanda verin müjdə kim, tutar,
Gül yaprağı yerin cigəri-parə-parəmiz.

Zinhar, bəxyəsini çox incitmə kipriyin,

Dönməz qılıclar ilə yüzündən nəzarəmiz.

Gər yar sərgiran ola, gər çərx biaman,
Biçarəlikdən özgə nədir daxi çarəmiz.

Gər lalə bitsə qəbrimiz üstündə, raziyüz,
Yarəb ki, bitməsin bu bizim qanlu yarəmiz.

Qövsi, əgərçi eyləmədin ərzi-hal ana,
Bəsdir bizə gər anlayan olsa işarəmiz.

* * *

Hərçənd qəmi-eşqi nihan eyləmək olmaz,
Fəryad ki, fəryadü fəğan eyləmək olmaz.

Təlx eylər idim göz yaşı ilə meyi-nabi,
Əhbabə bu qan olmuşu qan eyləmək olmaz.

Hərçənd edir göz görə rüsva məni ağzın,
Heç nəstə bu məhcubə güman eyləmək olmaz.

Ol navəki, ey sineyi-suzanım, əritdin,
Yaxşilərə bidərd, yəman eyləmək olmaz.

Ta olmaya bu nəqdi-dilü cani-mühəqqər,
Ol sərvin ayağinə rəvan eyləmək olmaz.

Nola ki, ləbi-ləlinə canın verə Qövsi,
Can tərkini, ey cani-cəhan, eyləmək olmaz.

* * *

Arizin ayineyi-giytinümadən saxlamaz,
Saf olan öz sirrini əhli-səfadən saxlamaz.

Saxlar oldu hər həvəsdən könlümü eşqin sənin,
Gərçi hərgiz şəm fanusi həvadən saxlamaz.

Öz gözündən mən kimi hər dəm içər xunabələr
Kim ki, razın pərdələrdə aşinadən saxlamaz.

Kakili başində zənciri-bəladır, neyliyim,
Bir bəladır bu ki, öz başin bəladən saxlamaz.

Zülf tək axır yetər bir yerdə hər bibak kim,
Yüz əl ilə başini ol xaki-padan saxlamaz.

Xəttin əyyamında könlüm nalədən fariq degil,
Bu xəzan ol pərdədə məsti nəvadən saxlamaz.

Mahvəşlərdən neçün mən könlümü pünhan tutum,
Heç kim, ayinəsin, Qövsi, səfadən saxlamaz.

* * *

Əgərçi şəm kimi şö`lə-şö`lə od yemək olmaz,
Fəğan ki, eşq sözün hiç kimsəyə demək olmaz.

Şərabi xuni-cigər dəf`inə nə faidə sənsiz,
Boyun bəlasın alım, qanı qan ilə yumək olmaz.

Səbayə qönçə kimi dil açardım ah, nə hasil
Ki, hər ötən-yetənə ol ki vardır, demək olmaz.

Onu görəndə könüldən, gözüm, nə qüvvət umursan
Ki, böylə öz gününə qalan özgəyə kömək olmaz.

Sənin yanında əgər öz sözini bilməyə Qövsi,
Anınladır həq, doğrusu, həqdən incimək olmaz.

* * *

Şikəstə könlümü sübhi-vüsali-yar açmaz,
Neçün ki, qönçeyi-təsviri novbahar açmaz.

Mənə deyən ki, təsəlli verir gül ol yüzdən,
Yeri ki, könlümü nirəngi-laləzar açmaz.

Açıldı hər xəsü xarın dili, fəğan ki, hənuz,
Bu bülbülün dilini cuşi-novbahar açmaz.

Qədin həlakiyəm, ey xoşkəmər, nelim çəməni
Ki, öz girehlərini sərvi-cuybar açmaz.

Qəfəsdə balü pərim vari sındı cövhər tək,
Niqabin üzdən ol ayineyi bahar açmaz.

Qəmində şeşdərə düşdüm-ədəm qapusını həm
Mənə mürüvvət edib çərxi-bədqumar açmaz.

Göyərdi rigi-rəvan, neylədim məgər, yarəb
Ki, danəmin girehin əbri-novbahar açmaz.

Nə gündür ol ki, sənin həsrətində əbri-bahar,
Mənə tərəhhüm edib çeşmi-əşkbar açmaz.

Varə-varə bədənim göz-göz oldu dam kimi,
Hənuz ayağımı zənciri–intizar açmaz.

Gözüm, haçan açılır ağzı bülbülün sənsiz
Ki, qönçənin dilini cuşi-novbahar açmaz.

Açıldı tiğin ilə sinələr, nə sözdür bu
Ki, heç kimin yüzünə qapu ruzigar açmaz.

Gireh açılmaz imiş bir əlilə, əfğan kim,
Könül dügünlərini çərx açarsa, yar açmaz.

Rəqib çün gəlir ol kuydən, əcəbdir kim,
Tutulmuş öylə ki, ağzını zülfiqar açmaz.

Zəbanım açmaq üçün açma, ey rəqib ağzın
Ki, qönçə qıflını növki-kəlidi-xar açmaz.

Ədəm diyarını hər bir nəfəsdə yad et kim,
Qərar bağlamaz ol qapunı, qərar açmaz.

Bu gün mənim gözü könlümdən ayrı dövri-fələk,
Nə qapu ola ki, leyl örtməzü nəhar açmaz.

Deyin mənim pərü balimdən özgə gülşəndə
Nə qönçədir ki, xəzan tökməzü bahar açmaz.

Qarınca öz qədərincə dərər, yığar, dağıdar,
Həmin mənim əlimi dövri-ruzigar açmaz.

Sözümi yar nə bilsin ki, bu şikətsə zəban
Anınla söz başı həm açsa, ol ki, var açmaz.

Baxa-baxa qalıram şəm tək qiyamətədin,
Əgər mənim dilimi mürvət ilə yar açmaz.

Dönə-dönə məni ha, ey sipənd, yandırdın,
Məgər mənim dilim ol atəşin üzar açmaz.

Əgərçi nalə ilə açdı min könül Qövsi,
Fəğan ki, ney kimi öz üqdəsi ki, var, açmaz.

Fəğan ki, bir gecə, ey mah, şəm tək Qövsi,
Sənin cəmalına çeşmi-ümidvar açmaz.

Yumunca açmazu açmaz, fəsanədir, Qövsi,
Nə müşkil ola cəhanda ki, kirdgar açmaz.

* * *

Möhnətimdən mənim ol məst xəbərdar olmaz,
Özü öz daminə səyyad giriftar olmaz.

Nə qədər uymuş ola, düşməni-dirin yekdir,
Qara bəxtim yuxudan şükr ki, bidar olmaz.

Zahirən kim, gözü görməz fələki-xunxarın
Məni bu gündə görən böylə sitəmkar olmaz.

Ey rəqib, eyləməz iqbal sənə könlüm alan,
Yusifi hiçə alan divə xəridar olmaz.

Olmadım bağdə bülbüllər ilə həmdəstan,
Bəli, söz anlayana cür`əti-göftar olmaz.

Xarlıqdan çəkinin, çəksin özündən ətəgin
Kim, olan öz gözünə xar, daxi xar olmaz.

Eşqü pərvanə nə sözdür bu ki, aşiq Qövsi,
Can verir öylə ki, cananı xəbərdar olmaz.

* * *

Hansı gündür kim, təğafül bağrımı qan eyləməz,
Ol ki, vəsl eylər mənə, əğyarə hicran eyləməz.

Cism evində eşqsiz canı xətadır saxlamaq,
Kimsə fanus içrə şəm mərdə pünhan eyləməz.

Sən degilsən yalqız, ey bidadgər könlüm yıxan,
Bu xərab olmuş evi kimdir ki, viran eyləməz.

Badeyi-gülrəng ayağında verirsən xuni-dil,
Sən edən bidadi, saqi, dövri-dövran eyləməz.

Qönçə ta açılmaya, avarə olmaz bağdən,
Çeşmi-bidar etdigin xabi-pərişan eyləməz.

Çün görər şagird nəqsin əhli-dil ustaddən,
Saqiyi-xunxar eylər hər nə dövran eyləməz.

Ta könül vardır, nə lazım çərx bidad eyləyə
Kim, bu qətrə eyləyən tüğyani-tufan eyləməz.

Aşiqəm, zahid, məni məzur tut kim, hiç kim
İxtiyar ilə vidai-əqlü iman eyləməz.

Kə`bə ikən eylədim bütxanə viran könlümü,
Bəs nəçün tə`mirimi ol namüsəlman eyləməz.

Ah, bir naşi təbibin olmuşam bimari kim,
Hər nə istər eylər, əmma dərdə dərman eyləməz.

Mən` edirsən Qövsini, ey şaxi-gül, fəryaddən,
Xansı bülbüldür ki, bu gülşəndə əfğan eyləməz.

* * *

Ərşdən ötdü, eyləməz yarə əsər fəğanımız,

Bir yerə yetsə yaxşıdır naleyi-natəvanımız.

Dillərə dəmbədəm salıb odlara yandırır bizi
Ah ki, daş bağırlıdur ahi-şərərfəşanımız.

Təng tutan bizə könül ol əgər, ol dəhan imiş
Hiç yox idi zərrəcə onlara bu gümanımız.

Vəsfi-ləbində yüz verir mə`niyi-heyrət öylə kim,
Möhrlənir dəhanımız, qönçələnir zəbanımız.

Saqiyi-sərdmehr əgər könlü bizimlə düz degil,
Biz yenə oni istərüz, qaynar anınla qanımız.

Bəxti-bədü zəbuni gör, talei-vajguni gör,
Hər kimə yaxşı söylərik, oldu bizim yəmanımız.

Aşiq olanların bizə Kə`bətək iqtidası var,
Gər həvəs əhli dinləməz namimizü nişanımız.

Başin üçün gəl, ey fələk, var, yaxamızdan əl götür,
Bəsmi degil bu kəşməkəş, zalim, üzüldü canımız.

Qoymaz anınla dərdi-dil etməgə, iztirabi-dil
Neylim oni ki, odludur şəm kimi zəbanımız.

Ol səri-kuydən xaçan getmək olur ki, hər zəman
Əşk öpər rikabımız, zə`f tutar inanımız.

Kimdir olan hərifimiz kim, bizim oldu eşqdən

Qəddi-düta kəmanımız, ərşi-bərin nişanımız.

Dərdimizə dəva yetər bu ki, təbib söyləyə
Qövsiyi-bizəbanımız, xəsteyi-natəvanımız.

* * *

Yan eşqlə kim, eşqdə nəqsü zərər olmaz,
Ol bəhrdə tufan olur, əmma xətər olmaz.

Didarına əzbəs ki, gözüm təşnəcigərdir,
Dəryalər ilə daməni-müjgani tər olmaz.

Pərvaz edərəm tiğ ilə gər başimə düşsə,
Hərçənd ki, aşiqdə dil olmaz, cigər olmaz.

Şəbnəm nola gər güllərə iqbal edə sənsiz,
Hər dideyi-tər sahibi-sahibnəzər olmaz.

Gər meyli-kəbab etsə gözüm nərgisi-məstin
Kimdir ki, od olmaz, nəmək olmaz, cigər olmaz.

Hərçənd qulaq olmaya heç kim sənə, ey ney,
Sən naləvü ah et ki, əsər biəsər olmaz.

Qövsi, nə gedirsən səri-kuyində özündən,
Aşiqdə səri-seyrü həvayi-səfər olmaz.

* * *

Ney kimi kirdarimiz, bəndindədir göftarımız,
Qulluğa bel bağlamağdır qövlimiz, ilqarımız.

Bimürüvvətlik yıxar xəlqi, mürüvvət bizləri,
İstəsə viran edə, yapsın bizi me`marımız.

Ey təbibi-xürdəbin, gər dərdimiz çoxdur, vəli
Əhli-halız, bir işarətdir bizim göftarımız.

Tökmənüz yüz suyini dünyavü mafiha üçün,
Sikkəmiz vardır, əgər yoxdur bizim dinarımız.

Gənci-badavər kimi, ey ney, bu viran dəhrdə,
Gərçi bimiqdarıq, əmma həq bilir miqdarımız.

Gərçi yoxdur naleyi-məstanəmiz bülbül kimi,
Biz xərabət əhliyüz, olmaz bizim hüşyarımız.

İntizari-bimürüvvət etdi viran səbr evin,
Bilmənəm neyçün unutmuşdur bizi memarımız.

Rəngi zərdü əşki-sürxi bizdən al, bina isən,
İmtəhan lazim degil, çün aridir dinarımız.

Cövhəri-puşidəmiz ayinə bağrın ab edər,
Çöhrədən, Qövsi, bizim aritsələr zingarımız.

* * *

Olur hərçənd can şirin, vəli canan yerin tutmaz,

Bir, iki, üç nəfəs bir ömri-cavidan yerin tutmaz.

Məni bülbüllər ilə bir tutan bidərd bilməzmi
Ki, yüz min bülhəvəs bir aşiqi-heyran yerin tutmaz.

Meyi-gülgun, şəbi-hicran nə keyfiyyət verir, saqi,
Ki, sənsiz çeşmeyi-heyvan bir avuc qan yerin tutmaz.

Əgər yüz min xiyaban şaxi-gül səbz olsa gülşəndə,
Yeri, ey bağban, ol sərvi-xoşgövlan yerin tutmaz.

Nə hasil möhnət arturmaq, nə lazım dərdi-sər çəkmək,
Təbib, ol dərdi-bidərman məgər dərman yerin tutmaz?

Könül hərçənd aliqədar olursa, mehrin ə`ladır,
Sədəf qəltan həm olsa, gövhəri-qəltan yerin tutmaz.

Sənə ərzani, Qövsi, ağız açmaq, gülmək, açılmaq
Ki, yüz mərhəm mənim zəxmimdə bir peykan yerin tutmaz.

* * *

Səndən nə gündür, ey məh, mehrin çırağı yanmaz,
Kərdun qərar tutmaz, ta başına dolanmaz.

Aşiq təhəmmül eylər yüz versə yüz həvadis
Kim, bəhri-pakkövhər seylabdən bulanmaz.

Hərçənd eylərəm mən izhari-dərd, əmma
Bibakdir təbibim, bilsəm daxi inanmaz.

Ey Kuhkən, çox etmə izhar zuri-bazu
Kim, eşq arxa versə, yüz Bisütun dayanmaz.

Ta saldı xəlqə pərtöv, ey şaxi gül, füruğun,
Bülbül gülü unutdu, pərvanə şəm`i anmaz.

Hər kim, öz işin işlər, hərçənd müşkil olsa,
Dövri-fələk anınçün bidaddən usanmaz.

Neyçün anın yanında bir dəm göz açmanam mən,
Gər bigünah Qövsi məhşər günü utanmaz.

* * *

Deyərlər kim, əlaci-dərdi-pünhan eyləmək olmaz
Olum ol dərd qurbani ki, dərman eyləmək olmaz.

Firəngi özgədir, ey bərhəmən, əmma bizim yerdə,
Müsəlmanzadələr var ki, müsəlman eyləmək olmaz.

Gəlir müşkil mənə yüz qəmcə bir qəm dəf`i könlümdən
Bəli, heç kafərin cəm`in pərişan eyləmək olmaz.

Edərdim sən kimi, ey qönçə, mən həm razi–dil pünhan,
Fəğan kim, çareyi-çaki-giriban eyləmək olmaz.

Könül bir qətrə qandır eşq bidadın yaşursunmu,
Gözüm, bir qətrədə bir bəhr pünhan eyləmək olmaz.

Olubdur eşqdən zirü zəbər könlüm, nə sözdür bu,
Ki, hiç viranəni bir daxi viran eyləmək olmaz.

Yolunda Qövsi əzbəs kim, zəmingirü zəif olmuş,
Sənin qurbanın, ey sərvi-xüraman, eyləmək olmaz.

* * *

Yerdən məni hər sərvi-xüraman edə bilməz,
Hər çöhreyi-gülgun cigərim qan elə bilməz.

Hər cilveyi-məstanə məni əldən aparmaz,
Hər seyl bu viranəni viran edə bilməz.

Könlüm ki, sənin zülfün ucundan asılıbdır,
Hər türreyi-tərrar pərişan edə bilməz.

Qismət məni bir vadiyi-xunxarə salıbdır
Kim, mur işini onda Süleyman edə bilməz.

Didarını gördükcə anın, rəğbətim artır,
Vəsl eyləyəni aşiqə hicran elə bilməz.

Neylər xəti-müşkin güli-rüxsarına yarın
Kim, pərdeyi-şəb şöləni pünhan edə bilməz.

Qövsi çəkə bilməz nəfəs ol şəm yanında
Gər çəksə nəfəs, naləvü əfğan edə bilməz.

* * *

Fəğan kim, məddi-ahim nəxli-səbz olmaz, səmər verməz,
Oyanmaz kövkəbi-bəxtim, nihali-ömr bər verməz.

Əgərçi raz babindən mənimlə ağız açmazsan,
Nə sözlər kim, mənə çeşmi-siyəhməstin xəbər verməz.

Səgi-kuyilə cananın tutardım üns, bilsəydim
Vücudimdən zərər yetməz, fəğarım dərdi-sər verməz.

Necə agah olum dildarımın hali-dilindən kim,
Mənə öz könlüm əhvalından ol kafər xəbər verməz.

Degil mümkün dolanım başinə pərvanə tək yarın,
Özü ta şəm tək dilgərmlikdən balü pər verməz.

Dili sədparəmi müjganların rüsvayi-xəlq etdi,
Bu sözdür ki, gülə xar ilə yar olmaq zərər verməz.

Fəğanimdən mənim hərçənd yetməz kimsəyə nöqsan,
Səgi-kuyinə cananın nə gündür dərdi-sər verməz.

Sənin  yadınla bəs kim, aşinayəm, dustim oldur.
Ki, düşmən tək mənim adım aparmaz, dəri-sər verməz.

Qəmi-əyyamdən Qövsi olur diltəng, bilməzmi,
Kimə kim dərd verməz xazini-hikmət, əsər verməz.

* * *

Xət mənim qətlimdə gər yüz tutsa, tə`xir eyləməz,
Düşsə fürsət çeşmi-məstin hiç təqsir eyləməz.

Gər umarsan əql məndən, bəs neçün etdin əsir,
Aqili hiç tifl, hiç divanə zəncir eyləməz.

Qafil eylər şəm feyzi-pərtövi-məhtabdən,
Şükr kim, viranəmi me`mar tə`mir eyləməz.

Çəkmənəm hərgiz nəfəs kim, məddi-dudi-ahimi,
Natəvanlıq şəm`i-müflis tək nəfəsdir eyləməz

Öylə kim, ram eyləmiş ol çeşmi-sahir könlümü,
Hiç ahu sadədil Məcnuni təsxir eyləməz.

Sərfə yoxdur aqibətbinlikdə, ey ərbabi-əql
Kim, təvəkkül eyləyən imdadi, tədbir eyləməz.

Könlünü yıxmaqda, Qövsi, bülbüli-biçarənin
Bağbani-bimürüvvət hiç təqsir eyləməz.

* * *

Mənim hərçənd bir gün halımı ol bixəbər sormaz,
Nə gündür kim, icabət qapusın ahi-səhər sormaz.

Əgər əldən-ayaqdan getməyib hüşyardır saqi,
Neçün, yarəb, özündən bixəbərlərdən xəbər sormaz.

Günün məşhuri-afaq olduğu bürhani-rövşəndir
Ki, dəstari-zər istər xəlqi-zahirbin, hünər sormaz.

Özünçün göstərir ayinəsindən surətin mə`ni,
Bu yüzdən kimsənin əhvalini sahibnəzər sormaz.

Əgər dərvişdən sormaz qəni, bica degil, Qövsi,
Neyin ta bərgi vardır, binəvalərdən xəbər sormaz.

* * *

Yüz hüsn dilü dideyi-heyranə yetişməz,
Yüz gənc həqiqətdə bu viranə yetişməz.

Yüz bağü bahar olsa, mənim könlüm açılmaz,
Fəryadimə ta naleyi-məstanə yetişməz.

Ol atəşi-suzanə nə hasil yavuq olmaq,
Ta yanmaya, məqsudinə pərvanə yetişməz.

Ey bülbüli-nadan, bu nə ahü nə fəğandır
Kim, bir yerə fəryadi-zəifanə yetişməz.

Gər yetməsə bülbül mənə, ey gül, əcəb olmaz
Kim, şaxi-gül ol sərvi-xüramanə yetişməz.

Bidərd, mənə müjdeyi-dərman nə verirsən,
Qoy mən ölüm ol dərdə ki, dərmanə yetişməz.

Ey əbri-tünükmayə, məni sanma təhidəst
Kim, bəhri-göhər dideyi-giryanə yetişməz.

Dünyadə həris olma, unut əqlü məaşın
Kim, mur bu vadidə Süleymanə yetişməz.

Ol çeşmi-siyəhməsti görən kimsə bilir kim,
Yüz tiri-qəza navəki-müjganə yetişməz.

Gər yandura öz varını pərvanə, rəvadır,
Kimdir ki, qaranlıq gecələr canə yetişməz.

Təbriz açar könlümü, Qövsi, gər açılsa,
Hərçənd ki, firdovsi-Sifahanə yetişməz.

* * *

Aldı məndən aqibət can nəqdin ol əyyar göz,
Zalimü xunriz müjgan, kafəri-xunxar göz.

Öylə kim, mən bir zəman səndən götürməm könlümi,
Lütf elə, məndən götürmə sən daxi zinhar göz.

Ey deyən kim, xəlq ilə xəndan gərəkdir adəmi,
Mən tutum kim, güldüm, açıldım, vəli ağlar göz.

Neyləsin, gər giryeyi-pünhanə məşğul olmasın,
Çünki qalmış sənsiz, ey göz mərdümi, bikar göz.

Dərd çəkmişlər bilirlər əhli-dərdin halini,

Vəchi oldur kim, təbibimdir mənim bimar göz.

Türfə kim, əfzun olur meylivü artar rəğbəti,
Bigünahlər qanini içdükcə ol xümmar göz.

Getmənəm meyxanədən, ta cami-mey gərdişdədir,
Olmanam hüşyar, saqi, olmadin hüşyar göz.

Kimsə olmaz qan bilə sərxoş şərabi-nabdən,
Qan ilə guya siyəhməst oldu ol xümmar göz.

Bir işarətdir sipehrin sabitü səyyari kim,
Şamlər, Qövsi gərəkdir sübhədin bidar göz.

Bu həman rə`na qəzəldir kim, Nəvai söyləmiş:
"Sürməgün tünadə hicran şami tut bidar göz".

* * *

Görmənəm bir həmnəfəs, ta eyləyim, izhar söz,
Yoxsa kim, ney tək mənim sinəmdə həm çox var söz.

Doğru söz hər kimsəyə təsir edər, naseh, vəli,
Aşiqi məst eylərü aqilləri hüşyar söz.

Sərfəsizdir gövhəri israf ilə sərf eyləmək,
Ta zərurət düşməyincə söyləmən, zinhar, söz.

Hikmət ögrən, uyma hər əfsanəyə zinhar kim,

Həm yuxuni artıq eylər, həm qılır bidar söz.

Mən onunçün göz götürməm çeşmi-məstindən anın
Kim, mükərrər andırır ima ilə bimar söz.

Dideyi-binurdir tə`sirsiz göftar kim,
Gövhəri-qəltan əsərdir, əbri-gövhərbar söz.

Bülhəvəs nəzarəsindən mən də fəryad etmənəm,
Söz bilən yanında həmvar olsa nahəmvar söz.

Acı ağız yeg bilir qəndi-mükərrər qədrini,
Etməsin məndən diriğ ol lə`li-şəkkərbar söz.

Hər nigahından gözün bir özgə mə`ni anlanır
Kim, pərişanü müşəvvəş çox deyir bimar söz.

Hiç dil ilə şəm başdan eyləməz pərvanəni,
Eyləmə zaye mənə, ey atəşin rüxsar söz.

Bizəbanlıq eylədi aləmlərə rüsva məni,
Ol rəviş kim, özgələr ərzin qılır izhar söz.

Gövhəri-sirabi etməzlər xəzəfdən imtiyaz,
Yoxsa dəryalərcə, Qövsi, qətrələrdə var söz.
Han sözün səncidə qıl, Qövsi, Füzulidən eşit:
"Kim nə miqdar olsa, əhlin eylər ol miqdar söz".

* * *

Üşşaq nərgisindən onun can əsirgəməz,
Dərd anlayan həqiqəti dərman əsirgəməz.

Bir qapu bağlayan birini bigüman açar,
Saqi şərab əsirgər isə, qan əsirgəməz.

Ey hərzə can çəkən, sən əgər doğru söyləsən,
Səndən əziz canını canan əsirgəməz.

Həqqa, bilürsə kim nə qədər könlüm açılır,
Məndən təbəssüm ol güli-xəndan əsirgəməz.

Saqi, mənə sən etməginən nazi-bisəbəb,
Gər xuni-dil murad isə, dövran əsirgəməz.

Zahid əgər müzayiqə eylər, nə bak kim,
Bizdən kərimi-rövzeyi-rizvan əsirgəməz.

Ey kafəri-firəng, büti-brəhmən kimi,
Qövsi yolunda din deməz, iman əsirgəməz.

* * *

Ta gözüm var, könlüm əglənməz mənim dildarsız,
Bitəkəllüf, dustlər, gün görmək olmaz yarsız.

Eşqsiz arami-dil hərgiz mənə mümkün degil,
Öylə kim, tə`mir surət bağlamaz me`marsız.

Şəmsiz pərvanə, gülsüz bülbülün arami yox,
Gör nədir halim mənim ol şəm`i-gülrüxsarsız.

Dərdü qəm qədrin bilən arif bilir, kim dəhrdə,
Ahi-atəşbarsız bir nəxlə oxşar barsız.

Safdillərdən əgər çəksəm xəcalətlər nola,
Mən ki, bir gün görmədim ayinəmi zəngarsız.

Sinə bidağü gözüm biəşk mümkündür qala,
Qalsa gərdun səfhəsi sabitsizü səyyarsız.

Aşiqi-sərgəştəyiz, hərcayidir mə`şuq kim,
Bigüman xət istiqamətsiz düşər pərgarsız.

Padşahəm daği-dil toğrayi-fərmanım mənim,
Sikkəsiz sanmın məni, hərçənd olam dinarsız.

Halımı canan nə bilsin kim, onun bəzmində mən,
Qalmışam surət kimi göftarsızü kirdarsız.

Dustlər, təqrirə sığmaz razi-pünhanım mənim,
İstərəm bir dil bilən, dərd anlayan izharsız.

Hər kimin, hiç olmasa, öz könlü öz qəmxarıdır,
Yox mənimtək qəm günü aləmdə bir qəmxarsız.

Gör budur hicran odu kim, Qövsinin canındadır
Hiç kafər qalmasın aləmdə, yarəb, yarsız.

Bu həman rə`na qəzəldir kim Füzuli söyləmiş:
“Pənd çox verdim, eşitməz, arsızdır, arsız”.

* * *

Ömrlərdir sədri-əshabi-məhəbbət bəklərsiz,
Padşahiz, məsnədi-ərbabi-dövlət bəkləriz.

Eşqimiz şüğlin məcazi sanma kim, mənidə biz,
Mərifət kəsb etməyə bəzmi-həqiqət bəklərimz.

Gəh, vüsalindən baharistani-söhbət guşəsin,
Gəh xəyalindən nigaristani–xəlvət bəkləriz.

Nam üçün biz keçməniz namusdən ənqa kimi,
Guşeyi-bituşeyi-Qafi-qiyamət bəkləriz.

Gər qubaraluddur ayinəmiz, eyb etmə kim,
Asiyayi-çərxi-pürgərd içrə növbət bəkləriz.

Biz anınçün zəxmi-bidadınla fəryad etməniz,
Kim, kəminü rüsxətü meydani-fürsət bəkləriz.

Bir nigah ilən bizi rəhm et, götür toprağdən,
Çün səri-rahində biz xaki-məzəllət bəkləriz.

Xah kuyin, xah xaki-asitanın kim, yüz il
Hər yerə qılsan işarət, canə minnət bəkləriz.

Şəm tək hərçənd birdir vəhdətü kəsrət bizə,

Versələr töfviq bir gün, künci-üzlət bəkləriz.

Nəqş der ayineyi-ixlasə kim, axır nəfəs,
Asitani-həzrəti-şahi-vilayət bəkləriz.

Qövsi, ol rə`na qəzəl keyfiyyətindəndir bu kim:
"Ey Füzuli, biz olar yatdıqca söhbət bəkləriz".

* * *

Aldı hicran canimi, canan məgər can istəməz,
Axır öz murün məgər bir gün Süleyman istəməz?

Mən tutum kim, eşqi-dəryadil mənimlən yağıdır,
Düşmənin ərbabi-himmət böylə viran istəməz.

Bir təbibi kim, əsirgər özgədən dərmanını,
Zahirən öz dərdinə aləmdə dərman istəməz.

Lütf qıl, yarəb, ona sən bir vəfavü mehr ver,
Yoxsa ol kafər özün hərgiz müsəlan istəməz.

Baxma, zahid, xublər rüxsarinə kim, çeşmi-məst
Əqlü huşi müftə almaz, dinü iman istəməz.

Olmuşam bir yağiyi-dilbilməzin dustaği kim,
Bağrımı qan etmək istər, çeşmi-giryan istəməz.

Mən onun cəm istərəm gül qönçəsi tək xatirin,

Ol mənim tək sünbüli-zülfün pərişan istəməz.

Yüz lövün məzmun onun hər nöqtəsindən bəllidir,
Məhzəri-ərbabi-dərdü dağ ünvan istəməz.

Yar əgər, Qövsi, səri-kuyində cavidan səni,
İstəsə bica degil, kimdir ki, mehman istəməz.

* * *

Bəzmi-vüsal rövzeyi-rizvanə bənzəməz,
Hicran odu heç atəşi-suzanə bənzəməz.

Qəddin həlakiyəm, nə gedim gülsitanə kim,
Hər şaxi-gül bu sərvi-xüramanə bənzəməz.
Pərvanə yar başinə küstax dönməsin
Kim, aftab şəm`i-şəbistanə bənzəməz.

Bilməm nədir piyalədə, ey həm piyalə kim,
Səhbayə rəngi oxşamazü qanə bənzəməz.

Hərçənd görmədimsə, eşitdim həvasini,
Kuyin səfadə rövzeyi-rizvanə bənzəməz.

Ayinə özgədir, dili-divanə özgədir,
Hər şişəparəyə bu pərixanə bənzəməz.

Qövsi, təəmmül eylə, söz ülfət tutunca kim,
Ahuyi-Çinə mə`niyi-biganə bənzəməz.

* * *

Kə`bədən xəlq ötdülər, səhranəvərdəm mən hənuz,
Buldu aləm qürbi-mənzil, durkərdəm mən hənuz.

Ol Məsihadən təmam əmvat əhya buldular,
Vay, yüz min vay kim, pamali-dərdəm mən hənuz.

Hər kəfi-xak oldu ərbabi-nəzərdən kimya,
Sərsəri-dövran önüncə müşt xakəm mən hənuz.

Oldu İsa həminan xurşidi-aləmtab ilə,
Vadiyi-təcrid qət etməkdə fərdəm mən hənuz.

Düşdülər Rüstəmsifətlər xakə Zali-çərxdən,
Böylə xunxar ilə, Qövsi, həmnəbərdəm mən hənuz.

* * *

Nə yalquz məndən ol sərvi-rəvan ötgəc, rəvan qalmaz
Ki,gər mən gördügüm canan gəlir,hiç kimdə can qalmaz.

Şəbi-hicran bu bidad ilə gər yəğmayi-can eylər,
Gəlir bir gün ki, aşiqdən, gözüm, namü nişan qalmaz.

Əgər artar bu yüzdən günbəgün eşqin təbü tabi,
Səninçün, ey hüma, məndən bir avuc üstüxan qalmaz.

Bu il, yarəb, nolur bixaniman bülbüllərin hali

Ki, heç gülşəndə naləm şö`ləsindən aşiyan qalmaz.

Bu hami xal vardır yar rüxsarında, heyranam
Ki, gün ta gərm olur gülşəndə, şəbnəmdən nişan qalmaz.

Bilirsə könlümün halini yüz biltablıq qılsam,
Mənim təqsirimə, əlbəttə, ol arami-can qalmaz.

Nə babət var, tutar Qövsi kimi damanın, əl çəkməz,
Mənim müşti-qübarım yerdə, ey sərvi-rəvan, qalmaz.

* * *

Nüktəpərdaz ləbi-meygun nəfəs çağ eyləməz,
Qaməti-mövzun görən, mövzun nəfəs çağ eyləməz.

Gah olur sərsər bu səhradə və gahi girdbad,
Yetməyincə Leyliyə Məcnun, nəfəs çağ eyləməz.

Çərx altından çıxar bir yanə cani-binəfəs
Kim ki, bilmiş əbrəşi-gərdun, nəfəs çağ eyləməz.

Eşq bazusindədir əbru kəmanlar qüvvəti,
Olmayınca Kuhkən gülgun, nəfəs çağ eyləməz.

Əvvəlü axır olur dünya sevən dünyayə sərf,
Qarə yer altında həm Qarun nəfəs çağ eyləməz.

Olmayınca badə safü rak, düşməz cuşdən
Kim, xümi-gərdundə Əflatun nəfəs çağ eyləməz.

Qət`i-rahi-eşqdə Qövsi nəfəs çağ eyləsə,
Oddaki na`leyn urar varun nəfəs çağ eyləməz.

* * *

Gərçi qoymaz çəkməgə kamimcə dövran bir nəfəs,
Mən həman nuş eylərəm mey bir nəfəs, qan bir nəfəs.

Çün şərərlər var ki, işlər bərqi-bizinhar işin,
Yandırar bir ömr, hərçənd olsa hicran bir nəfəs.

Ey ki, daim badeyi-gülrəngdən sirabsən,
Nəş`ə istərsən mənimlə içginən, qan bir nəfəs.

Ey nəsimi-nalə, ol xunxar, gəlmək çağıdır,
Eyləmə övraqi-tərkibim pərişan bir nəfəs.

Şəm`ə hər dəm yandın, ey pərvanə, gördün ləzzətin,
İmtəhan üçün bizim odlarə həm yan bir nəfəs.

Göz yumub açincə vari tarü püdüm yandırar,
Ah, əgər iqbal edə ol bərqi-cövlan bir nəfəs.

Özgələr ney tək edərlər nalələr, fəyradlər,
Qoy çəkim mən daxi, ey gərduni-gərdan, bir nəfəs.

Canə yoxdur nisbətin, ey dərdi-bidərman, sənin
Sən həyati-cavidansən, olsa gər can bir nəfəs.

Gülşəni-icad içində qönçeyi-təsvir tək,
Kim görübdür Qövsiyi-məhzuni xəndan bir nəfəs.

* * *

Lə`lin verir həyat, alır can nəfəs-nəfəs
Kim, bad cür`ə-cür`ə verir, qan nəfəs-nəfəs.

Yox məndə tab, verməz işığ riştə tabsız,
Bihudə yandırır məni dövran nəfəs-nəfəs.

Mizani-hüsn meyl edə bir yanə heyfdir,
Ver ləhzə-ləhzə dərdimə dərman nəfəs-nəfəs.

Aç dəstə-dəstə kakili-müşkini mubəmu,
Üşşaq cəm`in eylə pərişan nəfəs-nəfəs.

Gün intizarı gözlərimi məş`əl eyləməz,
Şam açsa yari-sübhi-giriban nəfəs-nəfəs.

Hərçənd üstüxanımı yandırdı dudi-dil,
Yandıqca səbz olur bu neyistan nəfəs-nəfəs.

Qövsi, nə eşqdir sənə billah kim, demiş
Kim şö`lə-şö`lə odlara düş, yan nəfəs-nəfəs.

* * *

Cəmalindən sənin, ey şəm, heyranlıq mənə qalmış,
Pərişan kakilindən bir pərişanlıq mənə qalmış.

Həyatim nəqdini sərf etmədim əyyami-vəsl içrə,
Əlimdən imdi hicr almış, peşimanlıq mənə qalmış.

Şəbi-hicran asılmış hər müjəmdən bir cigər ləxti,
Bəli, gülçinligimdən bu güləfşanlıq mənə qalmış.

Gözüm peyvəstə bərqi-əbr tək, vəslin baharından
Əbəs bitablıq, bihudlə giryanlıq mənə qalmış.

Səba peykim, bəla xeylim, külahim şö`leyi-ahim,
Səririm məskənət, Qövsi, Süleymanlıq mənə qalmış.

* * *

Ol ki, cənnətdir adı, guşeyi-meyxanə imiş,
Abi-kövsər dedigin bir dolu peymanə imiş.

Eşq imiş hüsni-cahansuz, həqiqətdə onun,
Zahiri şəm, vəli batini pərvanə imiş.

Tiğin altında nəfəs çəkmədim, əmma bildim
Ki, bu meydanda ələm naleyi-məstanə imiş.

Bu nişanlar ki, mənim var, verirlər ondan
Oldu mə`lum ki, Məcnun necə divanə imiş.

Eşqdən qeyri ki, can tazə edər şüğli onun,
Aləmin işləri baziçeyi-tiflanə imiş.

Ana hərçənd qulaq tutmaz idim, bildim kim,
Mənə naseh dedigi sərbəsər əfsanə imiş.

Əzmi-kuyin yetirir mənzilə hər gündə məni,
Salikin balü pəri himməti-mərdanə imiş.

Müflisi-aləm ikən duydu gözüm könlümdən,
Ey gədalər, yığılın, gənc bu viranə imiş.

Düşdü hər daş əlimə, sinəmə urdum, əmma
Ah, əfsus kim, ol sinə pərixanə imiş.

Ömrlər aləmi-surətdə gəzərdim, Qövsi,
Aşina istədigim mə`niyi-biganə imiş.

* * *

Fəğan ki, dəhrdə bir aşına bulunmaz imiş,
Bu hamı şöhrət ilə kimiya bulunmaz imiş.

Cəhanda olmaz imiş şad aşiqin könlü,
Qərəz, bu Kə`bədə hərgiz səfa bulunmaz imiş.

Bu surət ilə gözüm nuru oldu sərfi-tələb,
Fəğan ki, mə`niyi-mehrü vəfa bulunmaz imiş.

Yanub-yanub keçinür əşkü ah ilən bülbül,
Bu mürğzardə abü həva bulunmaz imiş.

Mənimlə kakili kutahlıq qılır yarın,
Bulunsa seyd, kəməndi-rəsa bulunmaz imiş.

Mənim də ömrüm ötübdür əsərlü nalə ilə,
Vəli bu pərdədə, ey ney, nəva bulunmaz imiş.

Dil anlayan, eşidən, dinləyən, bilən, Qövsi,
Bilir ki, sən kimi bir binəva bulunmaz imiş.

* * *

Dili-bitab əritmiş bağrımı, gözdən rəvan etmiş,
Bu qan olmuş mənə saqi, meyi-gülguni qan etmiş.

Degil bimətləb ol lə`li təbəssümafərin, yarəb,
Dəhanın məndə guya ya könül, ya can güman etmiş.

Ləbin hökmilə xətti-səbz təsxir etdi dünyanı,
Xəğan kim, muri ol xatəm Süleymani-zəman etmiş.

Edim hansı dil ilə şükrin ol Yusif nəjadın kim,
Mənə zindan ikən aləm behişti-cavidan etmiş.

Nigahın hər kimə tir eyləmiş, keçmiş rəvan məndən,
Demiş hər kimsəyə bir söz, mənə xatirnişan etmiş.

Qanadı altına almış oxun cismim, bəhəmdüllah,
Hümayi-övci-dövlət başim üstə aşiyan etmiş.

Qübari-xətti-səbzin sürmeyi-çeşm etmişəm, Qövsi,
Mənə ol tutiya Təbriz şəhrin İsfahan etmiş.

* * *

Ol ki, hüsnündən sənin dünyanı gülzar eyləmiş,
Bilmənəm, yarəb, nə mə`nidən məni xar eyləmiş.

Qanlı müjgan, odlu dillərdir ki, çeşmim mərdümi
Onlar ilə könlümün razini izhar eyləmiş.

Könlümün hər parəsi bir ayrı heyrandır ana,
Bir xəridarın bu Yusif yüz xəridar eyləmiş.

Gah-gahi bir təkəllüm lə`li-nabindən sənin
İstərəm andan ki, yox yerdən məni var eyləmiş.

Sən müsəlmansan, könüllər birlə tari-kakilin,
Səbheyi-səddanədir kim, eşq zünnar eyləmiş.

Gər məsiha bilsə çəkməz dərdi-sər dərman üçün
Kim, bu bimari təbibi-eşq bimar eyləmiş.

Özgələr tək qədrini gər bilməsəm, tutsun gözüm,
Hər nigahi-namüşəxxəs kim, mənə yar eyləmiş.

Piçü tabi-şami-hicran bəs degilmidir mənə
Kim, məni virandən viranə me`mar eyləmiş.

* * *

Məgər zənciri-zülfin şanələnmiş,
Səba zəncir üzüb divanələnmiş.

Xəyali-tabi-şəm`i-arizindən
Gözüm içrə nigəh pərvanələnmiş.

Güli-rüxarın üstə şəbnəmi-xuy,
Əqiqi narə bənzər, danələşmiş.

Mənəm səhradə həmzənciri-Məcnun,
Yenə divanələr həmxanələnmiş.

Yolun düşdükdə nagəh yapə lütfün,
Bu ümmid ilə dil viranələnmiş.

Qalırkən bimürəbbi tifli-əşkim,
Məhəbbət atə, möhnət anələnmiş.

Mürüvvət qıl ki, Qövsi, səndən ötrü,
Özündən, özgədən biganələnmiş.

* * *

Rövzeyi-rizvan ki, derlər, arizi-canan imiş.
Atəşi-duzəx bieynih atəşi-hicran imiş.

Fariğulbal eylədi əbrukəmanlardan məni,
Allah-Allah, zəxmi-bidadın qızıl qalxan imiş.

Əcz edib əflakı yalvardım mükərrər, bilmədim
Kim, bu vadilərdə gərdun daxi sərgərdan imiş.

Ol bir avuc qan ki, dil derlər ana ərbabi-dil,
Gördümü qövr eylədim, dəryayi-bipayan imiş.

Yari əğyar ilə gördüm mehriban, fəhm eylədim
Kim, mənim kamilcə hərgiz dönməyən dövran imiş.

Bulmaq istərsən anın zənciri-zülfündən nicat,
Şükr kim, Qövsi, sənə əqlü xirəd böhtan imiş.

* * *

Bəzmi-mey sənsiz, həmana, bənd imiş, zindan imiş,
Badeyi-gülrəng eşitmişdim, bieynih qan imiş.

İstədim dərman təbibimdən, fəğan kim, bilmədim
Kim, anın hər dərdi yüz min dərdimə dərman imiş.

Göz yumunca canımı cananə təslim eylədim,
Mən onu düşvar sanmışdım, vəli asan imiş.

Eyləməzdim mən dili-bitabə pərva, ah kim,
Ol şərari-natəvan bərqi-səbükcövlan imiş.

Atəşi-duzəx, deyər zahid, qəradır dud tək,
Doğru söylər, həqq deyər, gördüm şəbi-hicran imiş.

Kə`bədən bütxanədən, məsciddənü meyxanədən
Həqq bilir kim, hamı yerdə mətləbim canan imiş.

Kə`bə tövfin ömrlər bir gün dilərdim tanrıdan,
Şükr kim, kuyində hər gün eyd imiş, qurban imiş.

Yüz dil ilə çərxə, Qövsi, yalvarıb əcz eyləmə,
Kim, bu vadilərdə gərdun daxi sərgərdan imiş.

* * *

Vəslin əgər bulunmasa, gözdən nədir qərəz,
Mətləb aradə olmasa, sözdən nədir qərəz.

Şəm`i-murad yanmaz imiş daği-eşq ilə,
Yarəb, bu yanar oddanü gözdən nədir qərəz.

Divanənin düz olmaz imiş könlü şəhrdə,
Mə`lumum indi oldu ki, düzdən nədir qərəz.

Aşiq gözini ağü, günin qarə etməsə,
Bəs xami-səbzdən, qara gözdən nədir qərəz.

Şirin sözün cəhanə yetər şur salmağa,
Bilməm ləbində dad ilə duzdən nədir qərəz.

Canan ilə təkəllüm əgər mümkün olmaya,
Dildən murad nolavü sözdən nədir qərəz.

* * *

Aşiqə nə ne`məti-əlvan, nə cənnətdir qərəz,
İki aləmdən ana şüğli-məhəbbətdir qərəz.

Bülbüli-zar ilə fərqim var mənim yerdən göyə
Kim, ana gülbün, mənə ol sərvi-qamətdir qərəz.

Dəmbədəm tiğindən ölməkdən mənə məqsud kim,
Sayeyi-bali-hümadən xəlqə dövlətdir qərəz.

Ey deyən kim, təlx olur göftari-şirin ləblərin,
Nəş`ədir məqsud səhbadən, nə ləzzətdir qərəz.

Bilirəm kim, e`tibar olmaz bu gündən danlayə,
Can nisar etməkdə tə`xir olsa, fürsətdir qərəz.

İçürür cami-zər içrə zəhri-qatil təşnəyə,
Ol ki, ehsandan ana təhvili-minnətdir qərəz.

Mətləbim ləzzət degil əhli-həvəs tək kim mənə
Vəsldən bir özgə dərdü dağü möhnətdir qərəz.

Meyvə üçün bağban hər nəxli eylər tərbiyət,
Xilqətindən növ`i-insanın məhəbbətdir qərəz.

Qönçeyi-gül sən tək, ey bülbül, bitirməz yarəmi
Kim, mənə mənzur mə`nidir, nə surətdir qərəz.

Qeyrə yoxdur nisbətin, ey səbzi-təhgülgun sənin

Kim, pərivəşlərdən ancaq bir məlamətdir qərəz.

Suyə meylin təşnənin mövci-sərab əfzun edər,
Qövsiyə eşqi-məcazidən həqiqətdir qərəz.

* * *

İçib mey qanə-qanə bağrımı qan etdi ol novxət,
Həvasim qönçəsin gül tək pərişan etdi ol novxət.

Ucaldı hansı bülbül naləsi kim, səbzə ətrafın
Həyadən tərləyib gül-gül gülüstan oldu ol novxət.

Dolandım Kə`beyi-kuyinə yüz çin, ta məni bir yol
Çevirdi başə əvvəl, sonra qurban etdi ol novxət.

Gətirmişdim əzəldən zülfə iman, şükr kim, axır
Gətirdi ayeyi-xəttin, müsəlman etdi ol novxət.

Keçərkən rüzgarım sadəsurətlər xəyalilə,
Məni, Qövsi, bu mə`nidən peşiman etdi ol novxət.

* * *

Sinədə könlüm sərayin rövşən eylər şəm`i-dağ,
Öz ayaği altına hərçənd işıq salmaz çırağ.

Ta açarsan ağzını göftarə, könlüm açılır,
Qönçəni şəbnəm kimi bir qətrə eylər tər dimaq.

Saqiya, məstəm, əlim tutmaz, nə tədbir eyləyim.
Ol ki, qismətdir yetər, əmma gərəkdir əl-ayaq.

Ərşdən ötmək gərək, ta kuyinə yetmək gərək,
Səbr qıl, ey nalə kim, yol sə`bdir, mənzil uzaq.

Bağlamış zöhd əhlinə qapusını meyxanənin,
Hörməti lazım gərək, hərçənd kafərdir qonaq.

Sanma kim, bihudə otlandım sərapa şəm tək,
Varisəm, yandırmışam qəbrində Məcnunun çırağ.

Ta dilim var bu çəməndə, ey bahari-arzu,
Əndəlibü gül kimi məndən fəğan, səndən qulaq.

Gülsitanə ta nəsimi-kuyin, ey gül, getməyə,
Qönçeyi-atəşzəbanın ağzını açmaz bıçaq.

Mən ötürdüm dərdi-sərli naləni seylabdən,
Arxa lütfündür mənə, seylabə dağlardır dayaq.

Nalə bir dəm yandırır, bir dəm saçır xakistərim,
Gah olur xamuş, gahi otlanur yeldən çırağ.

Nərgisi-təsvir heyrandır sənə çeşmim kimi,
Lalə tək rəşk atəşindən olmayımmı səngi-dağ.

Var ümidim qoymaya peymaneyi-çeşmim təhi,
Ol ki, xani-rəhmətindəndir fələk bir boş çanağ.

Qövsi, o rə`na qəzəldir Füzulinin bu kim:
"Ey füzuli, çək ayaq ol bəzmdən, ya çək əyaq".

* * *

Aldı məndən yarə layiq canı hicran, heyf-heyf,
Sərfəsiz sərf eylədi ol nəqdi canan, heyf-heyf.

Etmədim mən dinimi, imanımı ondan diriğ,
Söz qılır məndən, diriğ, ol namüsəlman, heyf-heyf.

Etmədin can riştəsin peyvənd tari-zülfünə,
Can üzüldü, ömr azaldı, keçdi dövran, heyf-heyf.

Hər xəsü xaşak sirab oldu əşkimdən mənim,
Başım üstə gəlməz ol sərvi-xüraman, heyf-heyf.

Hər özün bilməz sözü tə`sir edər dildarimə,
Hər nəsim ol qönçəni eylər pərişan, heyf-heyf.

Görmək üçün nimxam olmuş cigərlər ləzzətin
Olmadın, saqi, mənə bir ləhzə mehman, heyf-heyf.

Qövsiyə kim, abi-kövsər dəhrdə şayistədir,
Qanə-qanə gərdişi-gərdun verir qan, heyf-heyf.

* * *

Yoxdur səbatı fəsli-gülün ey həzar, heyf,
Bir göz yumub açınca keçər novbahar, heyf.

Düşdüm gedə-gedə iki aləm bəlalərə,
Bir qatla ol bəla mənə olmaz düçar, heyf.

Mən daxi bir gül olsa idi, tərzəban idim,
Ol novbahar unutdu məni, ey həzar heyf.

Bülbül kimi mənim daxi çox var sözlərim,
Lal oldu qönçə tək dilim, ey gülüzar, heyf.

Dövri-zəman əgərçi şərərbardır bu il,
Bidərddir deyən ki, keçən ruzigar, heyf.

Me`racə yetdi gərçi səbüklik, şikəstəlik,
Olmadım öz müradım ilə xaksar, heyf.

Hiç kimsə dərd qədrini bilməz mənim kimi,
Qədrimi bilmədim heyf, ey ruzigar, heyf.

Səyyadə seyd qədrini vəhşət bilindirər,
Qövsi, mən ol kəməndə tez oldum şikar, heyf.

* * *

Hüsn əgər ayinə olsa, ona cövhərdir eşq,
Nə rəviş var isə hüsn ilə bərabərdir eşq.

Sərbəsər aləmi-icad sədəfdir, əmma
Hüsndür bəhri-giran, ləngərü gövhərdir eşq.

Xar baxma mənə, ey hüsni-qəvi, kim, aşiq
Natəvan isə, vəli səddi-Skəndərdir eşq.

Həzər et başin üçün olmayasan aşiq kim,
Görə bilməm səni, məzlumü sitəmkərdir eşq.

Yar əgər rəhm edə, aşiq özünə rəhm etməz,
Hüsn hərçənd müsəlman ola, kafərdir eşq.

Vəsl ilə aşiqi-bitab odu təskin tapmaz,
Hüsn bir atəşi-suzanü səməndərdir eşq.

Tutiya nırxınadır əhli-nəzər yanində,
Bibəsirətlərə xak ilə bərabərdir eşq.

Hüsn hərçənd ola şirinü şəkərbar, vəli
Təşneyi-dərd olana çeşmeyi-kövsərdir eşq.

Nə qədər çeşmeyi-simab ola aşq, Qövsi,
Hüsn bilməzmi ki, dəryalərə ləngərdir eşq.

* * *

Nə hərzə möhnətü dərdü qəmi-bəldadır eşq
Ki, gəncdir dili-viranə, əjdəhadır eşq.

Bir özgə mətləb üçün əql tək dəlil degil
Ki, əsl məsələvü eyni-müddəadır eşq.

Od ilə od, suya su, topraq ilə topraqdır,
Həvayi-nəfəsə uyan kimsəyə həvadır eşq.

Sədəf nəsib bulur vüs`ətincə dəryadən,
Əgər sən olmayasan narəsa, rəsadır eşq.

Nəzakət əhlinə bağü baharü ne`mətdir,
Bəla sevənlərə səhrayi-Kərbəladır eşq.

Xirəd sənəmgədə hər arizusi bir bütdür,
Sınıq könüllər evi Kə`bəvü səfadır eşq.

Əgərçi qiblənümadır xirəd ibadət üçün,
Gözü görənlərə ayineyi-xudadır eşq.

Onu gər istər isən fəqr damənin tut kim,
Həlaki-xalü xətü nəqşi-buriyadır eşq.

Sipahdır qəmü möhnət, nəvayi-nalə, ələm,
Cünun vəzirü könül təxtü padişadır eşq.

Düşər ayaqlara, əmma sipehrə baş əgməz,
Diyari-hüsndə həm şah, həm gədadır eşq.

Qəmi-cəhan ilə aşıq qəmi-cəhan çəkməz
Ki, həm girehdir özi, həm girehgüşadır eşq.

Bu hamı qüdrət ilə təşneyi-təzəllümdür,
Sözün həqiqəti sultani-Kərbəladır eşq.

Gər olsa mətləbin, ey can, həyati-cavidan,
Kənar tutma ki, sərçeşmeyi-bəqadır eşq.

Yeri, yeri yoluna, ey əsiri-dövlət, hey
Ki, mal ilə ələ düşməz, giranbəhadır eşq.
Anın özü, sözü gər dərdü daği-aləmdir,
Vəli nə dərdin olursa, ana dəvadır eşq.

Nə qəm gər atuq edər hüsn gündə yüz dərdim,
Bu bəs degilmi ki, min dərdimə dəvadır eşq.

Müxalitət əzəlidir, müsahibət əbədi,
Əgər sən olmayasan yad, aşinadır eşq.

Nəzərdə gər görünür eşq natəvan, əmma
Şükuhi-hüsn pərigahü kəhrəbadır eşq.

Hümayi-dövlət əgər etməz iltifat, nə qəm
Fitadələr başına sayeyi-xudadır eşq.

Pəyamı, naməsi gər sərbəsər şikayətdir,
Həqiqət anlar isən, məzhəri-rizadır eşq.

Mən ixtiyar ilə ol kuyə getmənəm, Qövsi,
Mənə bu vadiyi-xunxarə rəhnümadır eşq.

* * *

Dönər pərvanətək mə`şuqinin başinə hər aşiq,
Bulunmaz mən kimi aləmdə bir bibalü pər aşiq.

Yolunda bəs ki, eşq əhlin görər torpağ ilə yeksan,
Sanır ol tifli-baziguş kim, yerdən bitər aşiq.

Qəribi-aləməm, hər yerdə olsam mən bu yüzdən kim,
Özüm tək görmənəm dünyadə bir xunincigər aşiq.

Bu hamı taqəti-fəryad ilə aşiqmidir bülbül,
Ki çəkməkdən nəfəs məddin olar zirü zəbər aşiq.

Ana hərçənd surət bağlamaz cəm`iyyəti-xatir,
Pərişan eyləməz ərbabi-surət tək nəzər aşiq.

Əgər zahirdə eşq əhli özündən bixəbərlərdir,
Verir mə`nidə öz canani könlündən xəbər aşiq.

Anın mə`zursan, gər özgələr tək bilməsən qədrin,
Ki, Qövsi tək sanırsan hər kimi, ey bixəbər aşiq.

* * *

Nə bülbüldür, nə gül, nə şəm, nə pərvanədir aşiq,
Özün bilməz, sözün zəbt eyləməz divanədir aşiq.

Sanırlar əhli-eşqi xəlqi-aləm çox, vəli azdır
Ki, ləfzi-aşinavü mə`niyi-biganədir aşiq.

İki dünyayə verməz bir dəm öz ovqatını, əmma
Salır yazilərə canin, əcəb cananədir aşiq.

Nəvayi-ney sənin rəngin tərənnüm əndəlibin kim,
Həlaki-hay hayi-naleyi-məstanədir aşiq.

Olur hərçənd piçi-kakilinçün, tabi-zülfinçün
Əsiri-piçü tabi-ahi-bitabanədir aşiq.

Dərü divar məscid səcdəsi, zöhhadə ərzani
Ki, məhvi-Kə`beyi-rüxsari-sahibxanədir aşiq.

Bir olmuşdur xəyali-yar ilə əzbəs ləbaləbdir,
Bu yüzdən həm sədəf, həm gövhəri-yekdanədir aşiq.

Alıbdır huşimi sevdası məndən bir uşağın kim,
Sanır eşqi əracifü deyir əfsanədir aşiq.

Gər ol gənci-rəvan eşq əhlini kimdir deyib sorsa,
Deyin Qövsi kimi bir xanimanviranədir aşiq.

* * *

Ey səba, tanrıyçün et bir dəm mənimlə yarlıq,
Yarə ərz et kim, gəlirmi yardan əğyarlıq.

Ta meyi-gülgun ola, məst olmayan divanədir
Kim, bilir hüşyar olan naçardır hüşyarlıq.

Taqətim yoxdur, təbibim, var, məndən əl götür
Kim, bu dərdilə mənə düşvardır qəmxarlıq.

Mən anınçün şükr edib yalvarmanam gərdunə kim,

Yeg gəlir nakəs dəvasından mənə bimarlıq.

Aşiq olmaz olmaya dilgir kim, mümkün degil,
Eşqdən xoşhallıq, seylabdən me`marlıq.

Cismü candır bir-birilə eşqü hüsnün nisbəti,
Olsa gər azarlıq, mümkün degil bizarlıq.

Dəhrdə ta var Qövsi lazimü məlzumdur,
Əqli-naqis padşahlıq, eşqi-kamil xarlıq.

* * *

Xoş şüğli-dilnişindir əhbabə mehribanlıq,
Pərvanə ilə birlik, şəm ilə həmzəbanlıq.

Surətdə namülayim, mə`nidə xoşnümadır,
Üşşaqü sərgiranlıq, məşuqü canfəşanlıq.

Dersən ki, xublərdən kəs mehrin, ictinab et,
Yaxşılar ilə, zahid, yaxşımıdır yamanlıq.

Sorsan nədir muradın cami-cəhannümadən,
Mərdanə canfəşanlıq, məstanə mehribanlıq.

Başım alıb çıxardım gərduni-dun evindən,
Gər nalə tək inanım tutmeydi natəvanlıq.

Hərçənd cür`ət etməz ərzi-niyazə aşiq,

Əmma bir odlu dildir mə`nidə bizəbanlıq.

Hər bir nəzarəsindən yüz nüktə fəhm edərsən,
Qövsi, sənə müsəlləm aləmdə nüktədanlıq.

* * *

Ey məlahət gənci, bil qədrini viran könlümün,
Canım ilə sən bil, əmma can sənin, can könlümün.

Farix etdin özgə xublardən məni, rəhmət sənə,
Eylədin şirazə övraqin pərişan könlümün.

Hər gecə kim, oldu mehmanım xəyali- mərhəmin,
Dağ ilə qıldım dərü bamin çırağan könlümün.

Ol güli-rüxsar ilə gözdür edən küstaxlıq,
Bilmənəm cürmi nədir, ey namüsəlman, könlümün.

Qibləgahim, tutmaz əfyun badeyi-nabin yerin,
Sənsiz açmaz üqdəsin seyri-cülüstan könlümün.

Olmadan qanlı ətək çək, ey xəyali –yar, kim,
Türfə ləbriz eyləmiş peymanəsin qan könlümün.

Atəş üzrə zərfi-sərpuşidə tez qaynar, daşar,
Xub yetişdin havinə, ey çeşmi-giryan, könlümün.

Meyli-seyri-gülsitan, ey bülbül, etməz sən kimi,
Gül kimi ta var əlində bir avuc qan könlümün.

Hali-dildən gər xəbərdar olsa, Qösi, ol təbib,
Hər yetəndən göndərər dərdinə dərman könlümün.

* * *

Şəm tək, ey əşki-xunin, məndə sən göz qoymadın,
Qapusunda, sənin həm, ey göz mərdümi, üz qoymadın.

Hər nə etdin, etdin, əmma hiç bildin neylədin,
Dinmədin, dindirmədin, üz vermədin, söz qoymadın.

Ol gülə şərh eylə dildən düşdüngüm keyfiyyətin,
Sən ki, ey bülbül, məni heç yerdə yalquz qoymadın.

Tərli rüxsarın anın görsəm yığarsan damənin,
Bəs ki, ey gün, yerdə şəbnəm, göydə yulduz qoymadın.

Hansı abü gildən, ey eşq, eylədin Məcnuni xəlq,
Çün əzəl başdan vücudimdən mənim tuz qoymadın.

Vəh nə rə`nasən ki, bari-şərmdən Qövsi kimi,
Bu çəməndə bir nihalin qamətin düz qoymadın.

* * *

Mənə bidərd səhba verməsin, dərd əhli qan versin,
Bu vəsf əhlin görən, Allah üçün, gəlsin nişan versin.

Gözüm biəşkü dil biqəm, bədən asudədir, yarəb,
Yetir bir yari-İsadəm ki, bu əmvatə can versin.

Gözüm vardır bu il kim, əbri-gövhərbar, dəryadil,
Mənə öz rəngi-zərdimdən bahari-bixəzan versin.

Mənim canım ki, biaramdır isar üçün, saqi,
Yetər məqsudinə, gərdun əcəldən gər aman versin.

Nisarinçün sənin əşki-rəvan, ey sərvnaz, azdır,
Gözüm var xazini--qismət mənə gənci-rəvan versin.

Gözüm mərdümləri peyvəstə istər daneyi-xalın,
Bu muri-natəvan rizqin Süleymani-zəman versin.

Əgər dövran mənim rayimcə dönməz bir zəman, Qövsi,
Ümidim var ki, könlüm mətləbin sahibzəman versin.

* * *

Əlimdən aldı gözüm, saqi, ixtiyar gözün,
Şərab daxi nə hacət mənə ki, var gözün.

Qaşın nə tiği-bəla, kiprigin nə giradır,
Gözün nə qanlıdır, ey atəşinüzar, gözün.

Haçan edər təhi-mina əlaci-dəryakeş,
Nə növ qanım ilə sındırır xümar gözün.

Həm aldı şirlərin ahulər gözi odunu,

Həm etdi ahuyə Leylilləri şikar gözün.

Şərabi-nab edər icad özündən ol sağər,
Neçün hənuz çəkər zəhməti-xümar gözün.

Mədari-dövri-zəman, gərdişi-fələk netsin,
Gözüm çırağı-məni etdi biqərar gözün.

Səni bu hüsn ilə Yə`qub görsə, ey Yusif,
Deyər qiyamətədin Qövsiyə ki, var gözün.

* * *

Könlümün halın mənim ol sərvi-baladən sorun,
Varın, ol bimarın əhalın Məsihadən sorun.

Gah odlar xanəmanım, gəh çirağım yandırar,
Hər ikinin vəchin ol gülbərgi-rə`nadən sorun.

Vasil oldu hər həbabi-puç öz məqsudinə,
Qətreyi-sərgəştə təqsirini dəradən sorun.

Dərd çəkmiş kimsələr dərdin bilərlər çarəsin,
Dustlər, dərmanimi Məcnuni-şeydadən sorun.

Sormağa əhvalimi mümkün degil bulman məni,
Vəsfi-halim aləmi-vəhdətdə ənqadən sorun.

Saqiyi-bibak əlində səng xara mum olur,
Gər dil anlarsız bunun əslini minadən sorun.

Təngnayi-dəşti-imkan qabili-cövlan degil,
Qövsiyi-Məcnun nişanın özgə səhradən sorun.

*   *   *

Zə`fdən düşdüm ayaqdan məni-sərgərdanın,
Yeri, ey kakili-yar, öz əlin, öz damanın.

Xirədü dinü dilü canımı aldın, saqi,
Yoxdur, ey kafəri-xunxar, hənuz imanın.

Ol səri-kuy ki, duzəx kimi yandırdı məni,
Nə rəva tə`nə ura rövzəsinə rizvanın.

Səndə kim, dərdi-vəfa yox, nə deyim dərd sənə,
Səndə kim, mehr bulunmaz, nə tutum damanın.

Ah kim, atəşi-suzində ikən ab kimi,
Hər həvadən üzülür silsileyi-peymanın.

Cümlənin kami inən döndünü məndən döndün,
Ey fələk, dön ki, əcəb dönməlidir dövranın.

Məni-bidil səni bütxaneyi—Çin bilməz idim,
Yoxsa, ey Kə`beyi-eşq, olmaz idim qurbanın.

Neçə bir bihdə həzyani-müsəlsəl Qövsi,
Nə olubsən, yetər, ey xəstə, üzülsün canın.

* * *

Ey deyən Məcnun hanı, Məcnun mənəm, Leyli gərək,
Surəti-divar çoxdur, dəhrdə mə`ni gərək.

Hər kimi görsən, məhəbbətdən, vəfadən dəm urur,
Də`viyi-batil nə hasil, şahidi-də`vi gərək.

Aşiqə təmkinü istiğnavü taqət pinədir,
Kim deyibdir kim, gədanın təb`i müstəğni gərək.

Mən səmumi-hicrdən bərbadəm, ey badi-bahar,
Ya nəsimi-sübhi-məhşər, ya dəmi-İsa gərək.

Eşq isbatında, ey pərvanə, yandın, bilmədin
Kim, bu sürtəxanədə də`vayi-bimə`ni gərək.

Hüsnə eşq əhvalını ərz etmək asandır, vəli
Arada nəzzarə tək bir dil bilən elçi gərək.

Ey cünun, bil qədrini, çox çalma daşdan-daşə kim,
Səhldir, Məcnuni Fərhad olmasa, Qövsi gərək.

* * *

Əzabi-çeşminəm, ey məsti-bixümar, sənin,
Həlaki-qəddinəm, ey sərvi-cuybar, sənin.

Nə abü rənglü yaqutdur ləbin, yarəb,

Sözün nə şö`lədir, ey atəşinüzar, sənin.

Bu can ki, məndə var, əzbəs həqirdir, su olur,
Nihali-dilgüşana eyləsəm nisar sənin.

Boyun bəlasın alım, ey nihali-baravər,
Ölüm mürüvvətinə, ey vəfalu yar, sənin.

Nizavü rəşk nə lazım mənimlə, ey bülbül,
Bu sərvi-səbz xüraman mənim, bahar sənin.

Bu qanlı dağlar, ey bağban, mənim malım,
Nəzareyi-gülü gülgəşt, laləzar sənin.

Cünuni-kamilü bədnamlıq mənim, zahid,
Bu əqli-naqisü namusü nəngü ar sənin.

Behişt üçün məni avarə eyləyən vaiz,
Yeri ki, yar mənim, daxi hər nə var, sənin.

Yetəndə kuyinə yarın, səba, yetir məndən
Ki, xaki-rahinəm, ey övci-e`tibar, sənin.

Mənim dilimdən ana, ey sipənd, ərz et kim,
Gözüm çırağı, sənindir bu biqərar, sənin.

Tutum ki, hər nə sən etdin, təhəmmül etdim mən,
Hanı mürüvvətin, ey çərxi-şö`ləbar, sənin.

Fəğan ki, sərkişü məğrurü xamsan, Qövsi,

Əgərçi varını yandırdı ruzigar sənin.

* * *

Aşiqlərə nə şəm kimi taci-zər gərək,
Onlarə qanlu didəvü odlu cigər gərək.

Kuyü Muğanü bütkədəvü məscidü həram,
Nuri-həqiqət ilə dodudur, nəzər gərək.

Bu təngnadə balü pərin vari sınmadin,
Ey mürği-dil, bədən qəfəsindən səfər gərək.

Ey nalə, yar kuyinə getmək nə faidə,
Neylim bunu ki, ərşdən ötdün, əsər gərək.

Ey hər nəfəs bir özgə səbadən xəbər soran,
Eşq əhli baxəbər gərəkü bixəbər gərək.

Bağrım ki, iltifatı ilə oldu qan anın,
Tiği-təğafülinə bir özgə cigər gərək.

Gün səfhəsində yazılu gördüm bu misrəi
Kim, handa olsa pak göhər, dərbədər gərək.

Hiç dərd hicrdən betər olurmu, ey deyən
Yan hicr odinə kim, sənə bundan betər gərək.

Qövsi gərək ki, çəkməyə ömründə hiç nəfəs,
Dəryayi-eşqi boyliyənə gər göhər gərək.

* * *

Hərçənd yetməsə mənə dövranı saqinin,
Bəsdir nəzareyi-ləbi-xəndanı saqinin.

Gər şuri-əşki-təlximi görsə kəbab tək,
Qaynar mənə şərab kimi qanı saqinin.

Tutmaz dilim mey istəməgə bu xümar ilə,
Piri-Muğan kimi uludur şanı saqinin.

Çün fərq ayaqdən əlim etməm, nə faidə
Gər düşsə bir zəman ələ damanı saqinin.

Qövsi xümardan aparır can, əgər qoya
Başin ayağına, ola qurbanı saqinin.

* * *

Varın, ey sərvlər, ol şiveyi-rəftarı görün,
Yığılın, qönçələr, ol lə`li-göhərbarı görün.

Dərdi-sərlər mənə hər ləhzə verən bülbüllər,
Gül kimi guş olun, ol ləhceyi-gövtarı görün.

Taleim yulduzunu mən kimi yandırmaq üçün,
Şö`lə çəkmiş gögə ol atəşi-rüxsarı görün.

Ey mənim rəngimə bivəch gülən bülbüllər,
Varın ol çöhrə ilə yari-sitəmkarı görün.

Ey mənim naləmi əfsus qılan nadanlar,
Gəlin ol səngdilin kuyinə, zinharı görün.

Qara günlərdə özüni itirən aşiqlər,
Kim, demişdi sizə ol türreyi-tərrarı görün.

Özgəyə guşeyi-çeşm ilə verirsən sağər,
Mənə qanlar içirən saqiyi-xünxarı görün.

Hər kimi yaxdı, kəbab etdi məni atəşi-rəşk,
Özgəni yapmağa yıxdı məni, me`marı görün.

Söylə bülbüllərə, pərvanələrə, badi-səba
Ki, gedin, tanrı üçün, Qövsiyi-bimarı görün.

* * *

Niqab aç, vaizin bağla dükanın, şöhrətin, getsin,
Yığıb zülfün, pərişan et anın cəm`iyyətin, getsin.

Könül, olma onun abi-həyati-tiğinə təşnə,
Çıxar başindən ol əmri-məhalın rəğbətin, getsin.

Səməndərsən, sənə pərvanəvü bülbül nə nisbətdir,
Bu dilbilməzlərin tərk eylə, ey dil, söhbətin, getsin.

Gər istərsən ola zahir sənə hər nüktə səhba tək,

Xümi-mey damənin tut, qoy Fəlatün hikmətin getsin.

Əgər bir mehr göstərsə, çəkər min tiği-kin gərdun
Saqın, ağuludur, tök bu hərifin şərbətin, getsin.

Nigari-türk mehri Zali-dünya ilə cəm olmaz,
Əgər Rüstəm sevirsən, kəs bu divin ülfətin, getsin.

Bu Qövsi könlüdür, salma ayağə, izzətin, saxla,
Əgər layiq degil, namehriban ver rüxsətin, getsin.

* * *

Düşmədin dildən, könül, dildarə yalvarmaq gərək,
Ta nəfəs var, saqiyi-xunxarə yalvarmaq gərək.

Bir dil ilə aşiqi-biçarə netsin, neyləsin,
Yarə yalvarmaq gərək, əğarə yalvarmaq gərək.

Dərdimi, ta hər yetən bidərdə izhar etməyə,
Ləhzə-ləhzə ahu-ataşbarə yalvarmaq gərək.

Rahət istərsən, müqəyyəd olmayıb pərvanə tək,
Hər nəfəs bir ataşin rüxsarə yalvarmaq gərək.

Hər gecə ol sərvqəd yadilə şəm`in başinə,
Bir havur dönmək gərək, bir parə yalvarmaq gərək.

Əczimə aldanma zinhar, öldür, ey qatil, məni
Kim, ölüncə aşiqi-biçarə, yalvarmaq gərək.

Gah göftar ilə, Qövsi, gəh nigahi-əcz ilə,
Hər dil ilə kim, bilirsən, yarə yalvarmaq gərək.

* * *

Yaxşı eyşim var,oxun zəxminə gər can çıxmasın,
İstərəm, yarəb ki, dər can çıxsa, peykan çıxmasın.

Mən necə rüsvayi-afaq olmayım eşqində kim,
Böylə möhlik zəxmdən mümkün degil qan çıxmasın.

Ol qədərlər istərəm sevdayi-zülfi-kakilin
Kim, cünunum öhdəsindən piçi-taban çıxmasın.

İstərəm, bir qanlı zəxmi-tazə səndən günbəgün,
Bir rəviş kim, ox səsi, ey namüsəlman, çıxmasın.

Hər gecə, ey mah, naləmdən mənim mümkün degil,
Göglərə yerdən sədayi-ahü əfğan çıxmasın.

Mən deməm kim, eyləmə bədmehrlik üşşaq ilə,
Kaş mehrin candan, ey xurşidi-taban, çıxmasın.

Yaxdı cismim xali-hinduyin, necə ah etməyim,
Od yanarmı kim, tütün, ey bərqi-cövlan, çıxmasın.

Gər dilərsən kim, məni göz yaşı rüsva etməyə,
Parə-parə könlümi kəs öylə kim, qan çıxmasın.

Qövsinin ahindən et əndişə, bidad etmə kim,
Nagəhan ox yaydan, ey çərxi-gərdan, çıxmasın.

* * *

Bilməz idim kim, alır can daği-hicranın sənin,
Yoxsa eylərdim onu vəslində qurbanın sənin.

Aşiqin, ey səngdil, heç bir deməzsən, hali nə,
Kaş könlün tək olaydı əhdü peymanın sənin.

Ömr azaldı, keçdi dövran, saqi, ey bidadgər,
Hiç mənə yetməzmidir bir ləhzə dövranın sənin.

Bərq həm pərtovsiz olmaz, neyçün, ey bərqi-bəla,
Sayə salmaz başimə sərvi-xüramanın sənin.

Hər nəfəs nəzzarəsi aləmlərə ehya verir,
Sübhi-məhşərdir məgər çaki-giribanın sənin.

Getdi dinü dil əlimdən, qalmışam sərmayəsiz,
Hiç, zahid, yoxmudur bir zərrə imanın sənin.

Gər təhidəstəm, nə qəm kim, tuşeyi-rahim mənim,
Bəsdir, ey dəryayi-rəhmət, məddi-ehsanın sənin.

Küşteyi-gülgun kəfəndir əşkimin hər qətrəsi
Kim, tutarlar hər biri gülşəndə damanın sənin.

Versə, Qövsi, saqiyi-xunxar bir sağər sənə,
Mey kimi, yarəb, həlal olsun ona qanın sənin.

* * *

Nola, ey saqiyi-xunxar, əgər qaynar mənə qanın
Ki, qanımdan mənim sirabdır gülbərgi-xəndanın.

Ləbin "ba", nöqtə xalın, dişlərin "sin", "mim" ağzındır,
Bieynih məddi-bismillahdır sərvi-xüramanın.

Yetirdim bir yerə baziçeyi-zünnari kim, məncə
Brəhmənlər arasında deyilməz adı Sən`anın.

Şərabi-laləréngü xuni-dil daxil verir, saqi
Məgər xublar yanında fərqi olmaz dərdü dərmanın.

Aparmışdı məni əldən-ayaqdan natəvanlıqlar,
Mürüvvət eyləyib, saqi, əlimdən tutdu damanın.

Könül ta vardır, dərdü bəla əksik degil məndən,
Məgər bilməz yolun seyli-fəna, yarəb, bu viranın.

Xəsü xaşak hərgiz saxlamaz seylab onun, Qövsi,
Nə ümmid ilə tutdun damənin ol bərqi-cövlanın.

* * *

İstərəm rayincə olsun dövri-dövran saqinin,
Kakili tək olmasın könli pərişan saqinin.

Könlümi tapşır ana, ey dövri-dövran, söylə kim,
Can bu minayi-şikəstəxatirin, can saqinin.

Mən anınçün gah məstəm, gah xərabi-dəhr kim,
Cəm`dir hər sağərində badəvü qan saqinin.

Cilveyi-məstanə eylər hər yana mina kimi,
Görməmişkən qamətin sərvi-xüraman saqinin.

Badeyi-pürzur əgər məclisdə mina boynunu,
Baş əgər fərmanına gərduni-gərdan saqinin.

Vəh nə rəngin badədir şərmü ədəb səhbasi kim,
Aləm oldu abruyindən gülüstan saqinin.

Öylə kim, Qövsi, məni dünyadə sirab eylədi,
Əl mənimdir, abi-kövsər üstə daman saqinin.

* * *

Nə şirindir sözün kim, tanrı ondan göz-qulağ olsun,
Nə yaxşı gözlərin vardır, yəman gözdən irağ olsun.

Çəkib bir sağəri-gülgun, ayağ gülzarə qoy, saqi
Ki, güllər abi-ruyindən qızarsın, lalə dağ olsun.

Ayağımdan əlim fərq etmənəm, əzbəs ki, məstəm mən
Fəğan kim, böylə mənzildə gərək rəhrov oyağ olsun.

Gözü könlüm mənim, saqi, sənə layiq degil, əmma
Əgər mey fərdi-əvvəldir, nə qəm sağər çanağ olsun.

Təraş et hər nə var başində, qoy dursun həman kakil,
Qırılsa qəm degil ləşkər, gərək sərdar sağ olsun.

Təfavüt eyləməz sənsiz mənə, ey sərvi-səngindil,
Məkanım xah gülxan, xah səhra, xah bağ olsun.

Ümidi-iltifati-yar ilə kəsməz dilin aşiq
Ki, sel əfğan edər, hərçənd kim, dağlar dayağ olsun.

Vüsalin gör nədir bir yerdə kim, ey atəşin cövlan,
Xəyalin sübhi-xurişdü şəbi-hicran çırağ olsun.

Gözə nöqsan yetişməz xabdən bidar isə könlün,
Rəiyyət yatsa eyb olmaz, əgər sultan oyağ olsun.

Nə yaxşı söyləmiş, Qövsi, Vəhidi-pakgövhər kim:
“Məni yandırdı bir atəş ki, düşməndən irağ olsun”.

* * *

Yerli-yerdən siz, ey ərbabi-tərəb, vari durun,
Ələ sazinizi alın, çərx qulağini burun.

Gəlir ol mərdümi-çeşm, ey bu çəmənlər çərvi,
Yığılın bir yerə, müjgan kimi qulluğda durun.

Səri-kuyindən ötən yerdə, ey əhbab, anın
Dili-bimarimin əhvalini, zinhar, sorun.

Yetməz ərbabi-həva bir yerə, ey əhli-həvəs,
Ol qədərlər yügürün hərzə ki, atınızı yorun.

Rindlər, zahidi-şəyyad gəlir div kimi,
Şişə ilə meyi-gülrəngi pəri tək yaşurun.

Sitəmi-xardən əndişə çəkən bülbüllər,
Kim demişdi sizə ol nogüli-bixarı görün.

Məst mə`zurdur əshabi-xirəd yanında,
Xublər, Qövsiyi-bitab günahın ötürün.

* * *

Nalə ilə sızlaram hərgah musiqar tək,
Çəngsiz ahəngi-gərdun şivən eylər tar tək.

Bir söz ilə naleyi-məzlumə verməzlər cəvab,
Kaş olaydı bağrı səngindillərin kuhsar tək.

Nöqteyi-xalın tamaşasında, ey göz mərdümü,
Durmuşam bir yerdəvü sərgəştəyəm pərgar tək.

Eylərəm, zahid, ibadət rövzeyi-rizvan üçün,
Bir nihali var isə ol sərvi-xoşrəftar tək.

Mən sənin Yəqubinən, ey Yusifi-gülpirəhən

Kim, batar sənsiz gözə hər kiprigim bir xar tək.

Öz diyarındı könüllər mülki, pəs hər dəm neçün,
Çalü çap eylər xəyalın yağiyi-xunxar tək.

Məhv olur xurşid rüxsari-ərəqnakin görüb,
Mərdümi-çeşmimlə əşkim sabitü səyyar tək.

Gövhəri-sirab, Qövsi, istər isən dəhrdə,
Hər xəsü xaşakə qatlan bəhri-ləngərvar tək.

* * *

Abi-heyvandır ləbi-lə`li-dürəfşanın sənin,
Məddi-ömri-Xızrdır sərvi-xüramanın sənin.

Zəxmi-xunəfşan degil sinəmdə, ey əbrukəman,
Eyləmiş gül qönçeyi-sirabi peykanın sənin.

Ey pəri boynumda zənciri-cünunumdur mənim,
Rişteyi-mehrü vəfavü əhdü peymanın sənin.

Nola gər sirab qılsan qönçeyi-ümmidimi,
Çeşmeyi-xurşiddir rüxsari-tabanın sənin.

Kaş olaydı yüz min il sərmayeyi-ömrüm mənim,
Ta olaydım hər nəfəs çəkməkdə qurbanın sənin.

Təşneyi-caviddir, yarəb, nə üzdən qanimə,
Çünki sirabi-əzəldir tiği-müjganın sənin.

Nola gər yanmaqda şəm`i-bəzm tək xəndan olam,
Dilgüşadır sübh tək çaki-giribanın sənin.

Vəsfi-halımdır mənim, Qövsi, bu ki, Sahir demiş:
“Öldürür axır məni ol çeşmi-fəttanın sənin”.

* * *

Ömrə yoxdur e`tibar, ey can, nisar olmağ gərək,
Fürsətin ta əldə var, təslimi-yar olmağ gərək.

Axır olmaq çağıdır, bülbül, xəzan əyyamının,
Nalə məşq et kim, mühəyyayi-bahar olmaq gərək.

Gül yanında izzət istərsən əgər bülbül kimi,
Ömrlər zağü zəğan çeşmində xar olmaq gərək.

Gər dilərsən dəftəri-eşq içrə adın yazıla,
Təxteyi-məşqi-cünuni-novbahar olmaq gərək.

Əl çıxardıb astindən dav çəkdim, bilmədim
Kim, hərifi-ruzigari-bədqumar olmaq gərək.

Ey yədi-beyzayi-mə`ni göstərən sehrafərin,
Xəlq əlində paymalü xaksar olmaq gərək.

Ta məgər həmcinslikdən yar olub iqbal edə,
Ruzigar ilən bieynih ruzigar olmaq gərək.

Olmuşam bisərfə, safü pakü biğəş, ah kim,
Dəhr bazarində qəlbü kəməyar olmaq gərək.

Rahət istərsən, hünərdən ari ol, zinhar kim,
Bərgü bar olduqca, Qövsi, səngsar olmaq gərək.

* * *

Könlümü, saqi, kəbabü dağü büryan eylədin,
Ol qədər mey vermədin kim, bağrımı qan eylədin.

Könlümün si parəisn hərçənd yığdın bir yerə,
Aqibət bir yerdə övraqin pərişan eylədin.

Əvvəl aldın könlümi, axır buraxdın yaziyə,
Xatirim cəm eylədin, əmma pərişan eylədin.

Mən anınçün, ey Məsiha, raziyəm dərmanə kim,
Dərdim artırdın mənim, hərçənd dərman eylədin.

Sən ki, yer gülşəndə verməzdin mənə, ey bağban,
Pəs neçün öz aşiyanim bəndü zindan eylədin.

Tutmasınmı, ey fələk ayinəmi zəngar kim,
Kurlər şəhrində, bazarində heyran eylədin.

Bir neçə dilbilməz ilə həmsəvad etdin məni,
Mən ki, Əflatun idim, tifli-dəbistan eylədin.

Başini dağ eyləmək, Qövsi, münasibdir ki, sən
Bibəsirətlər şəbistanın çırağan eylədin.

* * *

Nola gər təlxkam olsam məni-yekrəng səhba tək
Ki, yüz al ilə saqi bağrımı qan etdi mina tək.

Yazarlar qətlimə birəhmlər, qanımla məhzərlər,
Dəmi-canbəxş ilə əhyayi-xəlq etsəm Məsiha tək.

Məni səhrayə, ey seylabi-əşkim, sən rəvan et kim,
Səvadi-şəhr olmuş təngçeşm əhli-dünya tək.

Meyi-gülgün xümarı, saqiyi-gülçöhrə-hicranı,
Məni ol iki səngindil ayaqdan saldı mina tək.

Fəğan kim, hər qədər tədric ilə keyfiyyətim artar,
Tökər toprağə saqi əşkimi sərcuşi-səhba tək.

Məni gərdun həman gün şurbəxtü təlxkam etdi
Ki, sinəm gövhər ilə oldu malamal dərya tək.

Qübari-xatiri-gərdun nainsaf olur, Qövsi.
Səba, könlüm qübarın gər pərişan etsə səhra tək.

* * *

Xarü zəlilü zarü pərişanınam sənin,
Kuyində itlərin kimi nalanınam sənin,

Gər gündə yüz çin öldürəsən tiği-naz ilə,
Qurbanınam sənin, yenə qurbanınam sənin.

Hərçənd hiçə satdın isə aqibət məni,
Tanrı bilir ki, bəndeyi-fərmanınam sənin.

Gərdun gözümlə səbzəcə yoxdur hesabda,
Ta paymali-sərvi-xüramanınam sənin.

Hər şahbaz seyd edə bilməz rəvan məni
Kim, mən əsiri-pənceyi-müjganınam sənin.

Yüz min söz ilə bir sözə həm bulmanam məcal,
Əzbəs ki, məhvi-çeşmi-süxəndanınam sənin.

Gəh şükr, gah şükuh, ərz hər dil ilə var,
Qövsi kimi həmişə sənaxanınam sənin.

* * *

Abru əzbəs ki, rüxsarində peydadır sənin,
Aşiqin yüz pərdədə, ey şəm, rüsvadır sənin.

Gözlərin ehya verir əmvatə hər nəzzarədən,
Ol Məsihadən ki, bimarın Məsihadır sənin.

Sərbəsər aləm, könül, bir kasə qandır, şükr kim,
Hər yana əzm eyləsən, rizqin mühəyyadır sənin.

Bilgilən zinhzar ərbabi-bəsirət qədrini,
Ey düri-tər qiymətin çün çeşmi-binadır sənin.

Kakilin tək baş çəkir yüz ol qədər ahim mənim
Məddi-sərvi-qamətin hərçənd rə`nadır sənin.

Dağdan çıxmaz səda ta bir həm avaz olmaya,
Aşiqə kuyində itlər naləfərmadır sənin.

Ol qəzəl feyzindən üz vermiş mənə, Qövsi, bu kim:
"Ta Füzuli xəstəyə vəslin təmənnadır sənin".

* * *

Eşqi-dəryadil mənim könlümdə pünhan olsa yeg,
Gənci-gövhər mənzili hərçənd viran olsa yeg.

Eyləməz biqədr aşiq könlünü bitablıq,
Gövhəri-sirab hər miqdar qəltan osla yeg.

Ey dəmadəm çeşmi-pürxunimdən ikrah eyləyən,
Hər qədər kim, əbri-gövhərbar giryan olsa yeg.

Namünasibdir bitürmək zəxmi-peykanın sənin,
Qönçeyi-ümmidimiz açılsa, xəndan olsa yeg.

İnqilabi-dəhrdən agah olan arif bilir,
Təxtü tacindən cəhanın bəndü zindan olsa yeg.

Çünki mən göz açmanam, gər tirəruz istər məni,
Pərdeyi-çeşmimdə ol xurşid pünhan olsa yeg.

Hər zəman kuyində Qövsi naləsin eyb etmə kim,
Öylə bülbül, böylə gülzar içrə nalan olsa yeg.

* * *

Navəkin sinəmdə, ey əbrukəman, xəm bolmasın,
Göz bulağından nihali-qamətin kəm bolmasın.

Etmək istər bülhəvəs avarə kuyindən məni,
Öylə kim, şeytan dilər cənnətdə adəm bolmasın.

Eybdir ar eyləmək əşki-rəvanımdan mənim
Kim deyibdir Kə`beyi-kuyində zəmzəm bolmasın.

Xanəzadi-əql kim, peyvəstə öz bəndindədir,
Düşməsin səhralərə, bir özgə aləm bolmasın.

Səhldir gər piçü tabi-hicrdən bitab olam,
Kaş dərdü dağin, ey arami-can, kəm bolmasın.

Arizin, ey səbzi-təhgülgun, xoyəfşan olsa yeg,
Heyfdir kim, səbzəvü gül birlə şəbnəm bolmasın.

Əşkdən, Qövsi, qübarı-qəm tutubdur çeşmimi,
Pakdir zəngardən ayinə ta nəm bolmasın.

* * *

Gər nalə çəkməsin dili-bimar, neyləsin,
Aşiq gözüm gər ağlamasın zar, neyləsin.

Seyri-gül etmək ilə işin nalədir sənin,
Ey əndəlib, pəs bu giriftar, neyləsin.

Ey aşiqi dəmadəm edən mən` nalədən,
Bir böylə dərdi etməsin izhar, neyləsin.

Dərdü bəlayə öz gözü könlüm salır məni
Yarin nə cürmi var ola, əğyar neyləsin.

Balü pər açmasın, səri-kuyin dolanmasn,
Axır bu bülbül, ey güli-bixar, neyləsin.

Sənsən əgərçi aşiqə bidad edən, vəli
Yüz min günahə etməsin iqrar, neyləsin.

Qövsi, səninmi halına bir əhli-dil demiş:
"Qoymaz məni fələk göz açım, yar neyləsin".

* * *

Əsiri-eşq olana daim odlu dağ gərək,
Səbahədin gecələr xəstəyə çırağ gərək.

Mənimlə, tanrı üçün, sözdə ixtisar et kim,
Uzun fəsanəyə, vaiz, dilü dimağ gərək.

Gərək cəhanda həmin yarü kuyi-yar mənə,
Neçün ki, bülbülə gül, bağbanə bağ gərək.

Nəvayi-nalə yolun məndən ögrənir bülbül,
Və leyk gül kimi ol qönçələb qulağ gərək.

Fəğan ki, tez yetər əncamə, dustlər, şəbi-vəsl
Rəfiq çox ki, şəfiq oldu, yol irağ gərək.

Yetər təğafül edib böylə sərgiran olmaq,
Əlin təsəddüqi, saqi, mənə əyağ gərək.

Ərinməyincə könül bifüruğdir mə`ni,
Söz ilə verməz işıq, şəm`i-bəzmə yağ gərək.

Xəyal ilə gecələr piçü tab bəs Qövsi,
Göz açuq oldu nə hasil, könül oyağ gərək.

* * *

Ey kəməndi-zülfi-canan kim, rəsadır himmətin,
Mən kimi, yarəb, pərişan olmasın cəm`iyyətin.

Mən gədayi-eşqəmü sən padşahi-hüsnsən,
Etməsin kəm sayə başimdən hümayi-dövlətin.

Ey düri-tər, hacəti-mizan istiğna degil,
Bilsin öz qədrin, mənim yanımda çoxdur qiymətin.

Hiç yerdə çərxi-müstə`cəl nəfəs çağ eyləməz,
Eyləmə bidad, əgər bidadə yoxdur taqətin.

Qəm degil, ey dil, əgər bisahibü viranəsən
Pasiban bəs gəncinə öz əjdəhayi-qeyrətin.

Saqiya, gər bitəkəllüf, bitəəyyünsən, vəli
Abruyindən fələk zərfində sığmaz şövkətin.

Qətrəsən, gərdun sədəfdir, gövhər olmaq çağıdır,
Ömrüni puç etmə, ta var ixtiyari-fürsətin.

Şali-atlasdır sənə, Qövsi, nə geysən yaraşır,
Namüvafiq düşməyibdir surətinlə sirətin.

* * *

Eşqində tərki-sər qılıram, neyləmək gərək,
Axır nə olduğun bilirəm, neyləmək gərək.

Hər kimsə bir bəhanə ilə, ey təbib, ölür,
Mən həm bu dərd ilə ölürəm, neyləmək gərək.

Peyvəstə, qayibanə mən ol dərdbilməzə,
Yüz min dil ilə yalvarıram, neyləmək gərək.

Daği-qəmin ki, sikkeyi-nəqdi-həyatdır,
Hər nırxa satsalar alıram, neyləmək gərək.

Ey məsləhət bilən, mənə təqsir tutma kim,

Mən kafərəm əgər bilirəm, neyləmək gərək.

Ey xoşxüram, sərvi-rəvanın bəlasını,
Nəqdi-rəvan verib alıram, neyləmək gərək.

Ol məsti-nazə kim, bilirəm, öldürür məni,
Qövsi, ölüncə yalvarıram, neyləmək gərək.

* * *

Neçün məndən yüzün döndərdinü əbruyə çin urdun,
Məlamət tiğini çəkdin, təğafül yayini qurdun.

Könün kuyində yarın sineyi-suzanı yad eylər,
Qonan mənzildə rəhrov fəhm edər qədrin köçən yurdun.

Gözüm, bir ömr əgər qan ağladın kim, sildi müjganın,
Bu hamı mehr göstərdin, könül, kimdən vəfa gördün.

Səri-rahində bir ümmidilə, ey nalə, qonmuşkən,
Sitəm qıldın, mənim toprağimi əflakə sovurdun.

Məni yüz min təbibin minnətindən eylədin fariğ,
Nigahi-guşeyi-çeşm ilə ta əhvalimi sordun.

Yüzü xalü ləbü çahi-zənəxdanü buxağınla,
Məni, ey atəşi-suzan, qərib odlarə qavurdun.

Mənim Məcnunə, Qövsi, hiç yoldan nisbətim yoxdur,

Həmin də`vi degil bu, onu eşitdin, bunu gördün.

* * *

Ey nalə, yəman könlünə yarın əsər etdin,
Getdin ki, xəbərdar edəsən, bixəbər etdin.

Aşiqlər üçün qəbri anın oldu nəzərgah,
Bu gözlər ilə hər kimə bir yol nəzər etdin.

Ey əbri-bahar, eyləmə su könlümü sən kim,
Hər qətrəni dəryayi-kərəmdən göhər etdin.

Ahim yeli tək yandırır əflaki nəsimin,
Ey bad, kimin kuyinə, yarəb, güzər etdin.

Rüxsari-ərəqnak ilə ötdünmi çəməndən
Kim, laləni dağü gülü xunincigər etdin.

Qan yaşimə etməzdi vəfa didələrim kim,
Hər zəxmi-şərərbarimi bir çeşmi-tər etdin.

Gəh seyli-sirişk ilə, gəhi ah ilə, Qövsi,
Gərdun evin yıxdınü zirü zəbər etdin.

* * *

Gərçi şövq etmiş məni atəşinan seylab tək,
Durmuşam bir yerdəvü sərgəştəyəm girdab tək.

Ol nəfəs kim, görmənəm ayineyi-rüxsarini,
Üzv-üzvüm bir-birindən ayrılır simab tək.

Kasə-kasə qan ki, sənsiz içdimü dəm urmadım,
Qətrə-qətrə gəldi çeşmimdən şərabi-nab tək.

Tez yetər əncamə ruzi-vəsl kim, mən, dustlər,
Yaxşı günlər görmüşəm, əmma xəyalü xab tək.

Nola başım ötsə göglərdən ki, xaki-kuyinə,
Hər səhər yüz sürtərəm xurşidi-aləmtab tək.

Zahidi-əfsürdə aşiq söhbətindən gərm olur,
Badeyi-gülgun ilə məmzuc olunmuş ab tək.

Sübhü vəslü şami-hicranım mənim yeksan keçər,
Hiç kafər olmasın, Qövsi, məni-bitab tək.

* * *

Bağrımı yüz yerdə artıq dəldi müjganın sənin,
Sinəmi göz-göz zireh tək etdi peykanın sənin.

Gör dili-sədparəmi müjgani-xunxarində kim,
Yeg bilir bu dilləri çeşmi-zənəxdanın sənin.

Qönçeyi-təsvir açılmazkən nə mö`cüzdür bu kim,
Açdı könlüm üqdəsin gülbərgi-xəndanın sənin.

Bir-birə əzbəs ki, oxşar, fərq qılmaz bağban,
Məddi-naləmdən mənim sərvi-xüramanın sənin.

Əbr yeldən dağılır, yarəb nə yüzdəndir bu kim,
Ahim ilə cəm olur zülfi-pərişanın sənin.

Qanı dolmuşlar kimi aram bulmaz bir nəfəs,
Olmayınca Qövsiyi-sərgəştə qurbanın sənin.

* * *

Xoş abü tablıdır əbri-novbahar bu il,
Ümid kim, ola kamimcə ruzigar bu il.

Bu abruy ki, gülşəndə var, qərib degil,
Gər olsa novgüli-bixar novki-xar bu il.

Düçar olur mənə, mən həm ana düçar oluram,
Ol ahu gözlüyə kim, olmuşam düçar bu il.

Gözümdə məskən edər halə içrə mah kimi,
Mənə gözüm işığı verməz intizar bu il.

Əgərçi bir neçə gün xar zəhmətin çəkdin,
Vəli yeg oldu günün gündən, ey həzar, bu il.

Kəməndi-nalə ilən şirlər əsirim ikən,
Məni bir ahuyi-çin eylədi şikar, bu il.

Gözüm çırağı, gözüm var kim, vüsulə yetə

Nə arzu ki, mənim gözlərimdə var, bu il.

Ayaq başa çəkib, baş ayağına qoyaram,
Gözün səbukeşiyəm, çəkməkəm xümar bu il.

Nigarxaneyi-Çin oldu gözlərim, Qövsi,
Bu abü rəng ilə kim, gəldi novbahar bu il.

* * *

Saqiya, bağrım meyi-gülgun üçün qan oldu, gəl,
Səbr evi sənsiz təzəlzül, buldu, viran oldu, gəl.

Bəxyəsindən zəxmimin ikrah edərdin, şükr kim,
Açılıb ol qönçeyi-pəjmürdə, xəndan oldu, gəl.

Xatirin halım pərişan olmaq ilə cəm olur,
Ondan artuq kim, sən istərsən, pərişan oldu, gəl.

Ey dilü din düşməni, birəhm kafərkiş, hey,
İmdi kim, könlüm diyari-kafəristan oldu, gəl.

Guşeyi-xəlvət açarkən, açmaz oldu könlümü,
Ol behşiti-cavidanım bəndi-zindan oldu, gəl.

Ey yüzün şəm`i-təcəlla, kakilin şəm`i-bəla,
Ruzigarım qarə, əhvalım pərişan oldu, gəl.

Vəqt üçün, Qövsi, çəkərdin intizari-cami-mey,
Əbri-gövhərbardən aləm gülüstan oldu, gəl.

* * *

Aşiqə sübhi-ümidü şami-hicrandır xəyal,
Bülbüli-məhcurə həm gül, həm gülüstandır xəyal.

Dərd dərman ilə toəmdir, əgər bina isən,
Hər qədər kim, vəsldir düşvar, asandır xəyal.

Gah yox yerdən açar yüz qəm niqabın çöhrədən,
Gah yüz min dərdi-bidərmanə dərmandır xəyal.

Bilmənəm kim, handayam,mən yerdəyəm, ya gögdəyəm,
Bəs müşəvvəşdir dimağ, əzbəs pərişandır xəyal.

Əhli-himmət mihmansız qalmağı düşvardır,
Şükrlillah kim, gözü könlümdə mehmandır xəyal.

Hər nə gəlsə aşiqə dildardən dildardır,
Düşməsə canan ələ, can çəkmə, canandır xəyal.

İnsü çinnü divü dəd vari müsəxxərdir ana,
Zahirən kim, xatəmi-mülki-Süleymandır xəyal.

Anlayan bir nitqdən yüz min kitab anlar sözün
Kim, könül bir qətrədir, dəryayi-ümmandır xəyal.

Zərrə-zərrə, üzv-üzvüm, hər biri bir yerdədir,
Bəs ki, Qövsi arzu cəmü pərişandır xəyal.

* * *

Çərxi-sərgərdan ilə dəstü giribandır könül,
Girdbadi-daməni-səhrayi-imkandır könül.

Sinədə həm qətrə, həm dəryayi-ümmandır könül,
Gah bir meyxanə, gahi bir ovuc qandır könül.

Kakilin tək kim, dönər öz mətləbincə başına,
Bir tərəfdən cəm`ü yüz yandan pərişandır könül.

Göz yumunca əglənib bir yerdə durmaz sinədə,
Sanasan simabdən sirabi-peykandır könül.

Lütf edib me`mar anı yüz rəng təmir eylədi,
Bilmənəm, yarəb, nə yüzdəndin ki, virandır könül.

Gövhəri-qəltani sərf etməkdə imsak eyləməz,
Didədir əbri-baharü bəhri-ümmandır könül.

Ah kim, xurşidi-aləmtab sübhi-vəsl ikən,
Şəm`i-bəzmi-bifüruğü şami-hicrandır könül.

Öz evin bica degil mən tək fəramuş eyləsə,
Ömrlərdir kim, sənin kuyində mehmandır könül.

Zövqsiz sanmın onu gər əzmi-cövlan eyləməz,
Böylə kim, aləmdə, Qövsi, təngi-meydandır könül.

* * *

Getmə, başın sədqəsi, ey sərvi-xoşrəftar, gəl,
Getdim əldən, ey dolanım başına, dildar, gəl.

Gəldi əyyami-baharü şur saldı aləmə,
Gəl, nə durmuşsan, daxi, ey saqiyi-xunxar, gəl.

Natəvanlığdan yəman düşdüm məni-bidəstü pa,
Gəl, əlimdən tut, ayağın sədqəsi, ey yar, gəl.

Qönçəyə pərvanə tək bülbül dönüb təkrar edər
Kim, yerin boşdur sənin, ey şəm`i-gülrüxsar, gəl.

Can nisar etməkdə bir ömr intizarın çəkmişəm,
Ey təbibi-bimürüvvət, ta həyatım var, gəl.

Naləsindən dərdi-sər çəkdin, müdara eylədin,
İmdi kim, dildən düşübdür Qövsiyi-bimar, gəl.

* * *

Xəndeyi-zirləbi üçün olma xunindil, könül,
Açılur ol qönçeyi-sirab, sən açil, könül.

Bağrına bas dağını, zəxm içrə yaşur bəxyəsin,
Xublər ehsanının, zinhar, qədrin bil, könül.

Gündə bir nəzzarə bəsdir çeşmi-məstindən mənə,
Bir sözü min hərf birdir, anlar isən dil, könül.

Cami-məydan oldu xurşidi-qiyamət aşkar,
Yatmış isən, aç gözün, gər məst isən, ayıl, könül.

Çəkmək istərsən nəfəs bəzmində yarın, ah kim,
Bir nəfəsdir vəsl əyyamında ayü il, könül.

Çün bilir əhvalını danistə, sormaz halını,
Özgədir xublər dili, gər bilməz isən, bil, könül.

Qövsinin yüz yerdə qəm tiği söküddür sinəsin,
Sən daxi bu rəxnələrdən aç gözün, açıl, könül.

* * *

Kuyində Xızr, dideyi-bidardır könül,
Tövfiq vardır ana kim, yardır könül.

Hansı dil ilə kimsə könül vəsfin eyləsin
Kim, hər qədər desən-deməsən, vardır könül.

Bihuşlər təəmmüli hüşyarə bənzəməz
Kim, bixəbərlığınca xəbərdardır könül.

Çox iztirab kuyinə getməkdə eyləmə,
Ahəstə, ey rəfiq ki, bimardır könül.

Ey şaxi-gül, sənin səri-kuyin əsiridir,
Hərçənd buyi-gül kimi səyyardır könül.

Qövsi, ayaq gedərmi səri-kuyi-yardən,
Ey mürği-pərşikəstə, giriftardır könül.

* * *

Salıbdır odlara ta şəm`i-rüxsarın məni, ey gül,
Mənimçün həm yanar pərvanə həm pərvaz edər bülbül.

Əgər can tazələr çeşmin, nigahın can olur, əmma,
Əgər zəncir ola zülfün, vəli zəncir üzər kakül.

Çırağı yandı eşqin məndənü mən eşqdən yandım
Bəli, məşhurdur küldən od olmaq zahir, oddan kül.

Münasibdir gözümdə əglənib aram əgər tutsan
Ki, sən sərvü mənim kipriklərimdir səbzə, çeşmim gül.

Mənə yol göstərib səhra yolun ol başladı əvvəl
Ki, Məcnun evi tək, könlüm kimi, yarəb, çöl olsun çöl.

Əgər xəlqi nəsimi-sünbülüstan tərdimağ eylər,
Vəli ol zülfi kakil nükhətindən ab olur sünbül.

Nə bakim var əgər sərgəştədir dil, qəd düta Qövsi
Ki, dəryalərdə könlüm kəştidir, çaylarda cismim pül.

* * *

Əgərçi xoşnəsimü tazə pürtab olur sünbül,
Vəli ol zülf ilə kakil yanında ab olur sünbül.

Məni pərvanə tək rəşk atəşi bitab edər ol gün
Ki, xəttin piçü tabından sərapa tab olur sünbül.

Nə yaxşı gündür ol günlər ki, xətti-səbz rəşkindən,
Binaguşin görüb şəm`i-təbi-mehtab olur sünbül.

Necə ol kakili-pürtab ilə olsun bərabər kim,
Nəsimi-xaki-rahindən sənin bitab olur sünbül.

Pərişan kakil ilə sən gülüstandan gedən yerdə,
Dəmadəm damənindən tutmağa qüllab olur sünbül.

Həsəddən gül düşər odlarə, mən tək dağ olur lalə
Ki, zülfün nükhətindən səbzə tək sirab olur sünbül.

Nə ümmid ilə, Qövsi, qönçə ikən açılım gül tək
Ki, bu gülşəndə axır xərci-piçü tab olur sünbül.

* * *

Əgərçi kəmsüxənü binəvayəm, ey bülbül,
Kənar tutma ki, mən aşinayəm, ey bülbül.

Sənə müyəssər olan bərgü bər zəkatı üçün,
Yetiş hərayimə kim, binəvayəm, ey bülbül.

Gətirmişəm iki dünyani dadü bidadə,

Nə qəm, əgər mən özüm bisədayəm, ey bülbül.

Gətir əgər, gül əgər, bərgi-səbz, hər nə ola,
Məni tez almaq olur, kəmbəhayəm, ey bülbül.

Əgərçi məcmərə təmkini məndən ögrəndi,
Sipəndi-mərəkeyi-hayi-hayəm, ey bülbül.

Durub oturmuşam əsbəs çəməndə güllər ilə,
Təmam bərgi-sərapa nəvayəm, ey bülbül.

Yəman əsərlü olur gərçi nalə rast bərast,
Həlaki-guşəvü tərzü ədayəm, ey bülbül.

Mənim yanımda sipehri-bülənd kutəhdir,
Əgərçi surət ilə narəsayəm, ey bülbül.

Gəl olma bu cigəri-parə-parədən qafil
Ki, yüz çəmən gül üçün xunbəhayəm, ey bülbül.

Həqir baxma mənə qeylü qal bilməz isəm
Ki, əhli-hal arasında bəlayəm, ey bülbül.

Yetişsə ərşə əgər nalə ilə başim kim,
Həman fətadə, həman xaki-payəm, ey bülbül.

Apardı huşimi, Qövsi, fəğan ilə, əmma
Xərabi-zümzümeyi-ahü vayəm, ey bülbül.

* * *

Baği-cənnətdən əgər göz yumsa Adəm, qəm degil,
Rövzeyi-kuyin sənin tərk eyləyən adəm degil.

Ey dolanım başına, bilsəm ki, sən qəmxarsən,
Yüz qəmü möhnət giribanım tutarsa, qəm degil.

Eşq dərdin bülhəvəs yanında izhar etmə kim,
Hər özün bilməz bu gəncin sirrinə məhrəm degil.

Şəbnəmi, ey çeşmeyi-xurşid, gözdən qoyma kim,
Az düşər sahibnəzər, hərçənd aşiq kəm degil.

Təşnəçeşməm mən, məgər könlüm məni sirab edə,
Yoxsa dəryalər hərifi-dideyi-pürnəm degil.

Hatəm oldur kim, güanhından keçər bir mücrimin,
Aləmin malü mənalından keçən Hatəm degil.

Əl-ayaq çox çalma, təslim ol, özün incitmə kim,
Böylə möhlik zəxm, Qövsi, qabili-mərhəm degil.

* * *

Zəxmi-tiğin xəlqdən bihudə yaşırmış könül,
Mümkün olmaz etməyə ol qönçeyi-sirab gül.

Şəm tək, zinhar, od yandurma, ey xurşidü mah
Kim, edər tədric ilə hər əxgəri əflak kül.

Bitəkəllüflərdən ol bibak ötməz sərgiran,
Bilsə kim, idrak mizanında ağırdır yünül.

Özgə xublər həm tutar çeşmimdə o sərvin yerin,
Bülbüli-məhcur əgər şəm istəyə, pərvanə gül.

Gəlmə, ey Məcnun, mənim ardımca, əqlin var isə,
Ahudan qət`i-nəzər qıl kim, yəman çöldür bu çöl.

Sənsiz, ey sərvi-səhiqamət, bu ağlar, ol gülər,
Könlümü almaqdan ötrü xah bülbül, xah gül.

Qaməti-xəm nola gər əşkim inanın tutmasa,
Bağlamaq mümkün degil dəryayi-bipayanə pül.

Ol qəzəl feyzindən üz vermiş sənə, Qövsi, bu kim:
"Bu imiş qismət Füzuli, xah ağla, xah gül".

* * *

Mən imtiyazi-məscidü meyxanə bilmənəm,
Yəni ki, qeyri-saqiyü peymanə bilmənəm.

Lal eyləmiş mənim dilimi heyrət, ey səba,
Bülbül sanur ki, naleyi-məstanə bilmənəm.

Ta bir piyalə saqiyi-xunxar verməsə,
Yüz kasə qan əgər içərəm, qanə bilmənəm.

Ey Xızr, eşq kuyinə yarın apar məni

Kim, bəs ki, sərxoşam, rəhi-meyxanə bilmənəm.

Ey şəm, mən ol atəşi-rüxsarı istərəm.
Pərvanə tək, nelim, hər oda yanə bilmənəm.

Ey nalə, söylə, Tanrı üçün, handadır könül,
Viranəmin yolun məni-divanə bilmənəm.

Mən peykərəm, gül olmaq üçün eylərəm şitab,
Ol nazənin sanur oda qatlanə blmənəm.

Yüz min dil ilə dərdimi ol zülfi-kakilə,
Sən söylə, mən bu dilləri, ey şanə, bilmənəm.

Mən vermişəm riza, anın öz rizasına,
Gərdun sanur ki, ahi-qəribanə bilmənəm.

Mən aşinalığın rəvişindən ki, ümdədir
Biganəyəm, vəli səni biganə bilmənəm.

Hər yanə dönsə qiblənüma, səcdədir işim,
Mən intixabi-Kə`bəvü bütxanə bilmənəm.

Bəzmində, ey sipənd, yanub anginən məni,
Mən xod bu gündə dustləri anə bilmənəm.

Ey eşq, anın yanında aradan götür məni,
Kim, mən özümdən özgəni biganə bilmənəm.

Ey bərq, etmədin mənə bir qatla iltifat,

Sandın məgər ki, öz oduma yanə bilmənəm?

Seyli-fəna yetirdi tozun ərşə könlümün,
Qövsi, hənuz mən onu viranə bilmənəm.

* * *

Vəslini peyvəstə, ey aşubi-dövran, istərəm,
İltifatın dəmbədəm, ey bərqcövlan, istərəm.

İstəməzlər  bərhəmənlər hiç büti-Çin vəslini,
Ol qədər kim, mən səni, ey namüsəlman, istərəm.

Qibləgahim, eylə bir tə`mir gahi könlümü,
Mən bu viran olmuşu hərçənd viran istərəm.

Mən ki, novgüllər gözündən düşmüşəm şəbnəm kimi,
Bir təvəccöh səndən, ey xurşidi-taban, istərəm.

Ta ola məqduri-bitabanə dönmək başına,
Kakilin tək könlümün halın pərişan istərəm.

Gül sənə ərzani, ey bülbül ki, mən mənzurimi,
Fitneyi-axırzəman, aşubi-dövran istərəm.

Bilmişəm kim, dərdi-eşqin qabili-dərman degil,
Mən ki, hər bidərddən ol dərdə dərman istərəm.

Olmasın kəm saqinin hərgiz başımdan sayəsi
Kim, meyi-gülgun verir, gər bir avuc qan istərəm.

Qoymadı cismimdə mişkin xalların bir qətrə qan,
Mən həmin sərpənceyi-şahini-müjgan istərəm.

Səndən özgə gərçi Yusif ərzi-rüxsar eyləyə,
Kafərəm, kafər, əgər, ey namüsəlman, istərəm.

Bir avuc toprağimi, rəhmi et, zəmingir eyləmə
Kim, mən anı girdbadi-dəşti-imkan istərəm.

Ruhi-Məcnuni sevərsən, bir dəm, ey zəncir, açıl
Kim, tutulmuş şəhrdən, könlüm, biyaban istərəm.

Ey nəsimi-kuyi-canan, bir təvəccöh qıl ki, mən
Çərx ilə toprağimi dəstü giriban istərəm.

Misrei-rəna sözün tək sahibi-təb`i-bülənd,
Qaməti-mövzunun, ey sərvi-xüraman, istərəm.

Ta şəbi-hicranını bir gün fəramuş eyləyim,
Taqi-nisyan olmuşam, əzbəs ki, nisyan istərəm.

Verdi öz kamimcə gərdün hər nə istərdim ki, mən
Dərdin artuq istərəm, hərçənd dərman istərəm.

Mən ki, Qövsi, sözlərimdən xunü-dərdu dağ axar,
Dərdi-səncü dağpərdazü süxəndan istərəm.

* * *

Həmişə şəm kimi, sərfi-piçü tab oldum,
Zəmanə hər kimi yandırdı, mən kəbab oldum.

Könüldən ötrü gözəl ömrümi təbah etdim,
Bu bir xərabə üçün xanimanxərab oldum.

Anın cəmalinə hər kim ki, baxdı, mən əridim,
Çəməndə özgəsi gül dərdi, mən gülab oldum.

Əgərçi xəlq deyər, gün çıxar, görər aləm,
Mənə göz açmadı hiç kim, gər afitab oldum.

Fəğan ki, dəhdə bir pul bəhamə vermədilər,
Əgərçi xuni-cigər birlə lə`li-nab oldum.

Oda düşən od olur, bəxti-vajguni görün,
Ki, mən bu odlar içində ərindim, ab oldum.

Yaxamdan əl götür, ey dil, nə aşinalıqdır
Ki, mən sənin oduna yandımü kəbab oldum.

Necə gördüm sənin ilə bərabər əğyarı,
Gözüm, sən ayinə aldın ələ, mən ab oldum.

Bu iztirab ilə hicran hekayətin Qövsi,
Demə, demə ki, sənin halına kəbab oldum.

* * *

Piçü tab cövhəri-tə`sirdən biganəyəm,

Gərçi mən mövci-nəsimi-naleyi-məstanəyəm.

Sübhlər mə`murəyəm, axşamlar viranəyəm,
Mən ki, bir xurşidi-taban şəm`inə pərvanəyəm.

Söhbətim ol Leyli ilə bağlamaz surət ki, mən
Bir özün bilməz, sözün zəbt eyləməz divanəyəm.

Çox mənə təklifi-məscid etmə, ey zahid ki, mən
Bu xəmidə qəd ilə mehrabi-atəşxanəyəm.

Tük ağardıvü qaradır ruzigarım eşqdən,
Keçdi əyyami-baharü mən həman divanəyəm.

Cüğd tək qanuni-təklifü təvazö bilmənəm,
Hər xərabın kim, olam mehmanı, sahibxanəyəm.

Nola qədrim bilməyib gər salsa gözlərdən məni
Kim, fələk kütahbin, mən mə`niyi-biganəyəm.

Etmə, Qövsi, badeyi-gülrəng təklifin mənə,
Mey sən iç kim, mən xərabi-cilveyi-məstanəyəm.

* * *

Bağban, gül sənin, ol şöleyi-rüxsar mənim,
Badeyi-nab sənin, saqiyi-xunxar mənim.

Çəmənin sərvləri vari sənə ərzani,
Ol nihali-qədü ol şiveyi-rəftar mənim.

Sərbəsər rövzeyi-rizvan sənin olsun, zahid,
Bir avuc xaki-dəri-yari-vəfadar mənim.

İltifat eylə, gözün sədqəsi, könlün xeyri,
Sil gözüm yaşini, al könlümü, ey yar, mənim.

Hər bilür-bilməzə əzbəs ki, məni yalvardır,
Aparır irzimi axır dili-bimar mənim.

Xudnümalıq yetər, ey nalə, nə qovğadır bu,
Qəmimi hər yetənə eylədin izhar mənim.

Hər ötən kimsə gülür gül kimi sənsiz günümə,
Gecəmə şəm kimi hər yetən ağlar mənim.

Hər qədər uymuş ola, düşməni-dirin yegdir,
Qara bəxtim yuxudan olmaya bidar mənim.

Nola gər ağzımı şirin edə bir gün, yarəb,
Bir-iki hərf ilə ol lə`li-şəkərbar mənim.

Əridər dağları dudi-nəfəsim şəm kimi,
Kaş əhvalimi heç sormaya dildar mənim.

Neyi-bibərgü bərəm, gərçi vücudim yoxdur,
Nə qədər dərd desən, yox demənəm, var mənim.

Qorxuram kim, dönüb insaf verib yar olalar,
Qəmi-pünhanimi gər bilsələr əğyar mənim.

Qara bağrım su olar, könlüm açılmaz, Qövsi,
Dilimi xamə kimi açmasa göftar mənim.

Qövsi, bu ol qəzəli-nəğzi-Füzulidir kim:
“Nalə ilə başım ağrıtdı bu bimar mənim”.

* * *

Yıxdın məni, ey saqiyi-dövran, neləmişdim,
Yaxdın məni, ey atəşi-hicran, neləmişdim.

Avareyi-deyrü hərəməm qaşin ucundan,
Ey qibleyi-hər gəbrü müsəlman, neləmişdim.

Həsrət məni öldürdü, nəsib olmadı tiğin,
Ey ruhü rəvanım, sənə qurban, neləmişdim.

Pərvanə kimi dün gecə vari pərü balim,
Yandırmadın, ey atəşi-suzan, neləmişdim.

Dindirmədivü dinmədivü sormadı halim,
Yarəb, nə demişdim, məni-heyran, neləmişdim.

Döndi başına, kakili-pabusuna yetdi,
Bilməm ki, məni-zari-pərişan neləmişdim.

Ol ayinərü ayinəmin sildi qübarın,
Qövsi, ana layiq məni-heyran neləmişdim.

*   *   *

Neylərdim əgər bağrımı qan eyləməsəydim,
Gözdən onu kuyində rəvan eyləməsəydim.

Dərdi-dilimi, ney kimi təqrir elə bilməm,
Ey vay, əgər ahü fəğan eyləməsəydim.

Güllər gözümə şəm tək eylərdi məhəbbət,
Odlu dil ilə şərhü bəyan eyləməsəydim.

Hicranın əlindən məni, yarəb, kim alurdı,
Can tərkini, ey cani-cəhan, eyləməsəydim.

Bəs neylər idim dinü dilü ruhi-rəvani,
Qurban, sənə, ey sərvi-rəvan, eyləməsəydim.

Könlümdə yaşurdum qəmini, müşkil olardı,
Ol gənci bu viranda nihan eyləməsəydim.

Hicran günü meyl etməz idim badəyə, Qövsi,
Əşk ilə bu qan olmuşu qan eyləməsəydim.

*   *   *

Necə bir, yarəb, səhiqamətlərə heyran olum
Kim, deyibdir kim, gərək peyvəstə sərgərdan olum.

Vəh ki, me`marı-əzəl bu növ təsvir eyləmiş
Kim, qəmin seylab ola, mən gəncü mən viran olum.

Ömrlərdir kim, olubsan ol büti-Çin məskəni,
Ey hərimi-Kə`beyi-dil, mən sənə qurban olum.

İstəməz ol şəm kim, pərvanə fariğbal ola,
Könlümü incitmə, həmdəm, qoy məni giryan olum.

Balımı yandırmagil, ey şəm, canım, yaxmadin,
İstərəm kim, dönə-dönə mən sənə qurban olum.

Hər gecə yüz min qəmü dərdin qonağımdır mənim,
Bir gecə, yarəb, nola mən həm sənə mehman olum.

Qamətim, Qövsi, fələk bükdisə budur vəchi kim,
Eşq meydanında mən həm kuy, həm çövkan olum.

* * *

Ney kimi ləbrizi-fəryadəm, əsər müştaqiyəm,
Novnihali-gülşəni-dərdəm, səmər müştaqiyəm.

İllərü aylar vətəndən ayrılan avarətək,
Bir zəman kuyindən ayrılsam, xəbər müştaqiyəm.

Öylə kim, bibalü pər quş meyli-pərvaz eyləyə,
Əl-ayağım bağlıdır, əmma səfər müştaqiyəm.

Var dərdim çox, vəli dərd əhli azdır dəhrdə,
Gövhəri-biqiymətəm, sahibnəzər müştaqiyəm.

Sərvqədlər çeşmimə xarsəri-divardır,
Bəs ki, mən ol novnihali-simbər müştaqiyəm.

Balü pərsiz quşların öz aşiyanı damdır,
Bu səbəbdəndir ki, kuyindən səfər müştaqiyəm.

Odlanır balü pərim, Qövsi, xəyali-dəhrdə,
Xub mühəyya xərmənim var, bir şərər müştaqiyəm.

* * *

Çox Kə`bədə sə`y etdim, meyxanəyə tuş gəldim,
Ta hər ikidən keçdim, cananəyə tuş gəldim.

Cəhd ilə nəsibindən kimsə keçəməz, zahid,
Mən məscidə əzm etdim, meyxanəyə tuş gəldim.

Bir yağiyi-dilbilməz adını könül etmiş,
Zəncirə baş endirməz divanəyə tuş gəldim.

Öz şəm`ini unutdu, yandı mənim odumğa,
Hicran gecəsi gər mən pərvanəyə tuş gəldim.

Ülfətlü pərivəşlər şükrün deməməklərdən,
Axır bir özündən həm biganəyə tuş gəldim.

Öz babını hər kimsə hər yerdə tapar, Qövsi,
Mən hər yana kim, getdim, divanəyə tuş gəldim.

* * *

Ey ki, hərgiz səhv birlə etmədin yadım mənim,
Yadın ilə xatirimdən oldu məhv adım mənim.

Könlümü qoydum göz üstə, oldu viran, dustlər,
Aqibət, ol rəxnədən bu möhnətabadım mənim.

Sübhi-məhşər kim-kimə pərva qılır, hicran günü,
Nola ölsəm, etməsə bir kimsə imdadım mənim.

İztirabım qeydi-bimindən degil, qorxum budur
Kim, çıxa can, olmaya agah səyyadım mənim.

Tiği tündü dəstü bazusi qəvidir, heyf kim,
Eyləməz pərva, ötər bibak cəlladım mənim.

Ta qəm artar, ömrüm artar, çıxsa qəm, canım çıxar,
Bəs ki, xu salmış qəminlə cani-naşadım mənim.

Qamətin yadilə hərgəh naləvü ah eylərəm,
Xəm bulub gərdun edər tə`zimi-fəryadım mənim.

Qanlusudur könlümün, Qövsi və əşkim şahidim,
Yetdi tiğin qövrimə, sən daxi ver dadım mənim.

* * *

Xətti-yaquti-ləbindən baş çıxarmaz hiç kim,
Bəs ki, çahi-qəbqəbindən baş çıxarmaz hiç kim.

Çərx kimi gah yıxarsan, gah yaparsan könlümi,
Bu müşəvvəş mətləbindən baş çıxarmaz hiç kim.

Gündə xalın yüz siyəhbəxtin günün eylər qara,
Ol zavallı kövkəbindən baş çıxarmaz hiç kim.

Eşigində hiç sultanın gədadən fərqi yox,
Padşahim, mənsəbindən baş çıxarmaz hiç kim.

Şikveyi-bica ilə Qövsi, icabətdən utan,
Sən ki, yarəb-yarəbindən baş çıxarmaz hiç kim,

* * *

Fəraqindən sənin, ey novgül, əfğan etməyim, neylim,
Özüm tək əndəlibin bağrını qan etməyim, neylim.

Əgərçi gün çıxar, aləm görər, məşhurdur, saqi,
Xəyalın pərdeyi-çeşmimdə pünhan etməyim, neylim.

Mənim varü yoxundan aləmin bir nəqdi-canım var,
Sənə təslim onu, ey düşməni-can, etməyim, neylim.

Vidai-can isə asan, fəraqi-yar müşküldür,
Təbibim, gər bu möhlik dərdə dərman etməyim, neylim.

Əgərçi zə`fdən cismimdə yoxdur bir avuc qan həm,
Onu gər Kə`beyi-kuyində qurban etməyim, neylim.

Görəndə bülbül ilə güllərin amizişin mən həm,
Fəğan ilə ana gülzarı zindan etməyim, neylim.

Əgərçi bidəvadır dərdi-ruzəfzuni üşşaqın,
Həyatım nəqdini gər sərfi-dərman etməyim, neylim.

Mənim könlüm olubdur səngdil bütlər evi, Qövsi,
Səvab üçün onu mən daxi viran etməyim, neylim.

* * *

Sənə nəzzarə girandır, boyun bəlasın alım,
Məgər bu şivə yamandır, boyun bəlasın alım.

Rəqibə görmə rəva sürmə xaki-rahından
Ki, gözlərinə ziyandır, boyun bəlasın alım.

Kənar tutması yegdir gözüm bulağından,
Qədin ki, sərvi-rəvandır, boyun bəlasın alım.

Gözümdə yer sənə həm qalmamışdır, əzbəs kim,
Xəyalın onda nihandır, boyun bəlasın alım.

Verir həyati-əbəd Qövsiyə təkəllüm ilə,
Ləbin ki, düşməni-candır, boyun bəlasın alım.

* * *

Hərçənd rəşkdən məni-biçarə yanıram,

Hicranın oduna yanan əğyarə yanıram.

Hər gün bir özgə rəng ilə ol aftab ötər
Kim, günbəgün, lövünbəlövün odlarə yanıram.

Bir yanmaq ilə canını pərvanə qurtarar,
Mən yazuğam ki, hər gecə bir parə yanıram.

Mən daxi bikəsəm, xəbərim var dərddən
Kim, şəm yerinə dili-bimarə yanıram.

Kimisi mehrinə güvənir, kimi nazına,
Biçarə mən ki, həm yoxa, həm varə yanıram.

Səbr eylərəm bu təşnəligə hər rəviş ki, var
Əmma təmizi-əbri-göhərbarə yanıram.

Təsbih açdı zahidi-əfsürdə müşkilin,
Qövsi, sənin belindəki zünnarə yanıram.

* * *

Gecə şəm`i-rüxün yad eyləyib məhtabə yalvardım,
Səhər mehrin anıb xurşidi-aləmtabə yalvardım.

Nəmazimdən mənin taət degildi mətləbim, saqi,
Xəmi-əbrulərin mənzur edib, mehrabə yalvardım.

Mənim hər kiprigim bir odlu dildir şəm tək, əmma

Gözümü bağlayandan sonra ol qəssabə yalvardım.

Təsəlli vermədi sübhi-giribanından ol şəm`in,
Çırağı yanmamış viranədə məhtabə yalvardım.

Səba bir sözbaşı bitablərdən açdı, əmma mən,
İki yüz dil töküb ol sünbüli-purtabə yalvardım.

Şəbi-hicran usanmaz, hic vəchilə səbah olmaz,
Dünən hərçənd mən xurşidi-aləmtabə yalvardım.

Əgər düşmənlərə yalvarsa idim, rəhm edərlərdi,
Bu rəng ilə ki, mən yavuncidim, əhbabə yalvardım.

Sipənd etdi məni hərçənd kim, bəzmində cananın,
Zəbani-hal ilə, Qövsi, dili-bitabə yalvardım.

* * *

Dün kuyinə yarın dəli vardım, dolu gəldim,
Əmma bu gün onda diri getdim, ölü gəldim.

Başdan aparan əqlimi başdan aparıbdır,
Mən bu yerə səhrayi-ədəmdən dəli gəldim,

Hərçənd kiçiklər nəzərində kiçik oldum,
Kəm baxma mənə kim, ululərdən ulu gəldim.

Qəflət sitəmindən qılıram başıma küllər,

Bilsəm ki, nə yerdən, nədən ötrü, nəlü gəldim.

Qövsi, meyi-gülrəngi sən iç dəhrdə kim, mən
Təbxali-təbi-eşq ilə odlu, sulu gəldim.

* * *

Tərəhhüm etmədi, hərçənd yandım, yarə yalvardım,
Dilim lal olsa idi kim, dönüb əğyarə yalvardım.

Bu gecə, ey könül, sən handa idin kim, məni-bikəs,
Dolandım başına şəm`in, dərü divarə yalvardım.

Ağız açıb gözüm yumdum gözinə qarşu əğyarın,
İtinə bir havur yavuncidim, bir parə yalvardım.

Mən ol bimehr ilən, yarəb, nə tədbir eylədim, bilməm,
Əgər aşiq gərək məşuqinə yalvarə, yalvardım.

Cünuni-bimürüvvət bəs ki, çaldı daşlara başim,
Düşüb toprağlarə seylab tək kuhsarə yalvardım.

Mənə pərvanə tək bir ləhzə iqbal etmədi hərçənd,
Zəbani-hal ilə ol atəşin rüxsarə yalvardım.

Əgər zahirdə tutmazdı dilim tüğyani-heyrətdən,
Vəli mə`nidə bir özgə dil ilən yarə yalvardım.

Qənaət eylədim öz üstüxanım naləsi birlə,
Nə neydən bir nəva umdum, nə musiqarə yalvardım.

Giriban çak olub qan oldu, Qövsi, qönçənin bağrı,
Bu rəngilə ki, mən ol lə`li-gövhərbarə yalvardım.

* * *

Handa bir dərd əhli var, bağü baharımdır mənim,
Hər kimin bir dağı olsa, laləzarımdır mənim.

Çeşmi-ümmidim çırağıdır yanan pərvanələr,
Naleyi-bülbül nəsimi-novbaharımdır mənim.

Ləxt-ləxt olmuş cigərlərdir kəbabım bəzmdə,
Kasə-kasə xuni-dil abi-xümarımdır mənim.

Qəti`i-rahi-Kə`beyi-kuyində tənhayəm, vəli
Himməti-ərbabi dərdü dağ yarımdır mənim.

Gər sən, ey Leyli, məni-Məcnuni zəncir etməsən,
Şirlər ahuyi-mişkin tək şikarımdır mənim.

İltifat etmək nə lazımdır, təbibim, özgəyə,
Hər qədər dərmanın olsa, dərd varımdır mənim.

Yar netsin, neyləsin, əğyar kim, hər dəm məni,
Yandıran odlarə yanmış ruzigarımdır mənim.

Ey bəlayi-əhli dil, biçarəyəm, ver könlümü
Kim, bu viran ev bəlalərdən hisarımdır mənim.

Gər yəmandır xarlıq, Qövsi, sən et pərva ki, mən
Aşiqəm, aşiq bu ovci-e`tibarımdır mənim.

* * *

Mən məst idim, ol məst ilə axır belə düşdüm,
Düş fikrimə, saqi ki, yəman müşkilə düşdüm.

Pərvanəvü bülbül kimi bitab degildim,
Bilmən neçün odan-oda, dildən- dilə düşdüm.

Qüdsilər ilə aləmi-əqdəsdə gəzərkən,
Yarəb, neləmişdim ki, bu abu gilə düşdüm.

Nacinslərin söhbətini məndən eşit kim,
Mən bir neçə gün bir neçə hüşyar ilə düşdüm.

Ol kuyi dedim tərk eləyim, tərki-sər etdim,
Çün öz gücum ilə elə durdum, belə düşdüm.

Məcnun olub ol Leyliyi-aləm tələbində
Evdən evə, çöldən-çölə, eldən-elə düşdüm.

Sordu ki, mənim dərdimə, Qövsi, necə düşdün,
Baş qoydum əyağinə ki, saqi, belə düşdüm.

* * *

Sanma kim, Məcnun kimi ahulərin dustaqiyəm,
Mən əli qanlu, gözü qanlulərin dustaqiyəm,

Görməmişsən xublərdən piçü tabü zülfü xət,
Bil ki, mən, zahid, olardan bulərin dustaqiyəm.

Bir gün ol birəhmdən bir guşeyi-çeşm istədim,
Ömrlərdir guşeyi-əbrulərin dustaqiyəm.

Xali-rüxsari məni yıxdı, müsəlmanlar, görün
Rum içində göz görə hindulərin dustaqiyəm.

Məndə çün Qövsi kimi ol dilrüba dil qoymamış,
Bilmənəm, yarəb, neçün dilculərin dustaqiyəm.

* * *

Hərçənd keçdi, bülbül, yüz rəng ilə baharım,
Bir nalə ilə yetdi əncamə ruzigarım.

Gəldivü getdi, saqi, əyyami-novbaharım,
Bir sağər ilə, zalim, sındırmadın xümarım.

Ta iltifat oduna yandırmaq ola mümkün,
Layiq degil təğafül, ey atəşin üzarım.

Eşq içrə aftabəm, əmma sənin yanında
Ey kaş ki, olaydı bir zərrə e`tibarım.

Mən handa, şəhr handa, ey Leyli, aç ayağım
Kim, ahulər çəkirlər çöllərdə intizarım.

Başim alub çıxardım dünyayi-bivəfadən,
Olsaydı gər əlimdə bir ləhzə ixtiyarım.

Bir ömr mən yanınca odlarə möhnət ilə
Bir gün nolurdu, yarəb, yansaydı ruzgarım.

Ey nalə, tarü pudim ol bəzmdə dağıtma
Kim, başə savururlar pərvanələr qübarım.

Sən verməyincə, saqi, bir sağər öz əlindən,
Dəryalər ilə dolmaz peymaneyi-xümarım.

Ol ruzgardən kim, Məcnun salıb gedibdir,
Dəşti-cünun çəkibdir peyvəstə intizarım.

Mən bilmənəm təkəllüf, hər kim qonağım olsa,
Meyxanələr evimdir, viranələr hisarım.

Qövsi, bu ol qəzəldir kim, söyləmiş Füzuli:
“Ha böylə möhnət ilə keçsinmi ruzigarım”.

* * *

Xəzan fəslində girdim bağə, yadi-novbahar etdim,
Sirişki-al ilə ol sərzəmini laləzar etdim.

Nə güllər dərmədim hər bərgi-zərdü sürxdən, saqi,
Xəzan bağində yadinlə sənin seyri-bahar etdim.

Dağıtdı hər nihal öz sürxü zərdin, mən də yadinlə
Dili-sədparəmin hər parəsin bir yol nisar etdim.

Nə bağü aşiyan qeydində qalmışsan ki, mən, bülbül,
Vücudim tarü pudin gülsitan tək tarü mar etdim.

Yolum gər rövzeyi-rizvanə düşsə, könlüm əglənməz,
Səri-kuyinə yarın ol zəmandan kim, güzar etdim.

Fəğanımdan qızardı lə`l tək ol səbzi-təhgülgun,
Şərari-ahilə əbri-baharı şö`ləbar etdim.

Dedim bir nalə ilə bülbülün, Qövsi, alım könlün,
Fəğan kim, ol bəlakeş aşiqin dərdin həzar etdim.

* * *

Mən axır könlümü çün zülfünə, ey yar, bağlardım,
Əzəldən kaş kim, Sən`an kimi zünnar bağlardım.

Əlində aciz oldum, əl götürdüm öz xərabəmdən
Ki, mən seylab önün, ey bəhri-ləngərdar, bağlardım.

Ayaqdan saldı mina tək məni peymaneyi-çeşmin
Ki, mən gərdun əlin, ey saqiyi-xunxar, bağlardım.

Nəvayi-naləmi gər istəsəydi kim, nə qanundur,
Çalardı çərx ol tənburi kim, mən tar bağlardım.

Haçan təsbihə, zahid, aşiqi-heyran könül bağlar,

Əlim tutsaydı, ey biaqibət, zünnar bağlardım.

Xəbərdar olmadım göz arizin əvvəl görən yerdə
Ki, mən ol rəxnəni hər rənglə kim var, bağlardım.

Haman sən yandırırdın könlümü odlarə sinəmdə,
Əgər mən göz yolun, ey atəşinrüxsar, bağlardım.

Dələrdi sinəmi könlüm mənim peykan kimi, Qövsi,
Əgər mən eşq razından ləbi-izhar bağlardım.

* * *

Ney kimi çün binəvalər naləsin yad eylərəm,
Sən tək, ey bülbül, dilim tutduqca fəryad eylərəm.

Ömrümü hərçənd dəm urduqca bərbad eylərəm,
Ney kimi, dilsizlərə bir nalə imdad eylərəm.

Ah kim, dağlarda seylab eyləyən şivən kimi,
Hiç kim rəhm eyləməz, hərçənd fəryad eyələrəm.

Bir cünun sərgəştəsi, dərd əhli yoxdur şəhrdə,
Mən varub səhralərə Məcnunu ustad eylərəm.

Çün gözü könlümdə səndən qeyri yoxdur hiç kim,
Hər kimi yad eyləsəm, saqi, səni yad eylərəm.

Nəğmeyi-tər bilmənəm, hərçənd bülbüllər kimi

Nalə ilə gah-gah öz könlümü şad eylərəm.

Dustlər, bir dəm götürməz ol xərab abadlıq,
Könlümün viranəsin hərçənd abad eylərəm.

Gərçi, Qövsi, qeyrsən sən, həm vəli biçarəsən,
Bir sifariş gər əlimdən gəlsə, imdad eylərəm.

* * *

Yox özümdən xəbərim, ney kimi ta var əsərim,
Yanaram şəm kimi, yoxdur özümdən xəbərim.

Qönçeyi-lalə kimi bağlıdır ağzım, əmma
Görünür pərdədə xuni-dilü daği-cigərim.

Yandırır naləmü heç vəchlə təqsir etməz,
Xarü xəsmi bilir ol şö`lə mənim balü pərim.

Cüstücuyində anın gərçi itirdim özümü,
Mənim ol gövhəri-yekdanə itirməz nəzərim.

Getdimü bir yerə yetdim ki, bu səhralərdə,
İstəyənlər məni Məcnundən alırlar xəbərim.

Gərçi əhvali-xərabım sənə puşidə degil,
Könlümün halını bir sorginən, ey didələrim.

Səri-sövdazədə əfsun ilə gəlməz özünə,
Yeri, ey daği-cünun, verməginən dərdi-sərim.

Qövsi, bu ol qəzəli-nəğzi-Füzulidir kim:
“Necə ah eyləməyim, ah, yanıbdır cigərim”.

* * *

Öylə kim, mən olmuşam sərməst, hüşyar olmanam,
Yüz qiyamət gəlsəvü getsə, xəbərdar olmanam.

Öylə sərməstəm ki, tiği-qəmzə ilə xublər,
Yüz tərəfdən yarsələr bağrım, xəbərdar olmanam.

Öylə kim, mən olmuşam xabü xəyali-yar ilə,
Var, özün incitmə, ey naseh ki, bidar olmanam.

Bir nigahi-guşeyi-çeşm ilə ta aldın məni,
Satsalar yüz Yusifi-Misri, xəridar olmanam.

Ta əsir etmiş məni çini-kəməndi-kakilin,
Çəksələr zəncirə yüz yerdən, giriftar olmanam.

Gərçi mən bir müşti-xakəm, simü zərdir özgələr,
Bir məta üçün olar tək xərci-bazar olmanam.

Etmişəm hər safü dürdi bir-birində imtiyaz,
Yarə əğyar olmanam, əğyar ilə yar olmanam.

Əl götür, ey bərəhmən, yüz salma, ey zahid ki, mən,
Seydi-deyrü Kə`bəvü təsibhü zünnar olmanam.

Gərçi, Qövsi, saldı zəxmi-xunçəkan işdən məni,
Ta əlim var oynaram qanımla, bikar olmanam.

* * *

Ayaqdan gərçi fərq olmaz mənim xurşid tək başım,
Yetər əmma mənimlə mənzilə bir gündə yoldaşım.

Çəkəndə surətim, gər istəsə çəksin könül tərhin,
Gərək etsin mənim kipriklərimdən xamə nəqqaşım.

Mənə həmkasə olmaq istəyən bidərd bilsin kim,
Şəhidi-eşqəmü qan ilə yoğrulmuş mənim aşım.

Fəğan etməz məni xali həvayi-eşqdən ney tək,
Damədam naleyi-bica əbəs ağrıtmasın başım.

Sənə bir nalə imdad eylərəm, hərçənd kim, bülbül,
Hənuz azdır, əgər ağlar mənimçün yaru yoldaşım.

Mənə gövhər degil məqsud, əmma var ümidim kim,
Fəramuş etməsin toprağımı əbri-göhərpaşım.

Yüz ildir kim, mənə xurşid iqbal eyləmiş, Qövsi,
Əgərçi qətreyi-şəbnəmdən əksikdir mənim yaşım.

* * *

Etmədin əndişə, ey gərdun, fəğanımdan mənim
Zahirən dolmuş qulağın əlamanımdan mənim.

Mən öləndən sora məndən, ey hüma, əndişə qıl
Kim, anın peykanı çıxmaz üstüxanımdan mənim.

Sübhi-vəslü şami-hicran naləvü ah eylərəm,
Ney kimi bir mətləb anlanmaz fəğanımdan mənim.

Eylərəm iftanü xizan həminanlıqlar sənə,
Gər nişanım var, səba, sərvi-rəvanımdan mənim.

Gərçi hər bimarin əhvalin bilirlər nəbzdən,
Dərdimi anlar təbibim üstüxanımdan mənim.

Padişahi-mülki-fəqrəm, hər yana əzm eyləsəm,
Dövlətü iqbal ayrılmaz inanımdan mənim.

Məğzi-canım yandırıbdır fəqr, tutman xar anı
Kim, hüma istər səadət üstüxanımdan mənim.

Piçü tabi-şərmi-vəslin məndə çün can qoymadı,
Bilmənəm, yarəb, nə istər hicr canımdan mənim.

Çünki heyrət əl-ayağım bağlamış zəncir ilən,
Ey həya, sən həm nə tutmuşsan inanımdan mənim.

Ey nişani-xanimanim istəyən bidərdlər,
Eyləmiş pərvaz ənqa aşiyanımdan mənim.

Gər bu rəngilə meyi-gülgun alır məndən məni,

Saqiya, qalmaz əsər namü nişanımdan mənim.

Keçmək olmaz natəvanlardan, nə üzdən navəkin,
Yan verir, ey şeyx, kəman keçdikdə yanımdan mənim.

Tiğinə gər can nisar etsəm, gər imsak eyləsəm,
Hər günah etsəm keç, əmma keçmə qanımdan mənim.

Qövsi, ondan qeyri kim, könlüm onun yanındadır,
Hiç kim vaqif degil, yaxşı-yəmanımdan mənim.

* * *

Nə bir gün rahətim vardır, nə bir dəm səbrü aramım,
Bu rəngilə mənim, yarəb, nola axır sərəncamım.

Fəğan kim, ta məni-nadan qaradan ağı fərq etdim,
Nə doğru sübhdür, nə bəlli şamdır mənim şamım.

Dolubdur çoxların peymanəsi, ey dil, şitab etmə
Ki, çərxi-səngdil bir yerdə axır doldurur şamım.

Nədir tədbir, çün hər başda var bir əql, ey Məcnun
Ki, bir ahuyi-vəhşidir mənim könlümdə aramım.

Sən, ey badi-səba, çün dil bilirsən, mətləb anlarsan,
Duadan qeyri-yoxdur ol güli-bixarə peyğamım.

Məni-dəryakəşi meyxanələr məst eyləməz, əmma
Təbəssümdən, təkəllümdən mənim, ləbriz olur canım.

Məni hərçənd gümnam etdi eşq avazəsi, Qövsi,
Ümidim var məhəbbətnamədən məhv olmasın namım.

* * *

Natəvanlıqlar mənim əzbəs əritmiş peykərim,
Eylər ağırlıq mənə sərbar tək balü pərim.

Mən daxi üşşaq içində nola gər mümtaz olam,
Dilrübalər arasında çün ələmdir dilbərim.

Şəm\`i-hər pərvanəyəm, ta şəm\`inə pərvanəyəm,
Tutiyayi-dideyi-əhbabdır xakistərim.

Mən mühəqqər zərrəyəm, ey mah, sən xurşidsən,
Olmasa gər pərtövi-hüsnün, görünməz peykərim.

Kövkəbi-iqbalımı sanmın qaradır çərxdə
Kim, olur pərvərd ol xakistər içrə əxkərim.

Gün füruğundan olur tək sabitü səyyarə məhv,
Cismü canım eşqdən yanmış, dağılmış ləşkərim.

Səngbar eylərdi çərxi-təngçeşm ayinəmi,
Şükr kim, simab tək gözdən nihandır cövhərim.

Ah, bilməm neyləyim bir böylə kasid mülkdə
Kim göz örtüb hiçə həm satmam, girandır gövhərim.

Qövsi, ol rəna qəzalidir Füzulinin bu kim:
“Şahi-mülki-möhnətəm, tutmuş cəhanı ləşkərim”.

* * *

Ah, bilməm neyləyim kim, yardən ayrılmışam,
Yari-şirinkari-xoşgöftardən ayrılmışam.

İltifat eylərmiyəm, ey nazəninlər, sizlərə,
Mən ki, bir nazafərin dildardən ayrılmışam.

Ah kim, candan olur tək cismi-qəmpərvər cüda,
Məndən ayrılmış könül, mən yardən ayrılmışam.

Gəl qəfəs çakindən, ey bülbül, həmavaz ol mənə
Kim, sənin tək mən də bir gülzardən ayrılmışam.

Gəl bu küldən savur, ey pərvanə, sən həm başə kim,
Mən daxi bir atəşinrüxsardən ayrılmışam.

Nola tutsam şişeyi-minayi gərdun qanını,
Nimməstəm, saqiyi-xunxardən ayrılmışam.

Çeşmimə şaxi-güli-bixar növki-xardır,
Ta mən ol sərvi-səbükrəftardən ayrılmışam.

Bir zəman qoymazsız, ey qəmlər, giribanım mənim,
Bu mənə yetməzmi kim, qəmxardən ayrılmışam.

Məndən ögrən səxtcanlıq şivəsin, Qövsi ki, mən,

Ömrlərdir kim, dilü dildardən ayrılmışam.

* * *

Ömrlər bağrımı mina kimi qan eyləmişəm
Kim, anı saqi əyağinə rəvan eyləmişəm.

Hiç kim, könlümü bilməz kim aparmış, əmma
Mən anın ağzını bir zərrə güman eyləmişəm.

Dilnişin navəkini kimsə mənim tək tanımaz
Ki, anın zəxmini yüz yerdə nişan eyləmişəm.

Kimə kim, nəqdi-rəvanım deyəsən, tapşurdum
Ki, sənə nəzr onu, ey sərvi-rəvan, eyləmişəm.

Basmışam bağrıma peykanın ilə zəxmin anın,
Birinin dil, birinin adını can eyləmişəm.

Bir nəfəs fariğ oturmaz mənim azarimdən,
Bilmənəm çərxlə, Qövsi, nə yaman eyləmişəm.

* * *

Bu ağır dərdilə sərgəştəvü bisəbrü bitabəm,
Əgər dəryayi-bipayanəm, əmma eyni-girdabəm.

Hübabi-bibəsər tək xodnümalıq məndən umman kim,
Əgər gövhər həm olsam, öz yanımda qətreyi-abəm.

Əgər rigi-rəvan tək təşnəçeşməm, saqiya, əmma
Xəyali-lə`li-nabindən sənin yaquti-sirabəm.

Əgər can çıxsa təndən, ey təbibi-dərdi-bidərman,
Kim, olmaz iztirabi nəbzimin əzbəs ki, bitabəm.

Gəlir zinharə dağü daş məndən novbahar olcaq,
Məni Məcnunə bənzətmin ki, mən həm çeşmim seylabəm.

Nə bilsin cövhərim ol kim, onun rüxsari yanında
Füruğim zahir olmaz şəm`i-ruzü sübhi-məhtabəm,

Meyi-gülgun sən iç dəf`i-qəmi-dünya üçün, Qövsi
Ki, mən əşki-rəvandan padişahi-aləmi-abəm.

*   *   *

Bu səhralərdə gər xari-müğilandan cəfa gördüm,
Səni, ey Kə`beyi-məqsud, xoş gördüm, səfa gördüm.

Sipehri-süflədən ömrümdə ta gördüm, cəfa gördüm,
Nə bir mehr aftabindən, nə mahindən vəfa gördüm.

Həmin iksir tək bir ad eşitdim aşinalıqdan,
Həqiqət mənzilində kafərəm gər aşina gördüm.

Məhəbbət safü biğəş kimyadır, düşsə bil qədrin
Ki, çox bimüddəalər çöhrəsindən müddəa gördüm.

Cəhan xəlqindən umman əşkü ah, ey əhli-dil kim, mən
Anın şahu gədasin bəndeyi-abü həva gördüm.

Pəs ol gənci-nihan kim, axtarırlar, handadır, yarəb
Ki, hər viranə baş çəkdim, onda əjdaha gördüm.

Dolanım başına ol məsti-nazın kim, anın, Qövsi,
Səgi-kuyinə gər bir mehr göstərdim, vəfa gördüm.

* * *

Aşiqəm, mən dövlətü malü mənali neylərəm,
Bərgü bərdən yummuşam göz, şaxü bali neylərəm?

Yeg gəlir bir qönçeyi-məstur yüz güldən mənə,
Yari-sahibdil gərək, sahibcəmali neylərəm?

Handa olsam buyi-gül tək rövzeyi-kuyindəyəm,
Naməvü peyğam üçün badi-şimali-neylərəm?

Səbzələr üstündə şəbnəmdən dolubdur gözlərim,
Hüsni-mə`ni istərəm, mən xəttü xali neylərəm?

İstərəm vəslin ki, yarın aşina olmaz mənə,
Gər xəyalın ram ola, bəzmi-vüsali neylərəm?

Sən nəfəs çağ elə, ey ney, gər usandın nalədən,
Mən-həvayi-kuyi-eşqəm, e`tidali neylərəm?

Gər veribsən dövləti-didari-canan, ver, fələk,

Yoxa mən mehmani-fəqrəm, mülkü mali neylərəm?

Tarü pudi aləmin əfsanəvü neyrəng imiş,
Mən bu batil xabi-bihasil xəyali neylərəm?

Ləzzəti-didardən, Qövsi, mənə heyrət yetər,
Əldə ta ayinə var, abi-zülali neylərəm?

* * *

Sanma könlüm tək mənim dərd əhli çox var, ey həkim,
Var, əmma az düşər bir böylə bimar, ey həkim.

Qorxum oldur kim, təbibim əl çəkib bikar ola,
Yoxsa pünhan dərdimi eylərdim izhar, ey həkim.

Anlamaz hər kimsə dilsiz xəstənin imasını,
Tanrı üçün, olginən məndən xəbərdar, ey həkim.

Gər dəvadır cami-mey, əvvəl məni məst eylə kim,
İçmək olmaz böylə acı suyi hüşyar, ey həkim.

Gərçi müşkildir bu qanun tarini saz eyləmək,
Odlu nəbzimdən mənim əl çəkmə, zinhar, ey həkim.

Et əlacım var isə, dərman sup bimarinə
Kim, məni bir özgə dərd etmiş giriftar, ey həkim.

Laf bəsdir gər əlacın Qövsiyi-biçarənin
Eyləsin, eylər Fəlatun əczə iqrar, ey həkim.

*  *  *

Hərçənd bəzmi-vəsldə canana yetmişəm,
Ta canı tapşurunca ana, canə yetmişəm.

Ta əzmi-kuyin eyləmişəm bir ümid ilə,
Əvvəl qədəmdə rövzeyi-rizvanə yetmişəm.

Hərçənd bilmənəm dili-bitab qədrini,
Yüz gənc keçmişəm ki, bu viranə yetmişəm.

Seyli-bahar girdimə yetməz şitabdən,
Asudəyəm hənuz ki, ümmanə yetmişəm.

Gər yanə-yanə başinə dönsəm, əcəb degil,
Pərvanəyəm ki, şəm`i-şəbistanə yetmişəm.

Çox əbr tək kənardə göz yaşı tökmüşəm,
Ta bəhr içində gövhəri-qəltanə yetmişəm.

Zinhar, göz götürməginə qanlu dağdan
Kim, mən bu şəm ilə məhi-Kən`anə yetmişəm.

Ta oldu dağ lalə kimi dilnişin mənə,
Qövsi, şükuftəyəm ki, gülüstanə yetmişəm.

*  *  *

Anın qəddin nihali-ömri-cavidanə bənzətdim,
Sözün abi-həyatü lə`li-nabin canə bənzətdim.

Anın can tazələrkən növki-müjganın, xəta qıldım
Ki, zəhri-çeşmilə sirab olan peykanə bənzətdim.

Əzəl başdan bu səhvi etdi Məcnun, sanma kim yalqız,
Gözün ahuyə cananın məni-divanə bənzətdim.

Sənin, ey şaxi-gül, sərvi-rəvanın iztirabında,
Bu bağın şəbnəmin göz, səbzəsin müjganə bənzətdim.

Əgər zahirdə könlüm təngzərfü məstü rüsvadır,
Onu bir gənci-gövhər yaşuran viranə bənzətdim.

Muradim, mətləbim pərvanə könlün şad qılmaqdır,
Əgər hər şö`ləni ol atəşin cövlanə bənzətdim.

Gözüm hərçənd sirab oldu, saqi, doymadı könlüm,
Bu viran olmuşu dəryayi-bipayanə bənzətdim.

Qədi-mövzuninə, Qövsi, uyub məhv olduğundandır,
Ki, hər bir misrəin mə`nidə bir divanə bənzətdin.

* * *

Məndə can olsaydı, ey qatil, nisar etməzmidim,
Məndə cism olsaydı, bir avuc qübar etməzmidim.

Keçdigiçün ruzgarım eşqi-xoşfərcam ilə,

Gər dilim tutsaylı, şükri-ruzgar etməzmidim.

Yar olub dövlət, əgər düşsəydi bir gün fürsətim,
Saxlayınca canımı təslimi-yar etməzmidim.

Mən ki, xaki-astanin ixtiyar etdim sənin,
İxtiyar olsaydı tərki-ixtiyar etməzmidim.

Xuni-dil keyfiyyətin gər bilsə idim, qönçə tək,
Gülməgü açılmağı mən həm şüar etməzmidim.

Şəm`i-şami-hicr əgər yandırmasaydı canımı,
Aftabi-vəsl ilə bir gün nisar etməzmidim.

Qoysa idi səndə asari-vücud üftadəlik,
Mən səni, Qövsi, özüm tək xaksar etməzmidim.

* * *

Olmadın məsrur, ta mən zarü giryan olmadım,
Xatirin cəm olmadı, ta mən pərişan olmadım.

Lalə tək, ey qönçə, sənsiz oddadır nə`lim ki, mən
Gül kimi açılmadım, gülşəndə xəndan olmadım.

Yıxdı bir gənci-rəvan öz cüstücuyindən məni,
Yoxsa seylabi-həvadis birlə viran olmadım.

Hər gecə min yol dönür pərvanə şəm`in başına,

Vəh ki, mən bir yol anın bəzmində mehman olmadım.

Öldürür axır məni bir gün bu həsrət kim, sənə
Canımı tapşurmadım, kuyində qurban olmadım.

Düşməni-namərd ilə pərxaş qılmaq nəngdir,
Mən anınçun çərx ilə dəstü giriban olmadım.

Nəqdi-ömrüm sərfəsiz xərc eylədim bazardə,
Sən tək, ey Məcnun, əgər sərfi-biyaban olmadım.

Qoyma, ey xürşidvəş, gözdən məni şəbnəm kimi,
Mən ki, hər novgül tamaşasında heyran olmadım.

Sayə tək hərçənd yeksan olmuşam toprağ ilə,
Ah kim, pamalin, ey sərvi xüraman , olmadım.

Hər qədər, Qövsi, təbibi-eşq iqbal eylədi,
Başladım dərd ilə mən, məftuni-dərman olmadım.

* * *

Hərçənd könüldən yetişür dərdi-giranım,
Öldürdü, təbibim, məni çeşmi-nigəranım.

Qovğayi-qiyamət günü həm verməyəcəkdir,
Gər böylə məni əldən alır sərvi-rəvanım.

Gər böylə gəlir tiği-sitəm qaşın ucundan,
Qalmaz dili-bitab kimi namü nişanım.

Mən daxi bu gülzardə hər nalə çəkərdim,
Bülbül kimi gər bir gül eşitsəydi fəğanım.

Öz canım üçün ahü fəğan eyləmənəm mən,
Fəryad əgər verməyə dərdin, ala canın.

Hərçənd dəhan etdi məni muyi-miyan tək,
Əmma yenə yoxdur bulara hiç gümanım.

Yüz şükr ki, gər zə`f məni saldı ayaqdan,
Kuyinə rəvan etdi yenə əşki-rəvanım.

Yandırsa məni şəm tək ol gül, nə əcəb kim,
Nə əl, nə ayağım, nə sözüm var, nə zəbanım.

Ey dərdimə bihudə verən müjdeyi-dərman,
Bidərd təbibim nə bilir dərdi-nihanım.

Mən ayinətək sadədilü pakzəmirəm,
Yaxşıvü yəman cümlə bilir yaxşı-yəmanım.

Bu zə`flə, Qövsi, məni yazılara salmaz,
Gər mur dilin bilsə Süleymani-zəmanım.

* * *

Saqiya, pəraneyi-şəm`i-şəbi-hicranınam,
Düşdüm, ey bidərd, ayaqdan, mən ki, sərgərdanınam,

Kə`beyi-kuyin təvafından məni mən` etmə kim,
Hər qədər olsam zəif, axır sənin qurbanınam.

Müddəti-eydi-vüsalin göz yumub açıncadır,
Sən baharü mən sənin bərqi-səbükcövlanınam.

Nola gər yetsəm sənin pabusinə kakil kimi,
Mən ki, bir ömri-əbəddir zarü sərgərdanınam.

Ey təbibi-dərdi-bidərman, əlacin var isə,
Neyləyim mən kim, əsiri-pənceyi-müjganınam.

Qoyma minnət, gər dili-bitabı tə`mir eyləsən
Kim, bu viran ev sənindir, mən sənin mehmanınam.

Bəs ki, ey əbrukəman, sənsiz gülüb açılmanam,
Mərdumi-aləm sanırlar qönçeyi-peykanınam.

Dərdməndəm mən, işim yoxdur gülü gülzar ilə,
Nalə çək, bülbül ki, məhvi-naləvü əfğanınam.

Hər özün bilməzdən umdun dərdü yandın, ağladın,
Mən sənin, Qövsi, kəbabu dağınam, büryanınam.

* * *

Ömrlərdir yar üçün pamali-əğyar olmuşam,
Ah kim, axır qübari-xatiri-yar olmuşam.

Yaxşılar qürbilə sözdür, söz əziz olmaq ki, mən

Ol gülün damənini ta tutmuşam, xar olmuşam.

İçmənəm öz ixtiyarım birlə, zahid, badə kim,
Saqi eylər bixəbər, ta mən xəbərdar olmuşam.

Səcdeyi-büt həm mənə, ey bərhəmən, mümkün degil,
Böylə kim, mən məhvi-piçu tabi-zünnar olmuşam.

Ey Məsiha, əl götür, zinhar, başımdan ki, mən
Çox dəvalər etmişəm, zaye ki, bimar olmuşam.

Çeşmim olmuş gövhəri-əşkim kimi bir qətrə su,
Bəs ki, mən şərməndeyi-əbri-göhərbar olmuşam.

Seyri-gülşən yalquz etsin bülbüli-şeyda bu il
Kim, məni-nalani-sərgərdan giriftar olmuşam.

Gəlməmiş sübhi-qiyamət, bitməmiş şami-əcəl
Bilmənəm, saqi nədən sanmış ki, hüşyar olmuşam.

Eşq fərmanındadır, Qövsi, inanım, ah kim,
Kəştiyi-biləngəri-dəryayi-xunxar olmuşam.

* * *

Əzəl başdan ki, nəqdi-canımı canənə tapşırdım,
Anın dərdi-bəlasın cümlə yığdım, canə tapşırdım.

Könül, verdim qəminə, dərdinə, dağına xoş halım
Ki, gənci-rayigan aldım, ana viranə tapşırdım.

Yaxam bir ləhzə qurtulmaz kəşakəşdən, nə hasil kim,
Bu kəştinin giribanın tutub, tufanə tapşırdım.

Anın xaki-dərin öz gözlərimdən saxlaram mən kim,
Əgər düşmənlərim can istədi, mərdanə tapşırdım.

Bileydim kaş ğəmmaz olduğun, ayinənin ol gün
Ki, mən yarin xəyalin dideyi-heyranə tapşırdım.

Pəri-pərvanə tək hər kiprigim bir şö`lədir, ta mən
İnanın könlümün ol atəşin cövlanə tapşırdım.

Mühibbindən görün yaxşı-yəmanın könlümün kim, mən
Özüm çıxdım aralıqdan, evi mehmanə tapşırdım.

Dağıldı tarü pudüm, ta dili-sədparəmi yığdım,
Anın hər parəsin bir navəki-müjganə tapşırdım.

Noleydi nəqdi-canım tapşıreydim öylə kim, Qövsi,
İnani-ixtiyarim saqiyə məstanə tapşırdım.

* * *

Mən ki səndən nəzarə istərdim,
Cigəri parə-parə istərdim.

Gözlərin can dilərdi, əmma mən
Qaşlarından işarə istərdim.

Bulmağa vəsli-xali-rüxsarın,
Tanrıdan bir sitarə istərdim.

Şö`lə-şö`lə od urdu xərmənimə
Eşqdən bir şərarə istərdim.

Görürəm kimlərin yüzün mən kim,
Öz gözümdən kənarə istərdim.

Saqi ilə müvafiq olmaq üçün
Şişəmi səngxarə istərdim?

İmdi dərd ilə bəsmələm, Qövsi,
Getdi ol gün ki, çarə istərdim.

* * *

Canə doydum, bilmənəm əğyar əlindən neyləyim,
Gər bulərdən həm göz örtüm, yar əlindən neyləyim.

Cür`ə-cür`ə zəhri-qatil, kasə-kasə xuni-dil,
İçməyim gər, saqi, xunxar əlindən neyləyim.

İncimiş acı dəvalərdən, təbibim, söylə kim,
Mən bu dilbilməz dili-bimar əlindən neyləyim.

Qane olmaz gündə yüz min yol məni yandırmağa
Çərxi-nainsafü atəşbar əlindən neyləyim.

Ey mənim ahu-şərərbarimdən ikrah eyləyən,

Yanmayım ol atəşin rüxsar əlindən, neyləyim.

Ruzgarım dudi-ahından qaradır Qövsinin,
Bilmənəm, yarəb, mən ol bimar əlindən neyləyim.

* * *

Gəlin, ey əhli-tərəb, sağəri-mey nuş edəlim,
İki dünyasını bir yerdə fəramuş edəlim.

Əqlimi, huşimi ol saqi alıbdır ki, deyir,
Huş kim, kimsədə yox, biz kimi bihuş edəlim.

Necə bir səbr gəlin naleyi-məstanə ilə,
Qönçə tək bağda bülbüləri xamuş edəlim.

Yığılın bəzmdə yekrəng olalım saqi ilə,
Kim ki, hüşyar ola, əvvəl onu mədhuş edəlim.

Heyfdir kim, yuxuya sərf ola əyyami-bahar,
Yaxşıdır tovbəni biz xabi-fəramuş edəlim.

Gecələr xabə uyunca, uyalım saqiyə biz,
Kəsbi-feyzi-nəzəri–sübh binaguş edəlim,

Gər kənar eyləsə saqidənü meydən Qövsi,
Onu xəmyazə ilə sərbəsər ağuş edəlim.

* * *

Badeyi-nabi-güvara mənə olmaz, neylim,
Hər qədər qan içirəm, könlüm açılmaz, neylim.

Gər edib rəhm təbibim mənə qəmxar olsa,
Bilsə bir dərdimi, yüz dərdimi bilməz, neylim.

Astin bilsə gözüm yaşını hicran gecəsi,
Könül ayinəsinin zəngini silməz, neylim.

Mənim əhvalimi eşq içrə soran həmdəmlər,
Var dərdi-dilim, əmma dilə gəlməz, neylim.

Məni gül seyrinə təklif edib avarə qılan,
Gözüm açılsa mənim könlüm açılmaz, neylim.

Mənə hicran gecəsi canı yanan pərvanə,
Bizəbanlar dilin ol şəm ki, bilməz, neylim.

Ey ki, məqsud sənə Qövsini öldürməkdir,
Səxt candır, keçinər dərd ilə, ölməz neylim.

* * *

Ey xətinlə arizin reyhanü nəsrinim mənim,
Xali-səbzin mərdümi-çeşmi-cəhanbinim mənim.

Eşqdən ol hüsn miqdarınca bitab olmuşam,
Var idi hərçənd öz qədrimcə təmkinim mənim.

Ey mənə təklifi-istiğna edən sahibxirəd,
Meyldir məndən təğafül, mehrdir kinim mənim.

Ol təbəssümafərinləblər rəvadır gər alə,
Acı-acı sözlər ilə cani-şirinim mənim.

Sərgiran keçsin mənə, ey dilrüba, bica degil
Kim, nə əqlim var, nə səbrim var, nə təmkinim mənim.

Ah kim, Məcnun olub səhrayə düşdüm, bilmədim,
Əql umar divanədən ahuyi-mişkinim mənim.

Şurlər Fərhad tək mən həm salardım aləmə,
Gər mənə üz versə idi lə`li-Şirinim mənim.

Dərdi-dağimdən sual et, olma qafil kim, dolar
Laleyi-sirab ilə damani-gülçinim mənim.

Saqiyi-tərdəst əlindən almamışkən bir əyağ,
Getdi əldən əqlimü imanımü dinim mənim.

Çərxi-xunxarin baş endirməz xəti-fərmanına,
Sən desən gər Qövsiyi-miskinə miskinim mənim.

* * *

Müqimi-Kə`bəvü sərgəşteyi-bütxanədir könlüm,
Bu yüzdəndir ki, gahi şəm, gəh pərvanədir könlüm.

Vüsalından içər həm badə, həm qan gözlərim, saqi,
Xəyalından sənin həm gənc, həm viranədir könlüm.

Nigahi-ziri-çeşmindən, ləbi-şirinkəlamından,
Özün bilməz, sözün zəbt eyləməz divanədir könlüm.

Mənim yoxdur meyi-gülfamə, zahid, rəğbətim, əmma
Xərabi-piçü tabi-naleyi-məstanədir könlüm.

Sənin mehrabi-əbrü lə`li-nabin arzusindən,
Çırağİ-məscidü pərvaneyi-meyxanədir könlüm.

Tutub aram bir dəm onda ol bidərd əglənməz,
Bilir guya ki, viran olmalı qəmxanədir könlüm.

Özüm mən naxudayəm, gözlərim dəryayi-bipayan,
Sədəfdir sinə, Qövsi, gövhəri-yekdanədir könlüm.

* * *

Ol sitəmgər dilbərin cövrincə ehsan görmüşəm,
Dərdini çox çəkmişəm, dərdincə dərman görmüşəm.

Ruzi-məhşərdən əbəs qorxutma, ey vaiz, məni,
Mən mükərrər sübhi-vəslü şami-hicran görmüşəm.

Bu çəməndə səndən özgə bir nihali-dilnişin,
Görməsin çeşmim, gər ey sərvi-xüraman görmüşəm.

Ömrlərdir kim, dəmadəm sinəmi çak eylərəm,

Mən ki, səndən bir güzər çaki-giriban görmüşəm.

Gər ötərsə ruzigarim piçu tabilən, nola
Kim, kəməndi-kakilü zülfi-pərişan görmüşəm.

Bavər etməm könlümi, hərçənd tə`mir eylədin,
Mən bu viran olmuşu əzbəs ki, viran görmüşəm.

Bir yerə mümkün degil cəm eyləyə zənciri-zülf,
Bəs ki, Qövsi, könlümün halin pərişan görmüşəm.

* * *

Eşqində gər yüz il yanar olsam ki, yanmanam,
Ey qəmküsar, usansa qəmin, mən usanmanam.

Ey bir zəman dilində məni yad qılmayan,
Hansı nəfəs ki, mən səni könlümdə anmanam.

Xoş verdim arxa sayeyi-divarına sənin,
Mən kim, doquz hisarına çərxin dayanmanam.

Bəs kim, bu xəlq könlü ilə qövli bir degil,
Görsəm ki, və`də üstə gəlirsən, inanmanam.

Naseh, mənə nəsihəti-bica nə faidə,
Öldürsələr məni bu yuxudan oyanmanam.

Eşq əhli ad edib məni eyb eyləyən fəqih,
Eşqin şəhidiyəm, hünərimdən utanmanam.

Ey söyləyən ki, eşqi nihan saxla xəlqdən,
Mən bu günahi ərseyi-məhşərdə danmanam.

Pərvanətək dönüb yanıram şamlar, vəli
Gör talei ki, başına bir gün dolanmanam.

Derlər ki, guşeyi-nəzərin var Qövsiyə,
Gahi buni inanuram, əmma inanmanam.

* * *

Cahanımın rizasını mən candan istərəm,
Öz mətləbü muradimi canandan istərəm.

Mə`zur tut könüldən, əgər göz götürmənəm,
Ol gənci-rayiganı bu virandan istərəm.

Hərçənd açıldı qönçeyi-gül, mən göz açmadım,
Əmma təlafi ol güli-xəndandan istərəm.

Bimehri-hüsndən dilərəm piçü tabi-eşq,
Ol dərd nəş`əsini bu dərmandan istərəm.

Dörd olsa gözlərim, əcəb olmaz ki, müttəsil,
Ayineyi-vüsalini dörd yandan istərəm.

Asayişi-abad dilərəm dərdi-eşqdən,
Badi-murad mövceyi-tufandan istərəm.

Bir aşina ki, Kə`beyi-məqsudə Xızr ola,
Qövsi, qəribi-xaki-Xorasandan istərəm.

* * *

Sənin ta qaməti-mövzununa məhvi-nigah oldum,
Sərapa kakili-pürtab tək bir məddi-ah oldum.

Degil asan mənim tək xaksarü paymal olmaq
Ki, oldu üstüxanım tutiya tək xaki-rah oldum.

Bu yetməzmi dəlili-şərmü eşqi-safgövhər kim,
Mənə sən eylədin yüz min cəfa, mən üzrxah oldum.

Sərapa üzri-təqsirəm, günəhkarəm, günahim bu
Ki, bitəqsir ayaqdan başədin üzri-günah oldum.

Sanırlar səngi-sövdayəm görənlər peykərim bəs kim,
Gögərdim tə`nə daşından, səfid oldum, siyah oldum.

Degil tuli-əməl sinəmdə gər var arzular kim,
Qanatsız quşlar üçün, aşiyan tikdim, pənah oldum.

Mənə hərçənd, Qövsi, kimsə mənzildən nişan verməz,
Qənimətdir bu həm kim, qüdrətimcə sərfi-rah oldum.

* * *

Sərgəştə könlümü iki dünyayə vermənəm,

Həqqa ki, mən bu qətrəni dəryayə verməném.

Təsxirimə kəməndi-məhəbbət gərək ki, mən
Dil xətti-səbzü zülfi-səmənsayə verməném.

Səhrayə baş verir məni Leyli bilir məgər
Kim, mən inan hər ahuyi-rə`nayə verməném.

Zəhmət çəkib əlacimə sə`y eyləyən təbib,
Get-get ki, mən bu dərdi Məsihayə verməném.

Toprağə, məst olub, tökərəm cür`ə-cür`ə mey
Kim, bir piyalə zahidi-xudrayə verməném.

Gülzardən mənim qərəzim gül degil ki, mən
Bir əndəlibi yüz güli-rə`nayə verməném.

Qövsi, əgər min il çəkərəm can xümar ilə,
Yüz suyi cami-biğəşi-səhbayə verməném.

* * *

Saqiya, yeksan tut ağaz ilə əncamım mənim,
Hər qədər bihüş olam, ləbrizdir camım mənim.

Könlümün aramı sənsən, sən mənim könlümdəsən,
Bəs neçün, yarəb, nə səbrim var, nə aramım mənim.

Var ümidim piçü tabindən kəməndi-nalənin,
Varə-varə ahuyi-məqsud ola ramım mənim.

Türreyi-zərtari eylər dudi-ahi-şöləbar,
Kakilin sevdası, ey şəm`i-güləndamım mənim.

Yanmayım oddan, oda neylim ki, daği-eşq ilə,
Şəm ikən pərvanələnmiş yari-xudkamım mənim.

Ah kim, öz taqətin bir yerdə vermiş qarətə,
Ol ki, tədric ilə tarac etdi aramım mənim.

Zərrəyəm, hərçənd əmma aftabi-şöhrətəm,
Ta onun lə`lində, Qövsi, nəqşdir namım mənim.

* * *

Ey kaş eşqi əvvəl bazicə sanmasaydım,
Ta varə-varə axır odlarə yanmasaydım.

Dün başına dönərkən xabü xəyal içində,
Ey kaş oyanmasaydım, ey kaş oyanmasaydım.

Qılmazdı qeyrəti-eşq axır məni fəsadə,
Məcnun hekayətin mən əfsanə sanmasaydım.

Tez canı tapşururdum, tez kamimi alurdum,
Əndişə çəkməsəydim, bica utanmasaydım.

Rüxsari-zərd birlə rüsvayi-xəlq olurdum,
Xuni-cigərlə hər dəm gül tək boyanmasaydım.

Olmaz ki, mərg yadi təlx etməsin həyati,
Ey kaş vəsl içində hicranın anmasaydım.

Yarəb, nolurdu Qövsi bir tifli-bitəmizin,
Mehrinə uymasaydım, əhdin inanmasaydım.

* * *

Əlindən içsə idim camü badə, qansa idim,
Ayağın öpsə idim, başına dolansa idim.

Dönə-dönə dolanıb yandı şəm`ə pərvanə,
Nolurdu mən daxi bir böylə odda yansa idim.

Əmanət ilə mənə dust eşqi tapşırdı,
Xəyanət idi əgər mən bu şüğli dansa idim.

Zəman-zəman əsəri-naləvü fəğanımdan,
Usandı xəlqi-cəhan, kaş mən usansa idim.

Deyirlər imdi ki, mehrü vəfayə rağibsən,
Birin inanmaz idim, gər birin inansa idim.

Yox idi hiç qəmim xabi-mərgdən, Qövsi,
Bu uyxudan göz açıb aqibət oyansa idim.

* * *

Ömrlərdir yollar üstə zarü nalan qalmışam,
Ey səba, yol bilmənəm heç yanə, heyran qalmışam.

Ey bir az ehsan ilə aləmləri tə`mir edən,
Mən nə təqsir ilə, yarəb, böylə viran qalmışam.

Var ikən can, canımı cananə qurban etmədim,
İmdi əldən fürsətim getmiş, peşiman olmuşam.

Şəm tək bir aftabin həsrətilə sübhədin,
Şö`lənuşü sinə büryan, didə giryan olmuşam.

Lə`li-nabü zülfi-pürtabinə isar olmağa
Qönçə tək cəm olmuşam, gül tək pərişan olmuşam.

Bir yuxarı baxginən zinhar, ey me`mar, hey
Gör nə yoldan əl-ayaq altında viran qalmışam.

Rubəru oldu səninlə, Qövsivü ab olmadı,
Ol sınıq ayinənin tabinə heyran qalmışam.

* * *

Bir ömrdür ki, atəşi-hicranda qalmışam,
Bir həm yar hiç deməz handa qalmışam.

Hər handadır özün yetirir canə bir nəfəs,
Badi-murad bilsə nə tufanda qalmışam.

Dünya evində handa mənim könlüm əglənir,

Bir gənc üçün bu çöldə, bu viranda qalmışam.

Pərvanə şəm`ə yandıvü yetdi muradinə,
Biçarə mən ki, atəşi-hicranda qalmışam.

Yüz yol yetişdi mənzilə məndən sorağ alan,
Ey Xızr, mən hənuz biyabanda qalmışam.

Saqi şərabi-nab ilə əzbəs ki, məstdir,
Bilməz özün, məni nə bilir handa qalmışam.

Qövsi, sipahi-eşqdə bir həmnəbərd yox,
Yalquz bu gün ələm kimi meydanda qalmışam.

* * *

Cismi-zarımdan mənim hicran nə istər, bilmənəm,
Bu sınıq kəştidən ol tufan nə istər, bilmənəm.

Məndə yox hiç arzu, könlüm həman bitabdır,
Zəxm yoxdur sinədə, peykan nə istər, bilmənəm.

Çeşmi-xunxarın sənin cismimdə çün qan qoymadı,
Qanə dolmuş dideyi-giryan nə istər, bilmənəm.

Kasə-kasə qan verir, şükr eyləyib nuş eylərəm,
Daxi məndən gərdişi-dövran nə istər, bilmənəm.

Çünki yoxdur hasilim, ta iltifat etsin mənə,
Məndən ol bərqi-səbücövlan nə istər, bilmənəm.

Hə nə var aləmdə, bir-birdən betər sərgəştədir,
Qətrə ümman axtarır, ümman nə istər, bilmənəm.

Lalə istər dağına mərhəm nəsimi-sübhdən,
Ağzın açmış qönçeyi-xəndan nə istər, bilmənəm.

Aşiqin zənciri tari-zülfü kakildən gərək,
Rişteyi-zünnardən Sən`an nə istər, bilmənəm.

Can xu cahan malıdır bəs daxi məndən, dustlər,
Can nə istər bilmənəm, canan nə istər bilmənəm.

Gövhəri-qəltan gözi taci-büləndəxtərdədir,
Qətreyi-gümnami-sərgərdan nə istər, bilmənəm.

Eşq edər könlümdə cövlan, mən hərifi-bəsmələm,
Şəhsüvari-ərseyi-meydan nə istər, bilmənəm.

Mən xu tapşurdum ana yüz candan artuq könlümi,
Daxi canımdan mənim canan nə istər, bilmənəm.

Qaşi-yayından anın, yarəb, bu hammi qürb ilə,
Navəki-bərgəşteyi-müjgan nə istər, bilmənəm.

Ey dəmadəm eyləyən təklifi-məscid Qövsiyə,
Aşiqi-bitabdən iman nə istər, bilmənəm.

* * *

Nalə ilə bəs ki, yəğmayi-dilü huş eylədim,
Binəva bülbülləri gülşəndə xamuş eylədim.

İstərəm cananimə ərz eyləyəm əhvalimi,
Düşdi çox söz yadimə, əmma fəramuş eylədim.

Ey müəllim, sən kimi mədrəsədə mən həm ömrlər,
Eylədim məşqi-cününü adını huş eylədim.

Mən anınçün olmuşam gövtardən biganə kim,
Hər nə ögrəndim, həman saət fəramuş eylədim.

Xətti-səbzin ismü rəsmi şamü ruzü vəsl ikən,
Adını mən mətlei-sübhi-binaguş eylədim.

Hər kimin insafı yoxdur, saqiya, imanı yox,
Mən tutum kim, hər nə sən verdin mənə, nuş elədim.

Nola, Qövsi, gər nəsibim günbəgün əfzun ola,
Şükrini etdim əda, hər nişi kim, nuş eylədim.

* * *

Yarəb, ol bidərdi dərdimdən xəbərdar istərəm,
Bir özü tək yağiyə mən tək giriftar istərəm.

Yetməsin asibi-dövran nazpərvər cisminə,
Könlümü əmma zəifü zarü bimar istərəm.

Düşmənini kimsə sevməz, bilmənəm, yarəb, neçün,

Mən səni aləmcə, ey birəhm, xunxar , istərəm.

İstə hər babət ki, istərsən məni, hərçənd kim,
Ta cəhan vardır səni var istərəm, yar istərəm.

Olsa xərci-kuçəvü bazar göz yaşım mənim,
Gövhəri-sirab varmıdır, xəridar istərəm.

Əqli nöqsan artırır, fəryad kim, bir ömrdür,
Ömr nəqdin günbəgün sərf eylərəm,  yar istərəm.

Kafərə vardır aman, yarəb, nədir dinim mənim
Kim, mənə zinhar yox, hərçənd zinhar istərəm.

Yollar üstə böylə bimiqdar salmazsan məni,
Ey sitəmgər, mən səni bilsən nə miqdar istərəm.

Daği-eşqim var, münasibdir əgər hüsn istəsəm,
Yanmışam xurşiddən, əbri-göhərbar istərəm.

İstərəm mən həm nəmazü taət, ey zahid, vəli
Məscidi meyxanəvü təsbihi zünnar istərəm.

Simi-qəlbi-nazi, başin sədqəsi, sərf etmə kim,
Mən gədayi-safü pakəm, ari dinar istərəm.

Qövsiyə ərzani olsun şəm`i-bəzməfruz kim,
Tanrıdan mən dideyi-bidari-xunbar istərəm.

* * *

Xətin səvadinə gahi nəzarə eyləmişəm,
Bu sürmə ilə göz ağını qarə eyləmişəm.

Nə hərzə rişteyi-təsbihi üzmüşəm, zahid
Ki, mən bu xeyr işə yüz istixarə eyləmişəm.

Əlimdə sübheyi-səddanə şahidimdir kim,
Anınla daği-nihanim şümarə eyləmişəm.

Degil sitarə ki, mən navəki-fəğanım ilə,
Bütün sipəhri sitarə-sitarə eyləmişəm.

Könül diyarini gər hərcü mərc yıxsa nola
Ki, əql hakimini hiçkarə eyləmişəm.

Gözüm çırağı, gözüm bəs ki, əşk ilə doludur,
Cəhanı seyl tutar, ta işarə eyləmişəm.

Əbəs yavıncama, Qövsi, bu dillər ilə ana
Ki, mən anın cigərin səngxarə eyləmişəm.

* * *

Bu gün dönə-dönə ana yalvara bilmənəm,
Biçarəlik yolun məni-biçarə bilmənəm.

Dinməkdə, söyləməkdə yəman sərgiranlanır,
Mən netmişəm, nə söyləmişəm yar, bilmənəm.

Hər kimsədən sorağ alır olsam, səbəb budur
Kim, mən özümdən özgəni avarə bilmənəm.

Məndən bunun-anın kimi gül dərmək uyma kim,
Dilxəstə bülbülün cigərin yarə bilmənəm.

Bir ömrdür ki, can-cigərim dərdi-eşq ilə,
Ondan hənüz canımı qurtarə bilmənəm.

Bəzmində bilmənəm özümi, qılma eyb əgər
Söz bilmənəm, təriqeyi-nəzzarə bilmənəm.

Qövsi, nə gəlsə eşqdə təslim qıl ki, mən
Ol dərdə bundan özgə daxi çarə bilmənəm.

* * *

Xanəxahi-fəqrəmü səhra otağımdır mənim,
Çərx fanusimdir, ayü gün çırağımdır mənim.

Gah əgər mehman olum kuyində, minnət qoyma kim,
Hər gecə yüz min qəmü dərdin qonağımdır mənim.

Ah kim, Fərhad tək eşqində ol Şirinləbin,
Bisütuni-səbrimi sandım dayağımdır mənim.

Novnihalın nalənin sirabü sərsəbz etməgə,
Bağbanımdır təbibim, dərd bağımdır mənim.

Saqi, nazi-afərinin minnətindən fariğəm
Kim, şərabim xuni-dil, çeşmim əyağımdır mənim.

Dudi-ahim sünbülümdür, zəxmi xunəfşan gülüm,
Lalədir çeşim, səvadi-didə dağımdır mənim.

Xəlqdən yaşurmağa daği-nihanım qarəsin
Ahuyi-mişkin kimi çöllər yatağımdır mənim.

Hər yetən biməğz çəkməz başə mən nuş etdigim
Kim, fələk sərpuşimü aləm çanağımdır mənim.

Qövsi, olmaz yari-bipərva mənə rəhm etməyə,
Eşqdə bidəstü paliq əl-ayağımdır mənim.

* * *

Xəzan əyyamı girdim bağə, yadi-novbahar etdim,
Nəvayi-nalə ilə bülbülün dərdin həzar etdim.

Gərək min canı təslim eyləmək canənə bir yerdə,
Fəğan kim, mən ana bir canı yüz min yol nisar etdim.

Mükərrər üstüxanım sürmə oldu məğzi-canım tək
Ki, bu bazardə ayinəmi mən biqübar etdim.

Məni göz yaşım ilə naleyi-zarım cəvan etdi,
Bu əbrü ol nəsim ilə xəzan fəslin bahar etdim.

Ana tapşur inanım, müddəalərdən kəsil kim, mən

Özümdən eylədim qət`i-nəzər, ta yarı yar etdim.

Mənə ərbabi-dil tapşurdular gənci-rəvan, Qövsi,
Özümçün hər yetən viranəni bəs kim, hisar etdim.

* * *

Nihali-səbzbarın istərəm, neylim,
Bu rəngilə güli-rüxsarın istərəm, neylim.

Dilimdə ərzi-niyazü əlimdə damanın,
Belimdə həlqeyi-zünnarın istərəm, neylim.

Həmişə sərv ilə gər sərgiran olum, yeri var,
Çəməndə şiveyi-rəftarın istərəm, neylim.

Mənim sualıma gahi cəvab söyləməyən,
Hədisi-lə`li-göhərbarın istərəm, neylim.

Mənim fəsanəmə iqbal qılmayan bidərd,
Cəvabi-çeşmi-füsunkarın istərəm, neylim.

Mənim qara günümə iltifat eyləməyən,
Zəman-zəman məhi-rüxsarın istərəm, neylim.

Nəfəs-nəfəs məni yüz min dil ilə yalvardan,
Sözün təsəddüqi, göftarın istərəm, neylim.

Gözüm, bu halilə kim, şərmdən gözüm görməz,
Doyunca ne`məti-didarın istərəm, neylim.

Sənin gər istəməsəm çarə dərdinə, Qövsi,
Dili-şikəsteyi-bimarin istərəm, neylim.

* * *

İstərəm lə`li-şəkərbarına qurban olum,
Dilinə, ağzına, göftarına qurban olum.

Gözünə, qaşına,müjganına, xalü xətinə,
Hüsnünə, rənginə, rüxsarına qurban olum.

Xal tək daneyi-təsbihinə canım sədəqə,
Zülf tək həlqeyi-zünnarına qurban olum.

Rəsmdir xəstəyə aləmdə təsəddüq, mən həm
Nola gər nərgisi-bimarına qurban olum.

Bir zəman sərvi-qədin sədqəsi olsun qoy kim,
Dolanım başına, rəftarına qurban olum.

Ey məni böylə qara günlərə danəstə salan,
Mən sənin türreyi-tərrarına qurban olum.

Ey məni qülzümi-xunxardə biləngər edən,
Nə göhərsən ki, xəridarına qurban olum.

Nə çəməndir, bu nə şəbnəm, bu nə gövhər, yarəb
Ki, sənin əbri-göhərbarına qurban olum.

Bu nə güldür, bu nə bülbül, bu nə hüsnü, bu nə eşq,
Bağban, bağına, gülzarına qurban olum.

Məni axır nə yəman canə yetirdin, Qövsi
Ki, sənin yarına, dildarına qurban olum.

* * *

Xətti-səbzü ləbi-xəndanına qurban olum,
Gözünə, qaşına, müjganına qurban olum.

Söz ilə aləmi ləbriz qılan şirinsöz,
Nə nəməksən ki, nəməkdanına qurban olum.

Adına, yadına, başdan-ayağa peykərinə,
Özünə, şövkətinə, şanına qurban olum.

Ey mənim halıma danəstə nigah eyləməyən,
Mən sənin çeşmi-süxəndanına qurban olum.

Ey mənim gözlərimi yolda qoyan bipərva,
Mən sənin sərvi-xüramanına qurban olum.

Sən mənim sineyi-sədçakimi gözdən qoyma,
Mən sənin çaki-giribanına qurban olum.

Qövsinin qönçə kimi könlünü cəm eylə ki, mən
Sünbüli-zülfi-pərişanına qurban olum.

*   *   *

Fikrara hərgah ağzın qönçəsin yad eylərəm,
Hiçdən yüz nükteyi-sərbəstə icad eylərəm,

Bir uşağın eşqi ilə bilmənəm öz adımı,
Mən ki, Əflatuni tiflü tifli ustad eylərəm.

Sübhlər bülbülərə hərçənd dəmsaz olmanam,
Şamlər pərvanəyə yanmaqda imdad eylərəm.

Ey təğafülpişə, mən kim, fariğ olmam nalədən,
Gər  yetişsən dadıma, gəl gör nə bidad eylərəm.

Şahidi-təb\`im əgər yaşursa üzün pərdəsin,
Leylini Məcnun qılıb, Şirini Fərhad eylərəm.

Şad qılmaq kimsəni bəs kim, mənə mərğubdur,
Açılur könlüm, əgər bir kafəri şad eylərəm.

Mən könül almaqda, Qövsi, dust-düşmən bilmənəm,
Hər nədir, gər Kə\`bə, gər bütxanə, abad eylərəm.

*   *   *

Əgər bir ömr cananın xəyalın canə tapşurdum,
Bihəmdüllah ki, axır canımı cananə tapşurdum.

Səri-zülfün tutub təsbihdən, zünnardən keçdim,
Birini zahidə verdim, birin Sən\`anə tapşurdum.

Dili-sədparəmi cəm etdi zülfün bir yerə, əmma
Kimin nəzzarəyə verdim, kimin müjganə tapşurdum.

Əgər dərdin alıb verdimsə könlüm, sərfəsiz sanma
Mənə sən gənc verdin, mən sənə viranə tapşurdum.

Qaşın mehrabına kim, qibleyi-ərbabi-hacətdir,
Mənə çün şəm məqdur olmadı, pərvanə tapşurdum.

Hesabi-dərdü dağ istərsə canan, vay canımçün
Ki, mən ol səngdildən hər nə aldım, canə tapşurdum.

Edibdir könlümü bir qətrə su, hiç bir deyən yox kim,
Sənə, ey bimürüvvət, gövhəri-yekdanə tapşurdum.

Əgər sərgəştə çox gəzdimsə vadilərdə mən, Qövsi,
Apardım qətrəni, dəryayi-bipayanə tapşurdum.

* * *

Eşqi- dəryadil xətərlərdə pənahımdır mənim,
Mən anın dərvişiyəm, ol padşahımdır mənim.

Nalə hər yerdən durur, gözlər səri-kuyin sənin,
Bu səbəbdən öz fəğanım Xızri-rahımdır mənim.

Bilmənəm xətti-binaguş içrə ol məhtəl`ətin
Xaldır, ya kövkəbi-bəxti-siyahımdır mənim.

Bağrımı sən qan edibsən, qeyrə töhmət qoyma kim,
Handa getsəm çöhreyi-alın güvahımdır mənim.

Nola olsam cani-şirinim bəlagərdan sənə
Kim, bəlalərdən səri-kuyin pənahımdır mənim.

Gündə yüz təqsir əgər qılsam, peşiman olmanam
Kim, anın ehsanı, Qövsi, üzrxahımdır mənim.

* * *

Məndə ey kaş ki, yüz can ola, qurbanın olum,
Hamı bir-bir sənə qurban ola, qurbanın olum.

Könlümün rəxnələrin tutmağa ehmal etmə,
Nə ki, tədric ilə viran ola, qurbanın olum.

Gözü könlüm sənə məhv oldu isə, eyb etmə
Ki, gərək ayinə heyran ola, qurbanın olum.

Paybusin gözüm istər, könül ondan artıq,
Qorxuram kim, arada qan ola, qurbanın olum.

Nərgisi-məst yəman qətlimi tə`xirə salır,
Qorxum odur ki, peşiman ola, qurbanın olum.

Nə qədər dərdin ola, Qövsiyə ver, mümkündür
Ki, onun dərdinə dərman ola, qurbanın olum.

* * *

Qoymaz əldən eşq damanını əqli var olan,
Etməz ol səhbayi-biğəş tərkini hüşyar olan.

Dərdü daği-eşqi məndən sor, nə hər bidərddən.
Kim, təbibi-haziqin qədrin bilir bimar olan.

Hər gecə bidar edir fəryad ilə yüz kimsəni,
Bir gecə ahü fəğanimdən mənim bidar olan.

Hüsni-biğəş qarşu eşqi-safdil ayinədir,
Məhvi-dudi-ah olur hər atəşin rüxsar olan.

Fəqr damanini əldən qoyma kim, bibəhrədir,
Xabi-rahətdən əsiri-dövləti-bidar olan.

Xaki-daməngiri-eşqəm, dilnişindir söhbətim,
Yar olar bir ömr, bir saət mənimlə yar olan.

Hiç yoldan çəkmə qəm, Qövsi, əgər bina isən,
Qəm neçün çəksin qulami-Heydəri-Kərrar olan.

* * *

Gədayi-kuyinəm, baş əgmənəm gərdunə nəxvətdən
Ki, yegdir navəkin bali-hümayi-övci-dövlətdən.

Nə hacətdir mənə zahid xəbər vermək qiyamətdən,
Kim, etmişdir qiyamətlər qiyam ol sərvi-qamətdən.

Xəyalindən püri şişəmdə var, əndişəm ondandır,
Vəgərnə olmayınca dönmənəm səngi-məlamətdən.

Yüzünlə gər müqabil düşsə ayinəm, nə bakim var
Ki, gər ab olsa həm axır olar ayinə heyrətdən.

Məgər ol şax kəmanın qönçeyi-peykanı qalmışdır,
Ki, gül-gül qan axar sinəmdəki möhlik cərahətdən.

Təbibim, etmədin kəm sayeyi-iqbal başimdən,
İlahi, düşməsin hərgiz mizacin istiqamətdən.

* * *

Vəh ki, könül rəxnəsin bir-bir yaşurdum dağ ilən,
Atəşi-suzanı xəspuş eylədim toprağ ilən.

Hər kimin kim, könlü rövşən, ruzigari qarədir,
Tərki-adətdir sözü ağ üstə yazmaq ağ ilən.

Gər bilirsən çeşmi-xunbarım qılır ğəmmazlıq,
Pəs bu iki rəxnəni tut bir avuc toprağ ilən.

Eşq olur baziçə, duşmən dağ, dağım kim neçün,
Ömrlər Fərhadi-atəş dəst duymaz dağ ilən.

Cami-meydən ruzə gər möhri-ləb olsa, qəm degil
Kim, onu bir gün hilal-eyd açar dırnağ ilən.

Savururam başə sənsiz hər dəm öz xakistərim,
Tifli-nadan tək dəmadəm oynaram toprağ ilən.

Sən anınla dinməsən, ey şaxi-gül, açılmasın
Açılırmı Qövsinin könli baharü bağ ilən?

* * *

Ey biqərar, sinədə neştərmisən, nəsən?
Peykamısan, könülmüsən, əxgərmisən nəsən?

Bir dəm səni ol atəşi-rüxsar yaxmadı,
Sən, ey hicab, səddi-Skəndərmisən, nəsən?

Rəhm eyləməz fəğanına ol dilrüba, könül,
Sən gəbrimi, firəngimi, kafərmisən nəsən?

Hiç kimsə səndə eyləməz iqbal kimsəyə,
Ey kuyi-yar, ərseyi-məhşərmisən, nəsən?

Kəsdin çirağımın işığın şami-hicrdə,
Ey dudi-nalə, girdeyi-sərsərmisən, nəsən?

Məhv etdi cavidan məni şirin təkəllümün,
Ey lə`li-yar, çeşmeyi-kövsərmisən, nəsən?

Hər dəm bir özgə surət ilə bağladın gözüm,
Ey abü rəngi-hüsn füsungərmisən, nəsən?

Bir nalə naləm ilə həmahəng etmədin,
Ey əndəlib lalmısan, kərmisən, nəsən?

Ey qanlı dağ, açılmadın, əfsürdələnmədin,
Təsviri-bərgi-laleyi-əhmərmisən, nəsən?

Hərçənd yandın odlara, Qövsi, usanmadın,
Axır, sən ey od evli, Səməndərmisən, nəsən?

* * *

İlahi, könlümi qurtar bu aləm macərasından,
Məni döndər anın biganəsindən, aşinasından.

İlahi, könlüm et rövşən, məni göstər mənə, yarəb,
Anın ayineyi-dəryadili-aləmnümasından.

İlahi, könlümü öz eşqin ilə et ləbaləb kim,
Usandım qədrbilməzlər qəmü dərdü bəlasından.

İlahi, rövşən eylə çeşmimi öz xaki-rahından
Ki, yegdir zülfü xəttin sürməsindən, tutiyasından.

Həvaləndir məni ərbabi-dil övci-məqamında,
Bu dun fitrətlərin qutar səri-kuyi-həvasından.

Mükəddər eylədi ayinəmi qəflət tozu, yarəb,
Xəbərdar et məni öz Kə`beyi-kuyin səfasından.

İlahi, bir məqam et Qövsiyi-biçarəyə ruzi
Ki, yeg gəlsin ana dərdin sənin qeyrin dəvasından.

* * *

Ey əbri-atəşin, vərəqi-gülmisən, nəsən,
Ey bərqi-məddi-naleyi-bülbülmisən, nəsən.

Ey şam edər qara ələmin tirə aləmi,
Sən hicr ləşkərinə qaravulmisən, nəsən.

Ey bari-dil xəmidəsi, əbruyi-pürgireh,
Bazuyi-ahənini-təğafülmisən, nəsən.

Ey bir avuc qübarimi min yanə dağıdan,
Seylabi-xanümani-təhəmmülmisən, nəsən.

Ey xal, vey tərəşşöhi-xu, ey üzari-yar,
Şəbnəmmisən, gülabmisən, gülmisən, nəsən.

Ey nim qətrə xun ki, könül qoydun adını,
Kuhi-şəkibü bəhri-təhəmmülmisən, nəsən.

Hər bir nəfəsdə tazələnir nükhətinlə can,
Ey dudi-ah, dəsteyi-sünbülmisən, nəsən.

Qəddin büküldü, olmadı kəm yaşı gözlərin
Qövsi, bu qanlı çaylara sən pülmisən,nəsən.

* * *

Məni yalquzladı dərdü bəlayi-yar bir yandan,
Sipəhr əndişəsi bir yandanü əğyar bir yandan.

İki yandan urursan tiğ, bəs neyçün bülənd olmuş,
Sədayi-afərin bir yandanü zinhar bir yandan.

Məni təklif edən gülzardən səhrayə bilməz kim,
Tutar damənimi gül bir tərəfdən, xar bir yandan.

Məgər kafi degil ol səngdil könlüm şikəstində
Ki, sən həm hovladın, ey çərxi-bizinhar, bir yandan.

Necə mən olmayım rüsva kim, eylər şərhi-əhvalim,
Bir üzdən rəngi-zərdü ahi-atəşbar bir yandan.

Məni yandırdı bir yandan nəvayi-şö`ləbari-ney,
Şərabi-pakü süzi-saqiyi-xunxar, bir yandan.

Cünun şəhbaziyəm, şəhr ilə səhradır iki balim,
Dərü divarlər bir yandanü kuhsar bir yandan.

Binasın könlümün simab edərkən naşəkibalıq,
Təğafül birlə yıxma sən həm, ey dildar bir yandan.

Bəsirətsizlərin tə`nilə bağrım dağ ikən, Qövsi,
Fəğan kim, başlayıblar pənd ülüləbsar bir yandan.

* * *

Ey mənə bağü baharı bəndü zindan eyləyən,
Özgəyə dünyanı sərtasər gülüstan eyləyən.

Ey qəfəsdə bülbüli-xoşləhcəni dilsiz qoyan,
Bir neçə dilbilməz ilə seyri-bustan eyləyən.

Ey təkəllümdən iki gül yaprağın icad edən,
Hiç yerdən qanlı bağrın bülbülün qan eyləyən.

Ey nəsimi-ləhceyi-gövtar ilən bülbül kimi,
Qönçənin övraqini gül tək pərişan eyləyən.

Ey edən şami-qəriban şəm`i-bəzməfruzimi,
Gün çırağın daği-aləmsuzi-hicran eyləyən.

Ey ötən bizdən səba tək ruyi-atəşnakilə,
Su kimi toprağ ilə uşşaqi yeksan eyləyən.

Ey qoyan dərman bir özgə dərdi-bidərman adın,
Adımı bədnam edib dərdimə dərman eyləyən.

İstər olsun badeyi-gülrəng, istər xuni-dil,
Hər nədir, ləbriz ver, ey bağrımı qan eyləyən.

Düşməsin hicranə, yarəb, atəşi-hicran ilə
Qövsinin bağrın kəbabü dağü büryan eyləyən.

* * *

Neçə gündür gözlərim məhrumdur didardən,
Etmə nomid, ey fələk, hiç bülbüli gülzardən.

Ey güli-tər, qoyma gözdən müddəasız bülbüli,
Gərçi eyni-müddəadır hər nə gəlsə yardən.

Yandırır göz parəsin, saqi, xəyali-arizin,
Ta nələr görmüş niqab ol şö`leyi-rüxsardən.

Bundan özgə kim məni rüsvayi-afaq eylədi,
Görmədim bir özgə tə`sir ahu-atəşbardən.

Naməmə, yarəb, nə yazsınlar kiramülkatibin,
Etmək olmaz fərq çün təsbihimi zünnardən.

Gər alır könlüm, əgər almaz, nə vəchilən ki var,
Qiblədən dönsün üzü, hər kim dönər dildardən.

Açmanam, Qövsi, gözüm xəlvətdə həm əzbəs məni
Ahü əfğanım utandırdı dərü divardan.

* * *

Müsəlanlar, mən nakam çəkdim yar hicranın,
İlahi, tutmasın hiç kafərin hicran giribanın.

Məni hər ləhzə bir naşi təbibə yar yalvardır,
Məgər göndərdigi dərdin özi bilməzmi dərmanın.

Olubdur parə-parə bülbülün bağrı ki, aşiqdir,

Nə üzdən eyləmiş sədçak gül həm öz giribanın.

Nə ox kim, bülhəvəs seydinə qədrin bilməyib atsan,
Tutar, ey səngdil, bu aşiqi-biçarənin yanın.

Bu bir bayram iki oldu məni-nakamə, ta bildim
Kim, istər Kə`beyi-kuyin zəifi-zar qurbanın.

Olubdur butəsi ol nazəninin hansı səngindil,
Ki, birəhmanə bizdən döndəribdir növki-müjganın.

Sənin, Qövsi, nə bilsin sözlərin, ol tifli-məktəb kim,
Fəlatun anlamaz bimari-dərdi-eşq dərmanın.

* * *

Gəh zülfini, gah kakilini şanə qılırsan,
Hər dəm məni bir rəng ilə divanə qılırsan.

Nə könlümü aldın, nə gözüm yaşını sildin,
Bidərd, məgər aləmi viranə qılırsan.

Mən eşq oduna min yanıram, biri yanınca,
Hər şəm`i yaxarsan, məni pərvanə qılırsan.

Ol həlqeyi-zülfün yenə başında bir iş var,
Ey vay mənə, kim məni divanə qılırsan.

Ey könlümi yapmaqda edən nazü bəhanə,
Bismillah, əgər bir daxi viranə qılırsan.

Gül şəm`ini gər rəşk oduna böylə yaxarsan,
Varə-varə bülbülləri pərvanə qılırsan.

Məhtabdə mey ver qara günlülərə, saqi,
Ay haləsini çün xəti-peymanə qılırsan.

Yaxşıvü yəman uydu qəmu uyxuya, Qövsi,
Vəqtidir əgər naleyi-məstanə qılırsan.

* * *

Sübhi-vüsal üçün gəzirəm şəm`i-dağ ilən,
Ol aftabi axtarıram bu çırağ ilən.

Göz yaşım ilə sineyi-pürdaği bəslərəm,
Bu laləzarə su verirəm ol bulağ ilən.

Bir zalimin ki,arxası var, aləmi yıxar,
Olmuş bir evli çahi-zənəxdan buxağ ilən.

Qan içə-içə yaşlı gözüm lə`lini görər
Kim, şəm çəkkə-çəkkə yanar duzlu yağ ilən.

Yaxşı məta içində yəman gərçi çərx olar,
Sərf etmə acı sözləri şirin dodağ ilən.

Bəzmi-vüsaldə yaşır üzün niqabını,
Yüzsüzlük eyləmə gözə qarşı qonağ ilən.

Zöhd əhli qorxudan çəkinir bəzmi-badədən,
Hər qatı başlı əlləşə bilməz əyağ ilən.

Çərxi-xəsis əl verənə verməz astin,
Qalmış çəməndə qönçə, tutulmuş dimağ ilən.

Tapdıqda şəm`i-vəslin onun göz götürmə kim,
Kimsə keçən günü tapa bilməz sorağ ilən.

Qabil qulaqda gövhər olar yaxşı söz ki, mən,
Bu nüktəni sədəfdən eşitdim qulağ ilən.

Sən Qövsinin həyatdə qədrini bilmədin,
Çox qəbri üstə axtaracaqsan çırağ ilən.

Bu ol qəzəl cəvabi ki, Ağarəzi dedi:
“Bu yolu başə apararam bir əyağ ilən”.

* * *

Kimdir ol bibak yağmayi-dilü hüş eyləyən,
Könlüni xəlqin alan saət fəramüş eyləyən.

Bir-iki əgricənin ünvani-xət adın qoyan,
Sadədil üşşaqləri əgrilərə tuş eyləyən.

Gəh girib məscidlərə öz qaşini mehrab edən,
Gəh şərab, öz taqi-əbrusin anub nuş eyləyən.

Şəm tək hiç yanmaya dilsizlərin əhvalına,

Bir neçə dilbilməzin hərfin düri-guş eyləyən.

Bilməyib öz qədrini əğyar ilə həmbəzm olan,
Sadəlikdən şö`leyi-dəryasını xəspuş eyləyən.

Səbzənin başın yetirmiş iftixar ilən gögə,
Ol behiştin səbzəsin xətti-binaguş eyləyən.

Bilmənəm, bilmiş qara günlülərin halin məgər,
Kə`bə tək sübhi-binaguşin siyəhpuş eyləyən.

Nola gər bir gecə çeşmim şəm`ini rövşən qıla,
Ol qiyamət sübhinin adın binaguş eyləyən.

Aqibət, Qövsi, kəbadə eylədi xəmyazini,
Qamətim yayın ayağdan başə ağuş eyləyən.

* * *

Gərçi bilməz zülfün əhvalim pərişan olduğun,
Ləblərindən sor ki, bilmiş bağrımın qan olduğun.

Bəxyəvü mərhəm cəfasın çəkməz idim ömrlər,
Bilsə idim zəxmi-nasurimdə peykan olduğun.

Görmək istərsən məni-divanənin ətvarini,
Bərqi-xəndan olduğun gör, əbri-giryan olduğun.

Olduğiçün çöl kimi bir sən tək ahu məskəni,

Eylədim mə`lum könlüm şəhri viran olduğun.

Etməyimmi zə`fi-ruzəfzunə yüz min şükr kim,
Kimsə görməz könlümün eşqində talan olduğun.

Eylədim öz əşki-sorxü rəngi-zərdimdən qiyas,
Novbahar ilən xəzan dəstü giriban olduğun.

Sən özün bilməzsən, əmma nərgisi-məstin bilir,
Qövsinin könlü kəbabü dağü büryan olduğun.

* * *

Cəhanə şur salmış duzlu göftarın ədalərdən,
Səni, ey cani-şirin, saxlasın tanrım bəlalərdən.

İşim peyvəstə buyi-zülfün almaqdır səbalərdən,
Gədalik eylərəm, əzbəski dərvişəm gədalərdən.

Xəbərdar olmayan me`raci-mə`nidən nə bilsin kim,
Sənin yerdən gögə var imtiyazın dilrübalərdən.

Günəş iqbalini gör, qətreyi-şəbənmlə kim hüsnün
Yetişsə ərşə başi göz götürməz binəvalərdən.

Kərəm qıl, rişteyi-məddi nigahin kəsmə məndən kim,
Üzüldü rişteyi-can, ta üzüldüm aşinalərdən.

Həvayi-nəfsə, zinhar , ey Züleyxa, qoyma eşq adın
Ki, hüsni-pak çəkməz damənin bimüddəalərdən.

Ona nəqdi-həyatın öz əlinlə tapşır, azad ol
Ki, mən düşdüm bəlayə, hər qədər qaçdım bəlalərdən.

Könül ayinəsin göz nola çalsa daşdan-daşə
Ki, fərzi-eyndir qət`i-təəllüq xodnümalərdən.

Nigahi-aşinadən vəhşəti-tir eylərəm, Qövsi,
Eşitdim bəs ki, mən biganə sözlər aşinalərdən.

*   *   *

Əgər götürsə mənim məhvəşim niqab üzündən,
Rəvan olur ərəqi-şərm aftab üzündən.

Yetər bir övcə ki, gün başi astaninə yetməz,
Hilal zərrəcə gər bulsa abü tab üzündən.

Nigəh şərarə olar, mərdümək sipənd bu üzdən,
Dolarsa su gözünə xəlqin aftab üzündən.

Nəzir hüsnünə yox kim, əzəl mühərriri yazmış,
Bu nüsxəni neçə yüz müntəxəb kitab üzündən.

Min il mütaliə hər nöqtəsində eyləmək azdır,
Kitabi-hüsnunə çox baxdım intixab üzündən.

Nə məndə var, nə günü ayda xakbusinə cür`ət,
Olar bu durmağü düşməklər iztirab üzündən.

Nə üzdən ola cigər qani, bilmənəm bu nə sirdir,
Axarmı qan bir avuc kül olan kəbab üzündən.

Səninlə var sözüm, çox fəğan ki, hiç deyə bilməm,
Hicab bir yana, tutmaz dilim itab üzündən.

Mənimlə bir neçə söz, Allah üçün, məvacihə söylə,
Çenan ki, layiqi-lütf olmasam sitab üzündən.

Nola ki, dinü üqbadə biniyaz ola Qövsi,
Zəkati-hüsnüni versən ona nisab üzündən.

* * *

Nə qanlar ola ki, dil içməmiş üzarın əlindən,
Nələr ki, görməmiş ola öz intizarın əlindən.

Nə fitnə kim ola qaşü gözün olur ana bais,
Nəzərsiz ol kim, edər nalə ruzgiranın əlindən.

Yüngül qılır yüküni, gərçi dağıdıb tələf eylər,
Könül əbəs doludur çeşmi-əşkbarın əlindən.

Birisi dağların eylər mənim kimi kəmərin xəm,
Bu dağlar ki, mənim var ruzigarın əlindən.

Kəbabi-ləxti-cigər kasə-kasə qanımı içməz,
Qərib nişanəsi var hər nə gəlsə yarın əlindən.

Buyurma nalə, sitəm etmə çox ki, qapına hər gün

Sipehr dadə gələr, Qövsiyi-fikarın əlindən.

* * *

Saqiya, eylə mənim canımı pürxun, pürxun,
Etmədi çöhrəmi çün badeyi-gülgun, gülgun.

Eşq əhlinə gərək hövsələ dərya, dərya,
Nə qədər şur cünun üz qoya hamun, hamun.

Deyirəm naləvü ah eylə ki, canan, canan,
Qəm güni xəlq deyən yerdə ki, gərdun, gərdun.

Eşq sərrafı qılır nalə ki, bina-bina,
Çağırır hüsn xəridarı ki, məğbun, məğbun.

Əql istər ola divaneyi—Leyli, Leyli,
Eşq yanında gərək Leyliyi—Məcnun, Məcnun.

Mənə artıq gəlir ol qaməti-rə`na, rə`na.
Yek gəlir mərtəbeyi-misrei-mövzun, mövzun.

Ola bir gün deyə ol mah ki, Qövsi, Qövsi,
Söyləyən vəqtdə dərd əhli ki, Məcnun, Məcnun.

* * *

Böylə məst olduğumu saqiyi-xunxar nə bilsin,
Mən özüm, bilmənəm əhvalimi, dildar nə bilsin.

Nalə izhar qılır mətləbini bülbüli-məstin,
Mən ki laləm, dilimi ol güli-bixar nə bilsin.

Ömrlər gövhər alıb satmayan əhli-nəzər olmaz,
Tifldir, tifl, könül qədrini dildar nə bilsin.

Versə gər rüxsəti-nəzzarə, tamaşa edə bilməm,
Rəvişi-seyri-çəmən mürği-giriftar nə bilsin.

Əşki-çeşim yügürür xarü xəcil hər yana, Qövsi,
Bəli, öz qiymətini gövhəri-şəhvar nə bilsin.

* * *

Nəvayi-naləm ilə oldun, ey Əsər, düşmən,
Bəli, olur hünər əhlilə bihunər düşmən.

Əgərçi doğruya məşhurdur zəval olmaz,
Fəğan ki, dustləri doğru söz edər düşmən.

Təmam aləm ilə sinəsafü yekrəngəm,
Daxi mənimlə olurmu hərifi-hər düşmən

Cəhanda hər kişi öz əkdigin biçər axır,
Nədamətini yəman sözlərin çəkər düşmən.

Həsud öz cigərin doğrarü içər qanın,
Bu işdə düşməninə eyləməz cigər düşmən.

Fitadəlik sipərin salma, çəkmə əndişə
Ki, heç bu mə`rəkədə bağlamaz kəmər düşmən.

Dili-dunim ilə iki cəhan hərif olmaz,
Bulurmu Qövsiyi-biçarəyə zəfər düşmən.

* * *

Ey binayi-əhdi bidad ilə bərbad eyləyən,
Əl verib əğyar ilə üşşaqə bidad eyləyən.

Ey məni yıxmaqda həm hər dəm edən ustadəlik,
Bitəkəllüf özgənin könlüni abad eyləyən.

Ey məni yandırmağa əflak olanda şö`ləbar
Dəmbədəm bir tərəfi-daman ilə imdad eyləyən.

Naleyi-atəşfəşan ilə tutuşdum ney kimi,
Hiç sormazsan ki, kimdir bunca fəryad eyləyən.

Könlümü ol zülf qeydindən, səba, qurtara gör
Kim, bu iş əcrini bulmaz, min qul azad eyləyən.

Yad edən çoxdur məni, ol aşinadən ah kim,
Yox məni yanında bir təqrib ilə yad eyləyən.

Eyləmiş Fərhadü Məcnun varisi, Qövsi, məni,
Kimini Məcnun edib, kimini Fərhad eyləyən.

* * *

Ey sünbüli-zülf, ol güli-rüxsarə düşərsən,
Öz başına fikr et ki, ayaqlərə düşərsən.

Zinhar əlinə ayinə, ey səngdil, alma,
Öz canına rəhm eylə kim, odlarə düşərsən.

Tə`xirü şəkibin dəxi gəncayişi yoxdur,
Gər fikrü dəvayi-dili-bimarə düşərsən.

Gər versə könül taqəti-nəzzarə firibin,
Zinhar ona aldanma kim, zinharə düşərsən.

Mən dami-bəlayəm, yeri, məndən həzər eylə
Kim, oduma, ey Qövsiyi-biçarə, düşərsən.

* * *

Can sözün qurbanı, ey icadi-göftar eyləyən
Kim, dəhanındır sənin yoxdan məni var eyləyən.

İstərəm kim, kakilindən üzməsin can riştəsin,
Bir-birinə şəm ilə pərvanəni yar eyləyən.

Var ümidim etməyə nomid ol güldən məni,
Aləmi gülzar edən, bülbülləri zar eyləyən.

Hiç ləfz olmaz libas ol mə`niyi-biganədən,

Bilmənəm, yarəb, nə söylər eşqi izhar eyləyən.

Gərçi naqisdir vücudim, feyzsiz olmaz vücud,
Göz götürmə məndən, ey yoxdan məni var eyləyən.

Nalə gər imdadimə hər ləhzə, hər dəm yetməsə,
Hali-zarimdən səni kimdir xəbərdar eyləyən.

Nola, yarəb, hal evində açsa bir gün söz başın,
Qövsiyi-atəşzəbani məhvi-göftar eyləyən.

* * *

Qoydum əldən iki aləmdə nə kim var ətəgin,
Böylə mərdanə tutar kim ki tutar yar ətəgin.

Söyləmin dərdimi, zinhar, Məsihayə ki, mən
Ölərəm, qoymanam əldən dili-bimar ətəgin.

Nisbətin hiç gülə yoxdur sənin, ey gül ki, tutar
Güllərin bülbüli-şeyda kimi hər xar ətəgin.

Könlümü dağların tutduvü təsxir eylədi,
Öylə kim, sikkə tutar dirhəmü dinar ətəgin.

Qanı öz boynuna mina kimi ol səngdilin
Kim, olub məst, tutar saqiyi-xunxar ətəgin.

Necə Məcnun ilə Fərhadə deyirlər aşiq
Ki, tutubdur biri səhra, biri kuhsar ətəgin.

Gözümü vəsl günü heyrət əgər bağlamasa,
Tutarım pənceyi-müjgan ilə dildar ətəgin.

Məni çün əldən-ayaqdan aparır xabi-ədəm,
Nə ümid ilə tutum dövləti-bidar ətəgin.

Tuta bilməz ətəgin çərxi-müəlla, Qövsi,
Kim ki sidq ilə tutar Heydəri-Kərrar ətəgin.

* * *

Xəlil gülşəni içrə nihali-dilkəşsən,
Əgərçi aləmi-zahirdə nəxli-atəşsən.

Sənin yanında meyi-laləgun nədir, saqi
Ki, sən mən istədigim safü pak biğəşsən.

Fəğan ki, şikvəyə oxşar bu rəng suz verənə,
Əgərçi xaksən, ey eşq məhz atəşsən.

Həmişə istədigin dərdü dağ yetdi sənə,
Hənuz, ey dili-xunin, neçün müşəvvəşsən.

Səni mən oxşadım hansı yayə, ey əbru
Ki, sən kəmani-fələk tək həmişə pərkəşsən.

Əgərçi şaxi-gülü sərvi-naz rə`nadır,
Boyun bəlasın alım, yüz olarca sərkeşsən.

Diyari-eşqdə, Qövsi ki, torpağı qandır,
Sənə yaman deməк olmaz, yaman bəlakeşsən.

* * *

Aparmışdır məni bir yerdə ol sərvi-rəvan məndən,
Nə istərsiz deyin, ey dustlər, umman yəlan məndən.

Bu yoldan kim, yerin boş qalmasın səhradə, ey Məcnun,
Gələr bir gün ki, qalmaz sən kimi namü nişan məndən.

Məni hicranə yandırma həmin daxi, sən ey gərdun,
Sitəm səndən, təhəmmül məndənü tabü təvan məndən.

Bu səhralərdə, ey əhbab, itərsiz, gəlmin ardımca,
Qalarsız vari binamü nişan, sormun nişan, məndən.

Üzüldü canımü cismim, pəri-kah oldu möhnətdən,
Nə istərsən, nə verdin, almadın, ey asiman, məndən

Yazılmışdır əzəl başdan mənim alnımda bir misra
Ki, səndən, ey hüma, iqbalü müşti-üstüxan məndən.

Qübari-rahin, ey can, şirin cismü zarim bu,
Xürami-bisəda səndən, nigahi bizəban məndən.

Dilim yoxdur mənim, ey ney, sənə heç nisbətim yoxdur,
Veriblər mənə dərdi, alıbdırlar fəğan məndən.

Təməvvüc heynidir, ey bəhri-malamali-rəhmət, hey

Ətai-bicəhət səndən, günahi-bigiran məndən.

Mənimçün həq bilir kim, ömri-cavidandan artıqdır,
Əgər nəqdi-həyatım alsan, ey əbrukəman, məndən.

Hədəf tək başım olsun tərcüman kütahlıq etsəm,
Gəl, ey əbrukəman, meydanə, ox səndən, nişan məndən.

Günəhkarəm mən, əmma sən tərəhhüm kanisən, kəsmə
Təvəccöh babini, ey Kə`beyi-əminü aman məndən.

Ümidim var Bətulun xanədanından, ümidim kim,
Təvəccöh kəsməsin ol məxzəni-gənci-nihan məndən.

Cigərgahi-Həsəndən istərəm kim, iki aləmdə,
Xəbərsiz olmasın ol qibləgahi-insü can məndən.

Ümidim var yetişsin Kərbəla dəştinə torpağım,
Alanda verdigi canını ol cani-cəhan məndən.

Mənə şahi-vilayət Heydəri-Səfdər yetər, Qövsi,
Əgər gərduni-bizinhar eşitməz əlaman məndən.

* * *

Səhldir təsxir qılmaq sərbəsər dünya yüzün,
Padşah oldur ki, Məcnun tək tutar səhra yüzün.

Ey ki, tutmuş pərtövin xurşid tək dünya yüzün,
Zərrəcə gör aradə bir gün bu xaki-pa yüzün.

Olmuşam bir Leyliyi-nazafərin Məcnuni kim,
İtləri toprağə sürtər ahuyi-rə`na yüzün.

Ol hicabalud gül rüxsari görsün görməyən,
Pərdeyi-əbr içrə xurşidi-cəhanara yüzün.

Dustlər, ol nim rəngin bəs ki, mən yekrəngiyəm.
Gözlərim mümkün degil görsün güli-rəna yüzün.

Ey firəngi hüsnlü, bu rəng ilə kim, məndə var,
Görmək olmaz hiç gəbrü kafərü tərsa yüzün.

Bülhəvəs gər eşqdən laf ursa, tut mə`zur kim,
Xarü xəs həm mövc tutmaq dilər dərya yüzün.

Bilmənəm, yarəb, nə söylər səbzi-təh gülgunimə,
Hər görən qafil bu rəngilə məni-şeyda yüzün.

Aləmi Məcnun edibdir hüsni yüz min pərdədə,
Ah, əgər məqdur olaydı görmək ol Leyla yüzün.

Hər xəsü xarə təhəmmül eyləyən dərya kimi,
Gövhəri-sirab ilə axır tutar dünya yüzün.

Dideyi-ahu bieynih daği-bərgi-lalədir,
Bəs ki, Qövsi, dudi-ahim yaşurar səhra yüzün.

* * *

Eşq dəryasında orəngi-sipəhri-bisütun,
Hər kəfi-bilməğzi-dərya bir həbabi-sərnigun.

Ol ləbaləb sürfədən kim, mən onun mehmanıyam,
Çərxdir bir sinivü xurşiddir bir tas xun.

Yer gögü gög yer gərək, mə`kusi-sədrü astan,
Öz yerində cabəca əglənsə hər alvü dun.

Xar baxma, gər zəifəm kim, bükülmüş qamətim
Həlqeyi-zənciri-Məcnundur, ey ərbabi-cünun.

Ey sözü Şirin, mənim Fərhadə yoxdur nisbətim
Kim, sənin müjganinə bir ləhzə dözmüş Bisütun.

Bəs degilmi zirdəstü paymal etmək məni,
Bir yuxarı baxginən, ey çərxi-duni-sərnigun.

Gəlsə ol sərvi-səhi, bəs handa, yarəb, əglənir,
Sinədir səhrayi-atəş, didədir dəryayi-xun.

Ol xəsü xaşak tək kim seyli-fərmanındadır,
Bir zəman öz halimə, Qövsi, məni qoymaz cünun.

* * *

Saqiyi xunxar, kimdir bağrımı qan eyləyən,
Din alan, dil verməyən, yəğmayi-iman eyləyən.

Mümkün olmaz kim, xəsü xaşaki od yandırmasın,

İxtiyar ilə degil ol bərqi-cövlan eyləyən.

Dilrübalıq siz dəxi eylərsiz, əmma özgədir,
Ey firəngizadələr, ol namüsəlman eyləyən.

Tanrı üçün, gündə bir yol, dustlar, kimdir məni
Ol firəngin Kə`beyi-kuyində qurban eyləyən.

Bilmənəm, yarəb, nə oddur eşqi-məğzəfruz kim,
Artırır ol dərdi-bidərmani dərman eyləyən.

Aç təbəssümdən,təkəllümdən tutulmuş könlümü
Ey həvasim qönçəsin gül tək pərişan eyləyən.

İntizarım pərdeyi-çeşmimdə pünhan eyləmiş,
Bərqi-aləmsuzi əbr altında pünhan eyləyən.

Lə`lü tabi-arizü çeşmü nigahindir sənin,
Qan içirdən, qan içən, qan ağladan, qan eyləyən.

Yaşururlar bülbülün, Qövsi, nəvayi-naləsin,
Bəs ki, var gülşəndə biahəng əfğan eyləyən.

* * *

Saqiya, mey ver ki, bağrın mən kimi qan olmasın,
Kakilin tək xatiri-cəm`in pərişan olmasın.

Olmasın kəm hərgiz ol sərvi-rəvanın kölgəsi,
Yarəb, ol mehrabi-əbrü taq nisyan olmasın.

Can yoxdur natəvanlıqdan məni-bitabdə
Kim, deyəm hər yerdə canan olmasa can olmasın.

Bir könül kim, olmuş, ey gənci-rəvan, məskən sənə
İstərəm seylabi-təşviş ilə viran olmasın.

Kim ki bilməz zəmzəmi-əşki-rəvan keyfiyyətin,
Eşqi-pakin Kə`beyi-kuyində qurban olmasın.

Yandı bağrım əndəlibi-binəvanın halinə
Kim, yolunda hiç əsirin xari-hicran olmasın.

Çərx ilə pərxaş, Qövsi, nəngi-himmətdir mənə,
Kimsə namərd ilə, yarəb, mərdi-meydan olmasın.

* * *

Gözüm hərçənd, qanlar tökdü, çərxin odlu dağından,
Bihəmdüllah ki, axır yandı şəm`im gün çirağından.

Nə məhv olmuşsan, ey şəbnəm, güli-xurşid arasında
Ki, görsən göz götürməzsən onun simin buxağından.

Sədəfdə daneyi-gövhər dişinlə bəhs edər, əmma
Gərəkdir kim, bunu dərya çıxarsın öz qulağından.

Binaguşü xəti-səbzin nə bənzər sübhə, kim sübhün
Təmiz olmaz qarası qarəsindən, ağı ağından.

Bu güllər içrə ey gülpirəhən, şəbnəm xəyal etmə
Ki, düşmüş qönçə bixud, qan axar hər dəm dimağından.

Bulanır çünki su, sərçeşmədən şahid nə lazımdır
Ki, rövşəndir mənim hali-dilim çeşmim bulağından.

Şərabi-laləgun pür zurdur, mə`zur tut, saqi,
Əgər fərq eyləməz öz başını Qövsi əyağından.

* * *

Könlümdəki muradim, ey yar, sən bilirsən,
Hər dil ki, bilmənəm mən, dildar, sən bilirsən.

Hərçənd bizəbanəm, ləbrizi-əlamanəm,
Mən məsti-cavidanəm, hüşyar, sən bilirsən.

Mən sanma meypərəstəm, saqidən ötrü məstəm,
Mən bir binayi-pəstəm, me`mar, sən bilirsən.

Qəmzən atanda bir ox, qaşın yayın çəkər çox,
Könlümdə tab gər yox, gər var, sən bilirsən.

Gəlməz fəğan əlimdən, üzr istə qatilimdən,
Ona mənim dilimdən, yalvar, sən bilirsən.

Gər könlümü alırsan, gər yüz çin öldürürsən,
Dildar, sən bilirsən, qəmxar, sən bilirsən.

Qövsi sənin xərabın, içmiş sənin şərabın,
Olmuş sənin kəbabın, xunxar, sən bilirsən.

* * *

Gözlərin bimariyəm saqi ki, bimar olmasın,
Çeşmi-məstindən siyəhməstəm ki, hüşyar olmasın.

Böylə kim, mən görmüşəm zülfün, könüllər kişvərin
Öylə tutsun kim, xəti-müşkin xəbərdar olmasın.

Gər bərəhmən dərd bilməz bütlərin məftunidir,
Dil bilir bilməzlərə kafər giriftar olmasın.

Öz gözümlə, dustlər, görmün məni zinhar kim,
Hiç düşmən mən kimi xar olmasın, zar olmasın.

Mən nə dərdim söyləyim, saqi ki, hali hər kimin,
Çöhrəsindən bəllidir, hərçənd izhar olmasın.

Daneyi-mərdüm şikari-xalü dami-zülfünə,
Həq bilir adəm degil hər kim giriftar olmasın.

Sözlərin gövhərdir, ey göz bağlayan sahir sənin,
Bibəsirətlər ona, yarəb, xəridar olmasın.

Çoxların var Qövsidən qeyri sənin, əmma onun
Səndən özgə kimsəsi gər var isə, var olmasın.

* * *

Hicran günü suzi-dilü tabi-cigərimdən,
Pərvanələnir şəm`i-fələk balü pərimdən.

Bilmək dili-bimar mizacını çox işdir,
Billah, təbibim, necəsən dərdi-sərimdən.

Görməz gözüm, ey mərdümi-çeşmi-nigəranım,
Gər şəm`i-cəlalın ola qayib nəzərimdən.

Mən daxi bir ümmid ilə xaki-rəhin oldum,
Ey sərv, diriğ etməgilən sayə sərimdən.

Əğyar çəkər zəhməti-bica, nə bilir kim,
Yüz tutmaz ayırmaq məni öz didələrimdən.

Ey çərxi-dəni, pasi-ədəb saxlaginən kim,
Durmaz daxi hər kim ki düşübdür nəzərimdən.

Kəm tutmaginən kövkəbi-bəxti-siyəhim kim,
Əndişə qılır bəhri-bəla ol şərərimdən.

Yandırmadı hiç kimsə məni-zarı ki, cismim,
Od tutdu Səməndər kimi öz balü pərimdən.

Hər bir müjə bir nişi-rikü əbri-bəladır,
Ey şəm, xəbər sormaginən çeşmi-tərimdən.

Tuşidə degil hali-xərabim sənə, əmma

Hiç vəchilə guya xəbərin yox xəbərimdən.

Qövsi, bu həmandır ki, demiş Sahiri-mahir:
“Gər yağmasa həsrət yağışı çeşmi-tərimdən”.

* * *

Cümleyi-aləm mənə əğyar olubdur yar üçün,
Ah kim, əğyarım olmuş yar həm əğyar üçün.

Günbəgün düşdüm gözündən aqibət şəbnəm kimi,
Mən ki, xari-aləm oldum ol güli-bixar üçün.

Kasə-kasə qan içib odlarə saldım könlümi,
Ta kəbab etdim mühəyya saqiyi-xunxar üçün.

Əl götürdüm sübhəvü səccadədən Sən`an kimi,
Ey firəngizadələr, bel bağladım zünnar üçün.

Ömrümi sərfi-hünər qıldım bu kasid mülkdə,
Kim, hünər təhsil edərlər dirhəmü dinar üçün.

Şö`leyi-hicran məni yandırdı axır, ah kim,
Saxlamışdım canımı ol atəşin rüxsar üçün.

Çeşmi-şuri-çərxi-minarəng, Qövsi, badə tək,
Təlxi-kam etmiş məni bir şuxi-şirinkar üçün.

* * *

Ey mənim zülm ilə könlüm kişvərin viran edən,
Dəmbədəm bir özgə nirəng ilə bağrım qan edən.

Ey məni min dərdü dağ ilə fəramuş eyləyən,
Bitəkəllüf hər yetən bidərdə yüz dərman edən.

Ey məni gözdən qoyan axşamadin pərvanə tək,
Tarü püdim sübhədin şəm`i-şəbi-hicran edən.

Ey dəmadəm tifli-baziguşi-bipərva kimi,
Bisəbəb yüz zəhmət ilə yapdığın viran edən.

Guşeyi-çeşmi-tərəhhüm kəsdi məndən aqibət,
Ruzi-əvvəldə məni şərməndeyi-ehsan edən.

Xoş qurubdur taqi-əbrutək təğafül yayını,
Sinəmi amacgahi-navəki-müjgan edən.

Gər təbibi-lütfün iqbal etsə, yarəb, çağıdır.
Kim, nə bir dərdim soran, vardır, nə bir dərman edən.

Naxuni-sə`y ilə Qövsinin açılmaz üqdəsi,
Sən yetiş fəryadə, ey hər müşkili asan edən.

* * *

Çıxanda cani-həzin cismi-natəvanımdan,
Xədəngi çıxaz onun məğzi-üstüxanımdan.

Nə xabi-nazə uyubsan çəməndə, ey gül kim,

Oyandı qönçeyi-təsvir əlamanımdan.

Fəğan ki, bipərü biballıq qəmində ikən,
Zəmanə eylədi avarə aşiyanımdan.

Gedər ki, eyləyə dərmanım, artırır dərdim,
Məgər təbibim usanmaz mənim fəğanımdan?

Ümidü bim ilə bülbül tək ötməz əyyamim,
Əgər baharımı fərq eyləsəm xəzanımdan.

Şəbi-vüsalimi, zinhar, dustlər, sormun,
Bu gün ki, şəm kimi od çıxar zəbanımdan.

Nəsibi-düşməni-xunxarım olmasın, yarəb,
Bu qəm ki, yetdi mənə yari-mehribanımdan.

Bu ol qəzəl ki, Füzuli bəyan edir, Qövsi:
"Zəman-zəman tökülün qətrə-qətrə qanımdan".

* * *

Xəlq, yarəb, axirət daşını atmışlar neçün,
Dinü dil nəqdin fəna dünyayə satmışlar, neçün.

Mənzili-məqsud kim, bir iki gam artıq degil,
Bitəriqətlər kəşakəşdən uzatmışlar, neçün.

Xəlqə gər gərduni pamal eyləmək məqdur ola,
Hirs ilə Qarun kimi toprağə tapmışlar, neçün.

Nurü zülmət bir degil, eşq özgədir, əql özgədir,
Bir-birilə xəlq safü dürdi qatmışlar, neçün.

Eşq tiğindən əgər mə`şuq fariğbal isə,
Bəs qızıl qan ilə gül rəxtin boyatmışlar, neçün.

Nalədən bisərfə bülbüllər bu bağın qönçəsin,
Köçmək üçün xabi-qəflətdən oyatmışlar, neçün.

Saldı Qövsi aləmə şuri-qiyamət eşqdən,
Bilmənəm Məcnun ilə Fərhad yatmışlar, neçün.

* * *

Səbrü qərarım aldı bir arami-can bu gün,
Bir yaxşı yarə könlümü verdim yəman bu gün.

Bildim nigahi-guşeyi-çeşmi nə şivədir,
Mə`lumum oldu fitneyi-axırzəman bu gün.

Ey kim nəsibi-rətli-giran etdilər sənə,
Məxmurlərdən ötməginən sərgiran bu gün.

Bie`tibar danlə verir cür`ə-cür`ə mey,
Dövri-sipehr hər kimə içdirsə qan bu gün.

Hər kim bu gün nə əksə biçər danlə bigüman,
Zinhar, etmə yaxşılar ilə yəman bu gün.

Bir qaşı yay əlində çəkərsən nədamətin,
Öldürmə naz ilə məni, ey şax kəman, bu gün.

Qövsi, dünən çəmən sənə dami-bəla ikən,
Yarəb, nə yüzdən oldu qəfəs aşiyan bu gün.

* * *

Gəl bu meydən, saqiya, iç bir nəfəs qan bir zəman,
İmtəhan üçün bizim odlarə həm yan bir zəman.

Aqibət canana təslim eylədin can nəqdini,
Şükr kim, kamimcə axır döndü dövran bir zəman.

Tiz ümidim məzrəi sirab olub, sərsəbz olar,
Eyləsin istadəlik, ey əbri-ehsan, bir zəman.

Məğzi-canım yandırır bu sür`ət ilə, ah əgər
Öz inanın saxlaya ol bərqi-cövlan bir zəman.

Ol ki, bir ömr atəşi-hicranə yandırmış məni,
Çəkməsin, yarəb, mənim tək daği-hicran bir zəman.

Çəksələr insaf mizanında artıqdır hənuz,
Sübhi-vəsli-cavidandan şami-hicran bir zəman.

Ta nəfəs vardır, səni Qövsi unutmaz bir nəfəs,
Sən həm ondan qafil olma, yad edib an bir zəman.

* * *

Aşiq oldum yengi başdan bir pərirüxsarə mən,
Məst mən, biəql mən, divanə mən, biçarə mən.

Bir sipəndi-şuxyüz məcmərdə yanmaq seyri var,
Nola versəm könlümi hər gündə bir dildarə mən.

İstərəm pərvanə suzin, sevmişəm bülbül sözün
Kim, inanım vermişəm ol şəm`i-gülrüxsarə mən.

Aqibət bir yerdə bifikrəm, fəramuş eylərəm,
Kaş tapşursam həyatım nəqdini dildarə mən.

Gözləri qan içməkü qan tökmək istər kiprigi,
Canımı bu qorxudan təslim qıldım yarə mən.

Görmədim bir zərrə eyb ağzında ol şirinləbin,
Diqqət ilə eylədim hərçənd ana nəzzarə mən.

Nöqteyi-xalından, ey göz mərdumi, pərgar tək,
Əşkrizan olmuşam sərgəştə mən, avarə mən.

Şənbəvü adına çox gördüm, vəli gün görmədim,
Ta bu məktəbxanədə fərq etdim ağü qarə mən.

Eyləməz, Qövsi, tədarük bir nəfəs üsyanimi,
Ömri-cavidan əgər sərf etsəm istiğfarə mən.

* * *

Sızıldar üstüxanim, bilməm, ey can, sən nə sızlarsan,
Yanar bərqi-bəladən ol neyistan, sən nə sızlarsan.

Könül, xuni-cigərdən cami-gülgunin ləbaləbdir,
Bu hamı eyş ilə, ey xanəviran, sən nə sızlarsan.

Bu gün mən bizəbanəm, bənd-bəndim yansa eyb olmaz,
Sənə mümkündür, ey ney, ahü əfğan, sən nə sızlarsan.

Yanarsan mətləbincə, ey sipəndi-şux odlarda,
Mənim tək görməmişsən daği-hicran, sən nə sızlarsan.

Mən, ey ney, olmuşam bitab öz fəryadü naləmdən,
Bu yanar od məni etmiş neyistan, sən nə sızlarsan.

Gərəkdir kim, qəfəs qeydində mən fəryad edəm, bülbül,
Müyəssərdir sənə seyri-gülüstan, sən nə sızlarsan.

Sınıb mina kimi mən sızlasam bica degil, Qövsi,
Bükülmüş qədd ilə, ey taqi-nisyan, sən nə sızlarsan.

* * *

İlahi, könlümi ya badə, ya qan istərəm səndən,
Bu viran mülki, ey me`mar, viran istərəm səndən.

Zəmingir olmuşam bimehrlikdən sayə tək, yarəb,
Bu yoldan bir yegin sərvi-xüraman istərəm səndən.

Sənin mən kakilin tarinə könlüm bağlaram axır,
Onu zülfin kimi əmma pərişan istərəm səndən.

Könül bir qətrə qan artıq degil verdim sənə, əmma
Gözüm, ol qətrəni dəryayi-ümman istərəm səndən.

Qərəz, sənsən təbibim, hər nə istərsən budur vəchi
Ki, həm dərd istərəm, hər dərdə dərman istərəm səndən.

Bitirmək heyfdir, zəxmi-nümayanın,bu üzdəndir
Ki, əvvəl mərhəm, ondan sonra peykan istərəm səndən.

Deyirlər öldürübsən Qövsini hicran ilən, əmma
Onun qanını mən, ey namüsəlman, istərəm səndən.

* * *

Bir sən kimi gül yoxdur bu güllər arasında,
Yox mən kimi bülbül həm bülbüllər arasında.

Hərçənd siyəhbəxtəm, bil qədrimi yaxşı kim,
Pərvərdə olur daim od güllər arasında.

Tərk etmə gözü könlüm kim, sonə tutar məskən,
Ya çeşmələr üstündə, ya güllər arasında.

Gəh vəsl məni saxlar, gəh hicr qılır pünhan,
Bu odların içində, ol güllər arasında.

Ol çöhrəsidir, yarəb, bu kakili-mişkin mey,
Ya qalmış ola nəsrin, sünbüllər arasında.

Hərçənd məhi-Kən`an hüsn ilə səraməddir,
Layiqdir onu saysan gər qullar arasında.

Ol nəğmənin, ey bülbül, bil qədrini, şükr eylə,
Fəryad nədir, kafər, novgüllər arasında.

Peyvəstə olurdun sən ahulər ilə həmdəm,
Mən yalquzam, ey Məcnun, bu çöllər arasında.

O şah sənə axır bir sayə salır, Qövsi,
Sail kimi qoy başın, yat yollar arasında.

* * *

Nola gər fərq ola namərdlərdən mərd dünyadə,
Əgərçi bəllidir hər mərdü hər namərd dünyadə.

Edirdim nikü bəd fərqin, bilirdim yaxşılar qədrin,
Fəğan kim, açmadım göz bir nəfəs namərd dünyadə.

İçirlər xəlqi-aləm sağəri-zərrin ilə səhba,
Mənə qalmışmı əşki-sürxü rəngi-zərd dünyadə.

Betərdir tiğdən biabrulər surətin görmək
Ki, olsun tö`meyi-şəmşir hər namərd dünyadə.

Cəhanda buyi-dərdü dağ hiç kimsədən gəlməz,

Anınçün gün görürlər mərdümi-bidərd dünyadə.

Yetişməz mehri-aləmtabə çıxa göglərə şəbnəm,
Vüsalindən gülün gər olmaya dilsərd dünyadə.

Necə yığsın külüm, yarəb, nəsimi-sübhi-məhşər kim,
Məni yandırdı birəhmanə ol bidərd dünyadə.

Olar kim, ol təbibin hikmətindən qafil olmuşlar,
Nə bilsinlər ki, eyni afiyətdir dərd dünyadə.

Necə mən bilməyim, Qövsi, bu viran olmuşun qədrin
Ki, öz könlümdən ayrı bulmadım həmdərd dünyadə.

* * *

Hərçənd tiğ kimi qədin xəlqi doğrıya,
Doğra ki, yox zəval iki aləmdə doğrıya.

Fəttan gözün oğurladı oğrı nigahdən,
Min könlü kim, həlaldır oğrıdan oğrıya.

Müjgan demin ana ki, mən sadə uğradım,
Bir çalıcı həramiyə, bir əgri oğrıya.

Yarəb, dönüncə bir daxi ol qanlı mey görəm
Kim, ötə qan tutanlara doğrıya-doğrıya.

Qövsi kimi qiyamətədin tanımaz özin

Ol tərki-məst hər kimə bir qatla oğrıya.

* * *

Yetərmi rişteyi-can gövhəri-yeganəsinə
Ki, gün kəməndi anın yetməz astanəsinə.

Məni-mühəqqəri seyd etdi ol hilaləbru
Ki, çərx-rəşk aparar yayinə, nişanəsinə.

Nədir həyati-dilü din ki, etməyim bir-bir,
Fəda girişməsinə, nazinə, bəhanəsinə.

Hərami könlümə tapşırdı zərnişan oxlar
Ki, hər birisi dəgər padşəh xəzanəsinə.

Nola fəğanım eşitsin ki, gül qulağ olmuş,
Ayağdan başadin bülbülün təranəsinə.

Qəmi-bədən yetər, ey dil ki, novbahar keçər,
Verincə mürği-çəmən rövnəq aşiyanəsinə.

Əgər xəbər bula quş zövqi-guşədən, Qövsi,
Bəlayi-dami edər ixtiyar danəsinə.

* * *

Bir ömr bağladım nəzərim məhliqalərə,
Sərf eylədim gözüm işığın tutiyalərə.

Saldı təkəllümün bizi ağzın xəyalinə,
Çoxlar düşər söz üstə görünməz bəlalərə.

Bizdən əsirgəmə dilər isən bəqayi-hüsn,
Ne`məntdən ol qalır ki, verirlər gədalərə.

Yad etmək aşinaləri eyb olmaz, ey səba,
Söylə bizimlə yadlənən aşinalərə.

Axır xəyali-muyi-miyanın sənin məni,
Uğratdı göz görə nə görünməz bəlalərə.

Ol cismi-natəvan börəgü üstüxanmıdır,
Ya bir qübar qonmuş ola buriyalərə.

Nəm yerdə nəmli pərdə çürür, sərmədin günə,
Vəchi budur ki, göz dikirəm dilrübalərə.

Yay arxasın çevirmədən almaz nişanını,
Qövsi, duadə arxa çevir müddəalərə.

* * *

Gər can diləsə lə`li-ləbin, canım üstünə,
Dil istər isə, dideyi-giryanım üstünə.

Gözdən nə görmüş ola dili-parə-parə kim,
Səf bağlanmış, gəlir səfi-müjganım üstünə.

Təbxal olar sitarələri mehr ilə fələk,
Bir əl basarsa sineyi süzanım üstünə.

Tərdamənəm cəhanda, vəli bitəəllüqəm,
Dünya tozu yapışmadı damanım üstünə.

Ləngərli tiğdən necə zəximim göz örtə kim,
Şəbnəm girandır ol güli-xəndanım üstünə.

Toprağdən məni götürün, xaksar olur,
Toz qondu bəs ki, gövhəri-qəltanım üstünə.

Qövsi, deməm ləbindən anın ol gərək mənə,
Düşnamü busə, hər nə gəlir canım üstünə.

* * *

Müyəssər oldu bu gün vəsli-yar kamımca,
Açıldı qönçəvü oldu bahar kamımca.

Hənuz azdır əgər şükr edəm qiyamətədin
Ki, bir gün oldu mənim ruzigar kamımca.

Füruği-vəsldən odlandı şəm`i-müjganım,
Kül etdi aqibət ol növki-xar kamımca.

İlahi, naləm ilə şami-hicrə yanmayasan
Ki, döndüm, ey fələki-bilmədar, kamımca.

Xətadır ol ki, deyər bir gül ilə yaz olmaz

Ki, oldu bir nəfəs ol novbahar kamımca.

Bir arxa kim gələ su, var ümid bir də gələ,
Olursa ömr, olur bir də yar kamımca.

Sənin muradın ilə oldu gər zəman, Qövsi,
Mənim də bir gün olar ruzigar kamımca.

* * *

Sözüm yoxdur fələk gər baxmasa gözdən axan yaşə,
Budur qorxum kim, ol seyli-bəla bu körpüdən aşə.

Nigahü didə bir-birin unutdu sən niqab açgəc,
Bəli, məhşər güni kimdir baxan hər yarə, yoldaşə.

Birin zahid, birin mehrab sandım, canı tapşırdım,
Əmanətmi verirdim ol hərami göz ilə qaşə?

Bu yüzdən tutmanam yaşım inanın kim, degil kamil
Biri kim, dəgməmiş aləmdə başı daşdan-daşə.

Təəccüb yox, çəkərsə könlümə göz tiği-müjganın
Ki, daim dəhrdə qan yuddurar qardaş-qardaşə.

Nola gər bulmasa təğyir zahid könlü hüsnündən,
Nə təsir eyləsin xurşidi-rövşəngir qara daşə.

Şikəstə Qövsiyə göstərmə istiğna yüzün munca,
Kiçikdir zərf, odun çox güclü etmə, olmaya daşə.

* * *

Baxan kimdir gülü gülzarə ol rüxsar olan yerdə,
Hüsnü xaşakə kim, iqbal edər gülzar olan yerdə.

Qəmi-eşqin məni dünya qəmindən fariğ etmiş kim,
Şərər bidəstü padır bərqi-bizinhar olan yerdə.

Anın yanında, ey göz, tökmə əşkü içmə qan, ey dil,
Meyü sağər nə lazım saqiyi-xunxar olan yerdə.

Bəladır ixtilati-mərdümi-əfsürdədil, vaiz,
Məni meyxanələr məst eyləməz huşyar olan yerdə.

Mən əldən getmişəm, ey xublər, məndən nə istərsiz
Ki, himmət əhli hərgiz yox deməzlər var olan yerdə.

Könüldən iş gəlir hərçənd surət natəvan olsa
Bədən bikardır, əmma könül bimar olan yerdə.

Meyi-gülfam olanda ta dilim var, hayü huyim var,
Vəli ağzım açılmaz, zahid, istiğfar olan yerdə.

Xoş ol saət ki, çeşmi-zəxm üçün bitablıq, Qövsi,
Sipənd etsin məni ol atəşin rüxsar olan yerdə.

* * *

Nəşati-mey qənimətdir qəmi-hicran olan yerdə,
Xümaraludə səhba şükran eylər qan olan yerdə.

Xəyalin sinədə, könlüm ayağ altındadır, saqi,
Oturmaz sədrdə ev sahibi mehman olan yerdə.

Cünunə təngnayi-kuçəvü bazar afətdir,
Mənim cövlanimi görmək gərək meydan olan yerdə.

Demə bərqi-baharandır ki, əbri-dudi-ahimdən,
Şərərlərdir çıxan ol atəşin cövlan olan yerdə.

Mən ol miqdar vəhşət eylərəm əğyar yanından
Ki, aram ilə könlüm əglənər canan olan yerdə.

Rəfiqindən olar yaxşı-yəmanı hər kimin zahir
Ki, zəncir ilə əglənməz mələk şeytan olan yerdə.

Bu zə`f ilə mənim qəddim necə xəm bulmasın, Qövsi,
Sipehr səxtbazü qaməti çövkan olan yerdə.

* * *

Bihəmdüllah, yatıbdım sinəm içrə dağ-dağ üstə,
Bəli, məşhur sözdür ol məsəl kim, yağ-yağ üstə.

Qaradır ruzigarı hər kimin kim könlü rövşəndir,
Bilir hər tifli-məktəb kim, yazılmaz ağ-ağ üstə.

Qiyamət həm olursa durmanam ol sərv ayağından,

Sənə ərzani, bülbül, gül-gül üstə, bağ-bağ üstə.

Ayaqdan salmayıb minayi-gərdun möhlətin versə,
Yüz il əl bağlaram qulluqda, saqi, bir ayaq üstə.

Nə tə`sir eyləsin, yarəb, nə vəch ilə görünsün kim,
Fələkdə ulduzum bir lalədir bir qarlı dağ üstə.

Demə ki, bilmənəm eşqində dərdü dağ qədrin kim,
Könül titrər gözüm, pərvanlər tək bu çırağ üstə

Nə gülşəndir bu bir gülşən ki, ta işlər gözüm, Qövsi,
Həmin bülbül görər bülbül yanında, zağ-zağ üstə.

* * *

Sipəndi-bisədayəm şö`leyi-avaz olan yerdə,
Neyəm ney, aşəti-bərgü nəvayəm saz olan yerdə.

Bu dilsizlər dilin hərçənd ney həm məndən ögrəndi,
Nəvayi-naləmi görmək gərək dəmsaz olan yerdə.

Mən ol bidəstü pa seydəm, mən ol bibalü pər mürğəm
Ki, pərvaz eyləməz ruhum məgər şəhbaz olan yerdə.

Onun yanında siz pamalsız, ey sərvi-qamətlər,
Görünməz səbzeyi-xabidə sərvi-naz olan yerdə.

Təvəccöh şö`ləsi sözündə tərdir sərgiranlıqdan,

Həqiqət aləmində naz yoxdur naz  olan yerdə.

Sənin dövründə kafər bütlərə iman gətirməz kim,
Füsunü sehri-batil namədir e`caz olan yerdə.

Məhəbbət aləmində, dustlər, hər mə`ni üz versə,
Deyin kim, könlüm əglənməz bu sözlər az olan yerdə.

Sanır bülbül məni bibalü pər, əmma nə bilsin kim,
Yüz il pərvaz edər şövq əhli həm pərvaz olan yerdə.

Ana əhvalimi sən, ey nigahi-əcz, şərh et kim,
Dilim tutmaz mənim çeşmi-süxənpərdaz olan yerdə.

Nə bilsin əndəlib ayinədir gülçöhrələr könli
Ki, fəryadü fəğan eylər nəfəs ğəmmaz olan yerdə.

Ümidim var şəhidi-Kərbəladən bir nəzər, Qövsi,
Səfi-məhşərdə hər yaxşı-yəman mümtaz olan yerdə.

* * *

Təşneyi-gülzari-daği-laləzarəm, ah, ah,
Təxteyi-məşqi-cünuni-novbaharəm, ah, ah.

Seyl viran eyləyən ev qabili-tə`mirdir,
Neyləyim mən ki, xərabi-ruzigarəm, ah, ah.

Qüdrətim yox çərx evindən başım alıb çıxmağa,
Bir üzü bağlı, gözü bağlı şikarəm, ah,ah.

Nalədən xali qılır gahi sipənd öz könlüni,
Ah kim, mən bizəbanəm, biqərarəm, ah, ah.

Öylə kim, seylab önündə xarü xəs pamal olur
Paymali-giryeyi-biixtiyarəm, ah, ah.

Seydə gər yüz yerdə zəncir olsa, mümkündür xilas,
Mən giriftarı-kəməndi-zülfi-yarəm, ah,ah.

Heyf, Qövsi, çərxi-sübhi-piçü tabəm, heyf, heyf,
Ah neylim, şəm`i-şami-intizarəm, ah, ah.

* * *

Xəfifü xardır hərçənd bülbül xar yanında,
Anın pərvazini görmək gərək gülzar yanında.

Yetən bidərdə dərdi-dil demin kim, zəhri-qatildir,
Meyi-gülrəngi-ləzzətafərin hüşyar yanında.

Sərabi-xüşk tək zahid mən`i gər hiçə həm almaz,
Girami gövhərəm dəryayi-ləngərdar yanında.

Dözürmi sineyi-suzaninə xurşidi-üşşaqin
Ki, gərdun bir tütündür ahi-atəşbar yanında.

Fəramuş eyləyim dünyavü mafihayi, eyb olmaz,
Mənim kim, yadımü huşim qalıbdır yar yanında.

Qara günlülərin xurşidi-aləmtabdır könli,
Nə hacət şəm`ə məhfil dideyi-bidar olan yerdə.

Meyi-gülfamdən, saqi, məni məst eylədi Qövsi
Ki, abi-kövsər içsin saqiyi-əbrar yanında.

* * *

Ağrımaz bülhəvəs eşq əhli xarü zar olan yerdə,
Nədir zağü zəğən miqdarı bülbül xar olan yerdə.

Mənə hər bir sözi min yol demək, saqi, hənuz azdır,
İşarət yaxşıdır, əmma tərəf hüşyar olan yerdə.

Deyərlər xəlq kim, dərmanı var aləmdə hər dərdin,
Təbibim, bəs nədir dərman könül bimar olan yerdə.

Mənim şəbnəm kimi dünyadə asayiş gözüm yoxdur,
Umarmı kimsə rahət çərx atəşbar olan yerdə.

Təmənna eyləmin, ey xublər, dilgərmlik məndən
Ki, mən pərvanəyəm ol atəşin rüxsar olan yerdə.

Gözümdən yar hərgiz qayib olmaz, ta görüm qeyri,
Demin kim, könlüm əglənmiş mənim əğyar olan yerdə.

Nə bakim var mənim gərduni-minafam olan yerdə
Ki dövran yardır, saqi, mənimlən yar olan yerdə.

* * *

Saldı ol sərvi-rəvan sayə həvaxahlərə,
Ayağı bağlılarə, əlləri kütahlərə.

Qanı öz boynunadır keçməyən öz qanından,
Gər nigahin düşə məhşər güni xunxahlərə.

Kakilin fikrinə mən öylə ki, çulqaşmış idim,
Çıxar idim gögə yapışsa idim ahlərə.

Sayeyi-lütf salır başıma bir sərkeş kim,
Boyun əgməz səri-kuyində gəda şahlərə.

Aləmin dərdi-səri əql imiş, ey bixudlar,
Bunu məndən eşidirsiz, deyin agahlərə.

Ey cərəs hər qədəm öz qarşına rəhzən çağırar
Kim ki, bu vadidə yol göstərə gümrahlərə.

Hər qədər yandırar ol şami-qəriban, Qövsi,
Verərəm şəm kimi arxa səhərgarlərə.

* * *

Kuyində yarın itlər yetməz mənə vəfadə
Kim, bəndi-pirəhəndir boynumdakı qiladə.

Dövri-rüxündə xəttin var özgə abü tabi
Kim, səbzəsiz çəməndir rüxsari-safü sadə.

Gər mehrini yaşurmaq möhri-ləb olmasaydı,
Xakistərin sipehrin naləm verirdi badə.

Pərvanə qane olsa məhtab şəm`i bəsdir,
Ta var yadi-vəslin, düşməz vüsal yadə.

Yandırdı məğzi-canım ney şəm tək, nə bilsin.
Kim, tabi-nalə olmaz üşşaqi-binəvadə.

Təsxiri-əşkü ah et, abü həvayə uyma,
Kim çaği-dəhr qalmaz dörd fəsl bir həvadə.

Boynumda xoşnümadır zəncir yoxsa, Qövsi,
Bir at ki, xu salıbdır hacət degil qiladə.

* * *

Hanı məndən deyən ol sərvi-səhi-balayə
Ki, kəşakəş nə rəvadır bu bükülmüş yayə.

Aşiq oldum yenə bir sərvi-səhiqamətə kim,
Məhi-tabanı bəgənməz, günə salmaz sayə.

Dərd sövdagəriyəm, eşq ilədir bazarım,
Var, başımdan savul, ey əqli-tünük sərmayə.

Çəkməz əl nasehi-bidərd giribanimdən,
Nə veribdir, ala bilməz məni qəmfərsayə.

Hərfi-qəmmaz məgər verdi dəhanın xəbərin
Ki, vücudim yenə peyğam aparır ənqayə.

Səbzə tək mən də bir ümmid ilə pamal oldum,
Nola, ey sərvi-rəvan, başıma salsan sayə.

Yeri, yanımda çox, ey seyli-baharan, daşma
Ki, bu bir qətrə boyun əgsə əgər dəryayə.

Bilmənəm dəhrdə, yarəb, nə vəfa görmüş ola,
Biri kim, könlünü bağlar bu fəna dünyayə.

Güvənir qəsrinə, eyvanına dünyası olan,
Xanəbərduş gəzən ərş ilədir həmsayə.

Naz edər zərrəyə xurşid, məgər bilməz kim,
Pəst olduqca bu me`racdə artar payə.

Boyamış yazi yüzin, laləsitan sanma ki, mən
Göstərib dağımı, qan ağladıram səhrayə.

Qatlanır cism, gözüm yaşına heyranəm kim,
Dözür ol pəstcə divar bu daşğın çayə.

Gecələr naleyi-dilsuz bəladır, Qövsi,
Olmasın aşiq ilə kafər olan həmsayə.

Gülrux sərvi-qədlim cameyi-əlvan neylər
Ki, yetər xuni-dili-Qövsi, ana pirayə.

*   *   *

Ey vay ki, əldən gedirəm yar gəlincə,
Dildən düşürəm başıma dildar gəlincə.

Hər kim nə bilir mən kimi mey qədrini kim, mən
Qanlar içərəm saqiyi-xunxar gəlincə.

Mə`zur tutun, gər bu xümar ilə çəməndə,
Səbr eyləmənəm əbri-göhərbar gəlincə.

Yarəb, bu qədər yol ki, məni zə`f aparıbdır,
Gəlseydi təbibim məni-bimar gəlincə.

Pərvanə kimi günlərim əzbəs ki, qaradır,
Ömrüm yetər əncamə şəbi-tar gəlincə.

Fəryad ki, seylabi-səbükseyri-həvadis,
Dağıtdı məni üstümə me`mar gəlincə.

Əlbəttə nəşat öldürəcəkdir məni, Qövsi,
Hərçənd qəm öldürməsə qəmxar gəlincə.

*   *   *

Təbibim başıma bir gün gəlir, vallah, billah,
Mənə tapşırdığı canı alır, vallah, billah.

Deyirlər halımı sormaz, sorur, bir özgə dildir bu,
Sanırlar dərdimi bilməz, bilir, vallah, billah.

Məni, ey şuxi-səngindil ki, tiğinçün həlak oldum,
Sən öldür, yoxsa həsrət öldürür, vallah, billah.

Mənim hərçənd könlüm rövzeyi-rizvandan açılmaz,
Əgər sən  açılırsan, açılır, vallah, billah,

Deyirlər ömri-müstə`cəl gedər, gəlməz, nə sözdür bu
Ki, sən gəlsən keçən günlər gəlir, vallah, billah.

Sən al, ey iltifati-yar məndən nəqdi canım kim,
Təğafül ondan ötrü yalvarır, vallah-billah.

Əlin rəngindir, ey bülbül, ayaq altına baxmazsan,
Təlafilər tədarüklər olur, vallah, billah.

Gözüm hərçənd Qövsi dərdini pünhan tutar səndən,
Xəbərdar ol kim, ol bidar olur, vallah, billah.

* * *

İstəməzmi ol sitəmkər kim, məni şad eyləyə,
Könlümü tə`mir edə, yüz Kə`bə abad eyləyə.

Yıxdığıyçün könlümü küffarə vacibdir gərək,
Ya məni azad edə, ya min qul azad eyləyə.

Padşahlar eyləməzlər özləri cəlladlıq,
Ta fələk vardır, nə lazım yar bidad eyləyə.

Hər ələ yüz tiğ tutmaq hansı qatildən gəlir,
Çeşmi-məstin etdigin haşa ki, cəllad eyləyə.

Olmasın, yarəb, fəramuş ol mürüvvət pişə kim,
Bimürüvvət yarımı görçək məni yad eyləyə.

Eyləsə bimari-eşqin dərd edər dərmanini,
Qorxum oldur kim, təbibim tərki-bidad eyləyə.

Badeyi-gülguncə keyfiyyət verir hərgah kim,
Saqiyi-nazafərin, Qövsi, məni yad eyləyə.

* * *

Mən ki, əldən getdim ol sərvi-rəvan, gəl görgilə,
Qalmadan can məndə ol arami-can, gəl görgilə.

Acı etmişkən bu gün səfrayi-hicran ağzımı,
Dustlər, ol dilbəri-şirinzəban, gəl görgilə.

Gəlməmişkən kimsədə arami-taqət qoymadı,
Ol bəlayi-cani-aşiq, nagəhan, gəl görgilə.

Eyləmişkən navəki-hicran müşəbbək sinəmi,
Nagəhan bir guşədən ol şaq kəman, gəl görgilə.

Ağlamaq qan eyləməkdir, dustlər, ol bəzmdə,
Göz yolundan əşk seylabilə qan, gəl görgilə.

Canımı hicran odu yandırmamışkən pakü saf,
Üstümə ol atəşi-atəş nişan, gəl görgilə.

Hamı yandan dərdü qəm, Qövsi, alarkən canımı,
Bir tərəfdən ol həyati-cavidan, gəl görgilə.

* * *

Fəğan ki, daği-dil əfsürdələndi yar gəlincə,
Bu gül açıldıvü dağıldı novbahar gəlincə.

Yetincə yar məni intizar canə yetirdi,
Boranə verdi xəzan hasilim bahar gəlincə.

Demə ki, qurtararam intizardan gələr olsan
Ki, gözlərəm yolunu çeşmimə qübar gəlincə.

Nə bərq var şəbi-hicran, nə şəm, bəs bu nə işdir
Ki, yandırır məni ol atəşinüzar gəlincə.

Gələndə yar, üzülür məddi-nalə riştəsi, vəh kim,
Kəməndi-fürsətim əldən gedər şikar gəlincə.

Bu piçü tabilə mümkünmüdür üzülməyə canım,
Kəşakəşi-şəbi-hicran gedincə, yar gəlincə.

Bu növ kim, onu əldən nəvayi-bülbül aparmış,
Gəlib bahar keçər, Qövsi, fikar gəlincə.

* * *

Qan içmə, könül, saqiyi-xunxar gəlincə,
Səbr eylə, gözüm, növbəti-didar gəlincə.

Əlbəttə bu yol ərz edərəm dərdi-nihanım,
Qəm salmasa dildən məni qəmxar gəlincə.

Güllər düşəcəkdir gözümə xuni-cigərdən,
Gün seyrinə ol novgüli-bixar gəlincə.

Fəryad ki, hicran məni bərbad edəcəkdir,
Ol atəşi-suzani-şərərbar gəlincə.

Ey vay ki, heyrət məni dildən salacaqdır,
Ol nuşləbi-ayinərüxsar gəlincə.

Əfsus ki, həsrət məni məndən alacaqdır,
Bazarimə o aricə dinar gəlincə.

Birdir mənə mərhəm gələ, ya gəlməyə, Qövsi,
Kim, tazələnir yarələrim yar gəlincə.

* * *

Xəyali-arizin kim, vəsldir hicran libasında,
Verir hər dəm mənə səhbayi-biğəş qan libasında.

Vüsal ilən əlaci-eşqi-ruzəfzun degil mümkün,
Dəvayi-namünasib dərddir dərman libasında.

Nə mə`nidir bu, yarəb kim, məni-heyranda can qalmaz,
Görəndə özgəni həm nagəhan canan libasında.

Bu surətxandə hər surəti-bicanə aldanma
Ki, çoxdur bülhəvəslər aşiqi-heyran libasında.

Ləbi-xəndan ara bərqi-bəla məsturdur, əmma
Nihandır əbri rəhmət dideyi-giryan libasında.

Təmə kəs malü cahindən cəhanın kim, sənə gərdun
İçirdir xuni-nahəq ne`məti-əlvan libasında.

Təvazö bərtərəf, Qövsi, məhəbbət ittihadından,
Səri-kuyində sahibxanədir mehman libasında.

* * *

Peyvəstə xar olur güli-xəndan ilən belə,
Sübhi-vüsal ötər şəbi-hicran ilən belə.

Canadə canı verməz isəm vəchi var ki, mən
Çox dərdü dağ bəsləmişəm can ilən belə.

Bir gün bunuvü bir gün onu versə qəm degil,
Dövran mənə şərab verir qan ilən belə.

Dərvişə xar baxma ki, Qur`anda səbtdir,
Muri-zəifin adı Süleyman ilən belə.

Yer qalmadı ki, gəzmədimü yarı bulmadım,
Deyrü hərəmdə gəbrü müsəlman ilən belə.

Öldür mənivü könlümü  al kim, bu Kə`bədə,
Hacı gərək fəda ola qurban ilən belə.

Yarəb, ləbin nə sehr ilə bir yerdə cəm edər,
Abi-həyatı atəşi–suzan ilən belə.

Qorxum budur ki, çün çıxa peykanı yarədən,
Cani-zəif çıxmaya peykan ilən belə.

Dünyadə daxi cənnət olurmuş ki, bir nəfəs,
Durdum, oturdum axırı canan ilən belə.

Qövsini yalquz ol iki-üç zalim öldürür,
Çeşmü nəzarə navəki-müjgan ilən belə.

* * *

Hüsn eşq ilə bərabərdir, giriftar olmasa
Kim, göhər xak ilə yeksandır, xəridar olmasa.

Eyləmə ikrah məndən kim, təbibi-haziqin,
Qədri namə`lumdur, hər yerdə bimar olmasa.

Daneyi-xalın qılır zöhhadi fariğ sübhədin,
Rişteyi-zülfün yetir tərsayə zünnar olmasa.

Ruzi-hicran ummasın məndən məhəbbət kimsə kim,

Qaynamaz qanım mənim ta çeşmi-xunxar olmasa.

Tarü pudim bir-birindən ayrılır simab tək,
Mayeyi-araməm ol ayinərüxsar olmasa.

Xərməni-ümmidimə öz şö`leyi-ahim yetər,
Sabitü səyyarədən gərduni-şərərbar olmasa.

Eşq tərkin etməyən bilməz bu dövlət payəsin,
Məstlik qədrin nə bilsin kim ki, hüşyar olmasa.

Üzdü canın riştəsin qəm, kimsə agah olmadı,
Vay, yüz min vay canan həm xəbərdar olmasa.

Bəs ki, müddətlərdir ögrənmiş kəməndi-zülf ilə,
Baş qoyar səhralərə Qövsi giriftar olmasa.

* * *

Səba, sən ərz qıl bir rəng ilə əhvalimi yarə,
Vəli yavuncaya-yavuncaya, yalvarə-yalvarə.

Sənə ol qaməti-mövzun ilə mümkün degil həmta,
Bəli, möhtac olarmı misrei-səncidə təkrarə.

Əgər mö`min, əgər kafər əsiri-tari-zülfündür,
Kimi təsbinə oxşatmış onuvü kimsə zünnarə.

Gəl, ey növxət, rəva görmə ki, sənsiz böylə gülşəndə,

Çəkrib hər səbzə bir tiği-cəfavü bağrımı yarə.

Ölüb qurtardı öz canın, əcəb bidad imiş Məcnun,
Yəqin kim, dərd bilməz böylə dərdə istəyən çarə.

Xətü xalından özgə kim, qaradır ruzigarım tək,
Kimin mən tək günü xurşidi-taban eyləmiş qarə.

Zəbani-halilə sordum ləbindən qanlımı, Qövsi,
Dedim gözdür, dedim sözdür, dedi nəzzarə, nəzzarə.

* * *

Mənimlə saqiyi-gülçöhrə yar ola, nə ola,
Başımda sayeyi-əbri-bahar ola, nə ola.

Bahar fəsli müradincə bülbülün gəldi,
Mənim də kamim ilə ruzigar ola, nə ola.

Əgərçi könlüm evin yıxdı, yaxdı, yandırdı,
Bu dərd ta ki, cəhan var, var ola, nə ola.

Qərarü səbrim alan nazəninim öz könlin,
Mənim kimi oturub biqərar ola, nə ola.

Qavurdu bağrımı rəşk atəşi, budur dərdim,
Ki, qeyr-qeyr oluban yar, yar ola, nə ola.

Bu abü rəng ilə gər sən gülə-gülə gələsən,
Gəlib çəmən açılıb gül bahar ola, nə ola.

Müşəvvəşəm bu cəhanda ki, nəqdi canım ana,
Nisar olmaya, yarəb, nisar ola, nə ola.

Yəman qavurdu məni aftabi-mey, Qövsi,
Başımda sayeyi-əbri-bahar ola, nə ola.

* * *

Zinhar, atma sitəm daşını divanələrə
Ki, pərilər yığılıbdır bu pərixanələrə.

Eşq hərçənd gəzir hüsn deyə qapı-qapı,
Öz ayağilə gəlir gənc bu viranələrə.

Gözü könlüm, səni, ey leyliyi-afaq, istər,
Nola bassan ayağın gər bu siyəhxanələrə.

Zülfü kakil sözi ilə gecəmi sübh edərəm,
Tifli-nadan kimi ögrənmişəm əfsanələrə.

Bu xümar ilə nola badə içib yalvarsam,
Boyi mina, özi saqi, gözi meyxanələrə.

Qaralıbdır bir-iki şəm`ə gözün məhfildə,
Uymamışsan şəbi-məhtabdə viranələrə.

Gül degil, şəm degil Qövsiyə mənzur, əmma
Sübh bülbüllərə oxşar, gecə pərvanələrə.

*   *   *

Ömürlər xuni-dil içdim, gül`üzarım, səndən ötrü,
Axırı dağlarə düşdüm, laləzarım, səndən ötrü.

Sinəmi oxlar dəlibdir, qanlı peykanlar qalıbdır,
Canımı qəmlər alıbdır, qəmküsarım, səndən ötrü.

Aşiq olan keçər eldən, başü candan, canü dildən,
Damənin tək getdi əldən ixtiyarım, səndən ötrü.

Gözlərim qan ilə doldu, bilmənəm könlümə noldu,
Kakilin tək qarə oldu ruzigarım səndən ötrü.

Qövsi ilə həmdəm oldum, həmdəmi-dərdü qəm oldum,
Xarü zari-aləm oldum, nazlı yarım, səndən ötrü.

*   *   *

Dildən-dilə düşdüm dili-divanədən ötrü,
Urdum özümü odlara pərvandən ötrü.

Bitaqət olur aşiq üçün hüsni-zəbərdəst,
Seylab düşər dağlara viranədən ötrü.

Bənzətmə məni bülbüli-bidərdə ki, ney tək,
Dildən düşərəm naleyi-məstanədən ötrü.

Bir avuc unumdan mənim əflak nə istər,
Derlər ki, dəyirman dolanır danədən ötrü.

Səyyad kimi ahuyi-rə`na tələbində,
Qövsi dolanır mə`niyi-biganədən ötrü.

* * *

Yıxır viranəmi gərdun, sanır kim, xanəmandır bu,
Nə bilsin kim, qanatsız quşlar üçün aşiyandır bu.

Müsəlmanlar, ləbi-meygunə aldanman ki, qandır bu,
Könül yaxşılara zinhar vermin kim, yəmandır bu.

Yığıb, damanını aşiqdən, ey sərvi-rəvan, ötmə
Ki, hüsnün çağı beş gündür, ötər, gənci-rəvandır bu.

Deyirlər kim, nişan bulmaq, dəhanından müyəssərdir,
Qələtdir, iftiradır, məhz sözdür bu, yəlandır bu.

Keçər müjganların daşdan çəkəndə göz qaşın yayın,
Əgərçi bir xəmidə oxdur ol, bir natəvandır bu.

Məni məst etdi dövri-xəttin, ey bədməst, hüşyar ol,
Bahar isə mənə, əmma sənə fəsli-xəzandır bu.

Deyirdim kim, sənin muyi-miyanın var ola, əmma
Eşitdim ol xəyalın sirrinə məxfi gümandır bu.

Bahar ötməkdədir, Qövsi, gözün aç, qönçə tək uyma,
Yetişər köçməgə növbət sənə həm, karvandır bu.

* * *

Düşübdür xəstə könlüm məndənü mən yardan ayrı,
İlahi, düşməsin kafər dilü dildardan ayrı.

İahi, ağzı şirin olmasın zövqü vüsal ilə,
Həyatım təlx edən ol lə`li-şəkkərbardan ayrı.

Qılır gülşəndə gül yanında bülbül naşəkibalıq,
Necə səbr eyləyim mən ol güli-rüxsardan ayrı.

Çəmən səhnində xuni-mürdə tək əsfürdədir, saqi,
Şərabi-laləreng ol nərgisi-xümmardan ayrı.

Gülü gülşəndən, ey bülbül, cüda düşdünsə şükr et kim,
Mənim tək düşmədin ol sərvi-xoşrəftardan ayrı.

Könül həmrazlərdən bəs ki, görmüş bimürüvvətlik,
Şəbi-hicran içər qan dideyi-bidardan ayrı.

Nişatü vəsl umar bidərd olanlar kim, mənim, Qövsi,
Qaradır ruzigarım ahi-atəşbardan ayrı.

* * *

Xəbərdar olginən mina degil, saqi, könüldür bu,
Ağır qiymətlidir, hərçənd gövhər tək yünüldür bu.

Degil müjkanlarımda ləxt-ləxt olmuş cigər kim, mən
Məhəbbət gülşənindən dərmişəm, bir dəstə güldür bu.

Bilir hərçənd könlüm halını ol ahuyi-rə`na,
Vəli Məcnun olanlar yeg bilirlər kim, nə çöldür bu.

Doludur damənim, ey bağban, əmma cidal etmə,
Buna derlər cigər pərkaləsi, bir özgə güldür bu.

Mənim meyxanədən, ey zahidi-qafil, yolum urma,
Həzər qıl, bənzəməz şəmşiri-ləngərdarə, yoldur bu.

Neçün, ey atəşin rüxsar, bilməzsən könül qədrin
Ki, sahibdil yanında tutiyadır, gərçi güldür bu.

Olur məqdur, Qövsi, saxlamaq seylab önün, əmma
İnanın tutmaq olmaz hiç vəchilən, könüldür bu.

* * *

İnanım aldılar əldən, dili-zar ayrı, yar ayrı,
Məni divanə qılmışlar, xəzan ayrı, bahar ayrı.

Cigərgahım sökərlər, tabü taqət məndən istərlər,
Sipəhr ayrı, şəbi-hicranın ayrı, ruzigar ayrı.

Xəzan fəslində, bülbül, guş səndən, əməman məndən
Ki, ayrı şivədir səbrü təhəmmül, zinhar ayrı.

Xəyali-arizin könlümdə pünhan, dağ köksümdə,
Məni məst eylədi seyri-gül ayrı, laləzar ayrı.

Bu il, yarəb, nə güllər dərmisən gülzardən, bülbül,

Əgər mən ayrı töksəm göz yaşı, əbri-bahar ayrı.

Necə xamuş olum, ey qönçə, sən tək mən bu gülşəndə
Ki, məndən nalə istər bülbül ayrı, novbahar ayrı.

Boyundan ayrı nəqşi-pay tək əldən gedər Qövsi,
Xüramından sənin, ey ahuyi-mərdümişkar, ayrı.

* * *

Şərabın bağrı qandır saqiyi-xunxardən ötrü,
Kəbab olmuş, kəbab ol atəşin rüxsardən ötrü.

Deyirdim kim, tutum damənin, ey sərvi-rəvan ötsün,
Fəğan kim, getdim əldən şiveyi-rəftardən ötrü.

Neçün irşadimə bel bağlamazsan, ey bərəhmən kim,
Üzüldü rişteyi-canım mənim zunnardən ötrü.

Ana artar mürüvvət aləmində yüz min ümmidim,
Əgər yüz qəm giribanım tutar qəmxardən ötrü.

Xəsü xaşak tutmaz şö`leyi-bibak damanın,
Əbəs tutmuş qübar ayinəmi əğyardən ötrü.

Hünər tək düşmən olmaz, ey hünərvər han xəbərdar ol
Ki, şəm`i yandırarlar dideyi-bidardən ötrü.

Mənim tək hiç kim pərvanəvü bülbül dilin bilməz

Ki, mən odlarə yandım ol güli-rüxsardən ötrü.

Bu ol şirin qəzəldir kim, demiş ol söz bilən, Qövsi:
"Həqiqətsiz, mürüvvətsiz, vəfasız yardən ötrü".

* * *

Hiç bilmənəm nə ariz, yarəb, nə rəngdir bu,
Billah küfr olurmu, dersəm firəngdir bu.

Gər dinü dil aparsa ol xəttü xal səndən,
Zinhar aparma adın, zinhar ki, nəngdir bu.

Çün əqlü din alırlar, səhrayə baş vururlar,
Gülçöhrələr bilirlər rəsmi-firəngdir bu.

Dünya bir əjdəhavü dudü dəmi fələkdir,
Leylü nəhar sanman mari-dürəngdir bu.

Gəlməzsən öhdəsindən, çərx ilə etmə pərxaş,
Sülhinə həm inanma kim, pişi-cəngdir bu.

Gərduni-dun fəzasın darüs-sürur sanma,
Kim, əhli-dil yanında kami-nəhəngdir bu.

Qövsi, qübari-qəmdən xət könlüm etdi sadə,
Ayinəsinə qeyrin hərçənd zəngdir bu.

* * *

Dideyi-ümmid kim, didarın eylər arzu,
Tutiyayi-xətti-ənbərbarın eylər arzu.

Qətreyi-şəbnəm degil kim, gül sərapa guş olub,
Göz tikibdir ağzına göftarın eylər arzu.

Sinəsin eylər müşəbbək, xar-xar iştiyaq,
Kim ki, mən tək navəki-xunxarın eylər arzu.

Olmasınmı şərhə-şərhə bir şikarın bağrı kim,
Cövhəri-şəmşiri-ləngərdarın eylər arzu.

Könlüm, ey qatil, mənim ol seydi-navəkxordədir
Kim, ölüncə tiği-bizinharın eylər arzu.

Ey büti-Çin, nola gər qulluqda mən bel bağlasam
Kim, bərəhmən həm sənin zünnarın eylər arzu.

Xərmənimdə danələr olmuş sipəndi-biqərar,
Bəs ki, hər dəm əbri-atəşbarın eylər arzu.

Çün Səməndərtinətü pərvanəməşrəbdir könül,
Yanə-yanə şö`leyi-rüxsarın eylər arzu.

Etməsinmi arzu Qövsi bükülmüş qədd ilə,
Sərvi-rəna həm sənin rəftarın eylər arzu.

* * *

Aşiq sən oldun, ey dili-şeyda, mən olmalı,
İnsafdır, sən olmalısan, ya mən olmalı.

Çoxlar hərayi-eşq ilə divanə oldular,
Yalqız bu işdə olmuşam, əmma mən olmalı.

Zəxmim yetirsə çərxi-şərərbarə ələtəş,
Tiğin ana gər eyləyə pərva, mən olmalı.

Ey nalə, piçü tab kəməndindən əl götür,
Ram olmasa ol ahuyi-rə`na, mən olmalı.

Gər səndə sidqi-niyyət ola, ab olur sərab,
Sən istə, gər bulunmasa, ənqa mən olmalı.

Öldürməyincə aşiqi-dərdi-giran rikab,
Dərmanə vaqif olsa Məsiha mən olmalı.

Sən tiğ çəkmə qətlinə zinhar Qövsinin,
Öldürməsə onu bu təmənna mən olmalı.

* * *

Nə qəm gər hər nəfəs xuni-dil içsəm, adətimdir bu,
Nola ölsəm, dirilsəm dəmbədəm, xasiyyətimdir bu.

Məni sayəndən olmaz fərq qılmaq, bəs ki, pamaləm,
Bəli, fərmanrəvayi-mülki-fəqrəm, şövkətimdir bu.

İnanımdan tutar əşki-rəvanım qət`i-rahında,

Mənə təmkin satar simab, səbrü taqətimdir bu.

Biyabani-cünun mülküm, palasi-fəqrdir malım,
Yığılmış dərdü dağın başıma, cəm`iyyətimdir bu.

Nola gər xaksarü natəvanü paymaləm kim,
Diyari-eşqdə me`rac şanü şövkətimdir bu.

Kəmali-xarlıq övci-qəbuli-eşqdir, Qövsi,
Sanırlar xəlq kim, nöqsan, qədrü qiymətimdir bu.

* * *

Sanırsan xaki-rah, əmma mənim xakistərimdir bu,
Xəyali-nəqşi-pa eylərsən, əmma peykərimdir bu.

Könül bitabdır, mən safdil, əşki-rəvan qəmmaz,
Özüm ayinəyəm, simabim oldur, cövhərimdir bu.

Özün bil cismü cani-zarilə, ey sərvi-naz, əmma
Dili-bitabimi sındırma kim, balü pərimdir bu.

Fəğanü naləvü ahü qəmü dərdü bəla sanma
Ki, təsxir etməgə gərdun hisarın ləşkərimdir bu.

Sipəhrin gərdişindən özgələr əndişə çəksinlər,
Mən ol dəryakeşəm kim, bir mühəqqər sağərimdir bu.

Alırsan könlümü, viran edirsən, hiç demirsən kim,
Nə lazım çalü çap etmək, mənim öz kişvərimdir bu.

Görürsən yollar üstə Qövsini danəstə, baxmırsan,
Demirsən, bivəfa kim, bir qədimi çakərimdir bu.

* * *

Nola bitəqrib əgər eylərsəm izhar arzu,
Novniyazəm eşqdə, könlümdə çox var arzu.

Mən kimi ta canü dildən kimsə bizar olmaya,
Canü dildən eyləməz aləmdə dildar arzu.

Arzular dərdü qəmdir böylə qəmlər dəf`inə,
Saqivü səhbadən özgə etmə, zinhar, arzu.

Bəs ki, bir sahibbəsirət dəhr bazarında yox,
Yusifi-gül pirəhən etməz xəridar arzu.

Eyb olmaz arzu, mə`zur tutsunlar məni,
Qılsa həsrət gözlərim mətləbcə didar arzu.

Gəh təbəssüm, gəh təkəllümdən gülüstan olmağa,
Bağrımı qan etdi, ey lə`li-şəkərbar arzu.

Mən bu hal ilən necə, yarəb, çəkim hicran yükün
Kim olubdur zə`f əlindən könlümə bar arzu.

Bəs ki, Qövsi, arzu dörd yandan almış çevrəmi,
Fürsətim yoxdur edim cananə izhar arzu.

* * *

Nə ləbdir, vəh nə ağızdır bu, yarəb, vəh nə sözdür bu,
İrağ olsun yəman gözdən, nə müjgandır, nə gözdür bu.

O rüxsar ilə qarşu ab olmaz durduğu yerdə,
Nə üzdür, bu gözüm, ayinədə, yarəb, nə üzdür bu.

Dəmadəm həsrətindən bağrımın qan olduğu vəchin,
İnanır gözlərin, əmma ləbin sanır ki, sözdür bu.

Degil nöqsan iki dünyayə alsan aşiqin könlün,
Mənü tanrıvü mizani-məhəbbət kim, ucuzdur bu.

Əgər gərdunə Qövsi əcz edib yalvarsa, eyb olmaz
Kim, ol biçarə bir yalqız bəlakeşdir, doquzdur bu.

* * *

Gördüm yuxuda yari, əcəb yar imiş yuxu,
Çeşmü çırağı-dövləti-bidar imiş yuxu.

Ondan nigarxaneyi-çin oldu gözlərim,
Bəh-bəh, nə abü-rəngli gülzar imiş yuxu.

Vəslinlə ta qara gecəmi rövşən eylədi,
Bildim ki, nuri-dideyi-bidar imiş yuxu.

Mən xüşkkami eylədi sirabi-cavidan,

Abi-həyati-təşneyi-didar imiş yuxu.

Göstərdi əksi-çöhreyi-cananı bihicab,
Ayinədari-şöleyi-rüxsar imiş yuxu.

Qövsi, gətirdi başıma axır təbibimi,
Darüşşəfayi-aşiqi-bimar imiş yuxu.

* * *

Əsiri-eşq olanlar, yetişdi yar haray,
Xəzan şikəstələri, gəldi novbahar haray.

Yetişdi bülbüli-dilxəstənin harayinə gül,
Yetiş, yetiş bu günümdə haray, yar haray.

Sənə, gözüm işığı, ərzi-hal etmək üçün,
Bir ittifaq ilə həm olmadım düçar haray.

Nə hali-zarimi sordun, nə könlimi aldın,
Boyun bəlasın alım, keçdi ruzigar, haray.

Məni bu gündə salıb yar keçdi ömr kimi,
Haray kim, yox imiş ömrə e`tibar, haray.

Səni bu rəng ilə gülşəndə görməyən nə bilir
Ki, mən kimi nədən ötrü qılır həzar haray.

Nəvayi-nalə sevənlər, dilim açıldı, gəlin

Cünun əsirləri, gəldi novbahar haray.

Yetirdi şəm`inə pərvanə nəqdi-can, Qövsi,
Mən öz mühəqqirimi etmədim nisar, haray.

* * *

Bağrımı qan etdi dövran, naleyi-sərşar hey.
Canımı yandırdı gərdun, ahi-atəşbar, hey.

Canə yetdim piçü tabi-hicrdən, ey yar, hey,
Getdim əldən, ey dolanım başına, dildar, hey.

İltifai et, saqiyi-əbrar, Heydər eşqinə,
Bax ayağın altına, ey saqiyi-xunxar, hey.

Gərçi bərbad eylədin pərvanə tək xakistərim,
Xamsuzəm şəm tək, ey atəşinrüxsar, hey.

Getdi ol günlər ki, təsbih ilə həmdəstan idim,
Gəl bu gün növbət sənindir, həlqeyi-zünnar, hey.

İrzini dərd əhlinin yaxdın diyari-səbrdə,
Naleyi-cansuz bəsdir, ey dili-bimar, hey.

Sən ki, yetdin lülfilə hər şurəzarın qövrinə,
Yet mənim həm dadimə, ey əbri-gövhərbar, hey.

Əkdi, biçdi, hər kimin töxmi-ümidi var idi,
Getdi fürsət, keçdi dövran, dideyi-xunxar, hey.

Yaxşıdır bikəslərin gahi yetişmək halinə,
Qövsiyi-biçarə həm biyardır, qəmxar, hey.

* * *

Gözü könlüm kimi, saqi, sevirəm minanı
Ki, onun cümlədən artıq mənə qaynar qanı.

Ömrlərdir edirəm daneyi-xalın vəsfin,
Mən ki, bir nöqtədə təfsir edirəm Qur`anı.

Eşq bir şö`leyi-oddur ki onun hər şərəri,
Baş verir xərmənimə bərqi-səbükcövlanı.

Gərçi əğyar məhəbbətdən olurlar mane,
İltifat eyləməyib öldürə gör şeytanı.

Dolanıb yanmağa pərvanədən əksik degiləm,
Dolanım başına, qurtar məni-sərgərdanı.

Çəkdi mizanə nəzər, bir səri-mu fərq etməz,
Zülfü xalü xət ilə dinü dilü imanı.

Bülhəvəs tək əsəri-dağ degil sinəmdə,
Yığılar lalə kim bir yerə bağrım qanı.

Qövsi, bu ol qəzəli-nəğzi-Füzulidir kim:
"Yenə dövr etdi pərişan məni—sərgərdanı".

*   *   *

Ta övc tutdu bülbüli-dəstansəra səsi,
Gahi gəlir qulağıma, bir aşina səsi.

Naləm könüllər açdıvü könlüm açılmadı,
Ney üqdəsin haçan açar öz dilgüşa səsi.

Etdi məni dəlik-dəlik ol qəmzə bixəbər,
Çıxmaz gələn zamanda xədəngi-qəza səsi.

Hər kimsə təbli-köçün eşitməz səsin ki, gül
Dari qulaqdır, ona yetməz səba səsi.

Lovsi-qərəzdən arınıban eylə nalə, kim,
Tə`sir edər bu qapıda bimüddəa səsi.

Birdir mənə ki, kölgəsi başımdan aşmasın,
Ol navəkin qıjıltısı bali-hüma səsi.

İxfayi-zari-dil məni rüsvatər etdi kim,
Dil yığmağ ilə artıq ucaldı dəra səsi.

Rəhzən bu yolda Xızr libasında ön verir,
Qövsi, necə təmiz bula rəhnüma səsi.

*   *   *

Qurtar, ey heyrət, bəlayi-vəslü hicrandan məni
Kim, yəman yalquzladı hər biri bir yandan məni.

Canımı tapşırdı ta lə`li-ləbi-can bəxşinə,
Eylədim mə`lum kim, eşqin sevər candan məni.

Ömürlər sərf etmişəm, ta tutmuşam damanını,
Tanrı üçün, ey fələk, ayırma canandan məni.

Tökmək üçün qanımı yerdən gögə minnət qoyar,
Ol güli-rə`na sanırsan qurtarar qandan məni.

Gərçi yoxdur beldə zünnar, əldə təsbihim mənim,
Əhli-mə`ni eyləməzlər fərq Sən`andan məni.

Hüsn, yarəb, bəs degilmi aləmi yandırmağa
Kim, çağırmış eşqi-aləmsuz bir yandan məni.

Dur ver, ey Məcnun, özün insaf kim, mən dinmənəm,
Gər sayırlar eşqdə əvvəl səni, andan məni.

Çətri-əbrü fərşi-səbzə cuşi-gül, nirəngi-mey,
Havlayıblar səngdillər dördlü dörd yandan məni.

Etmək üçün türk nəzmilə müsəxxər aləmi,
Tapdılar ərbabi-mə`ni bilmənəm handan məni.

Bilmənəm kim, yerdəyəm, ya gögdəyəm Qövsi kimi,
Eşq icad eyləmiş xabi-pərişandan məni.

* * *

Bülbül mənim əfğanimə qatlanmadı uçdu,
Yarım gecə qönçə yüxudan durduvü köçdü.

Mən tak tikib mey yerinə xuni-dil içdim.
Sözdür bu ki, hər kisə nə əkri, onu biçdi.

Hicran gecəsi güldü yenə yaşıma, ey vay,
Hərçənd yəman keçdi günüm, şükr ki, keçdi.

Qurtulmadı, yarəb, cigərim qanı, nə sirdir,
Hərçənd ki, göz tökdü əyağə, könül içdi.

Vəsfi-rüxi-gülrəngin onun başladı Qövsi,
Gülzardə bülbül yenə gül dəftərin açdı.

* * *

Kəc təğafül birlə məndən, ey edən şeyda məni
Kim, bu gündə görməsin hiç kafərü tərsa məni.

Zülf tək çulqaşdım ol muyi-miyanın fikrinə,
Saldı bir incə xəyalə bu uzun sevda məni.

Məst olan saqi əlindən şişəni almaq gərək,
Könlümü al kim, yəman aldı bu istiğna məni.

Düşdümü durdum yolunda hər qədər mina kimi,
Bir ayağ toprağinə yetirmədi səhba məni.

Zə`fi-rüzəfzun edər gər böylə pünhan cisimmi,
Sən tək, ey Məcnun, çox istər, az tapar səhra məni.

Qətrəyəm, hərçənd əmma var sənə bir nisbətim,
Nola qurtarsan bu vadilərdə, ey dərya, məni.

Hacılar bayramıdır, sən daxi üşşaqın birin,
Kə`beyi-kuyində qurban etginən, əmma məni.

Çərx yayın çənbər etdim qüvvəti-təslim ilə,
Yüz yıxıldı, durdu, bir yol yıxmadı mina məni.

Ta əyağə başımı yetirmədi, ram olmadı,
Həlqeyi-dam eylədi ol ahuyi-rə`na məni.

Etdi, Qövsi, cövhərim peyda məni ayinə tək,
Hər qədər simab tək bəxt etdi napeyda məni.

* * *

Sən ki saldın çöllərə Məcnun tək, ey Leyla məni,
Qoyma kim, seyd eyləsin hər ahuyi-rə`na məni.

Yüz xəta qılsam, ümidim var könüldən salmasın,
Salsa gözdən yüz gəzər ol nərgisi-şəhla məni.

Axır, ey eşqi-sitəmgər, könlümü verdin ana,
Demədin kim, öldürür zalim bu bipərva məni.

Ta bilibsən kim, sənin cövründən, ey mah, incimədəm,

İncidirsən bu səbəbdən hər nəfəs bica məni.

Qanlı istərtər kəbabı rindlər, meyxarələr,
Çox daxi yandırmagil, ey məsti-bipərva məni.

Var ümidim kim, əlimdən saqiyi-kövsər tuta,
Hər qədər salsa ayaqdan günbədi-mina məni.

Astanından sənin öz astanın istərəm,
Qövsi tək məhcur qoyma böylə, ya mövla, məni.

* * *

Hərçənd heçə satdı isə asiman məni,
Ol Yusifəm ki, bir daxi satmaz alan məni.

Ey, zə`f, varə-varə nihan etmə peykərim
Kim, bir gün axtarar yenə gözdən salan məni.

Ey dəstü tiği tünd, degil mətləbim həyat,
Tanrı üçün, göz açmağa qoy bir zəman məni

Mütrib, yetir ki, məndə fəğan huş qoymadı,
Saqi, yetiş kim, aldı bu sağər yəman məni.

Gəl yengi ildə bir neçə qul başına çevir,
Əvvəl məni, yenə məni, axır həman məni.

Hərçənd kim, sitəmgər isə düşmənin özü,

Bidad edib bu günlərə, yarəb, salan məni,

Hər zəxmi-çeşm həsrət olur özgə zəxm üçün,
Bir ömür butə etsə gər ol şəq kəman məni.

Qövsi, məgər tuta əlimi sahib-əzzəman,
Kim, saldı çox ayaqlara dövri-zəman məni.

* * *

Zəxmi-qəmində ol kəmərin sorma halimi,
Bir muy piçü tabə salıbdır xəyalimi.

Hər nəxl əgərçi başın əgər bərgü bardən,
Bibərgü barlıq mənim əgdi nihalimi.

Eşq atəşində surəti-halim soran mənim,
Gör yar surətini, qiyas eylə halimi.

Gəl, gəl ki, sənsiz, ey güli-rəna, qəfəs kimi,
Sındırdı təngnayi-çəmən şaxü balimi.

Çulqaşmaq istərəm belinə tari-zülf tək,
Sövdaiyəm, görün bu xəyali-məhalimi.

Qövsi, bu vəchdən ki, var ol qaşə nisbətim,
Gərdunun aftabinə vermən hilalimi.

* * *

Etdigin çövri mənə əmdən qılaydın kaş ki,
Öz dilin, ey tifli-dilbilməz, biləydin kaş ki.

Handa kim, mən gəlsəm, ordan sən gedirsən naz ilə,
Mən özümdən getdigim yerdə gələydin kaş ki.

Ağız açıb, açmadın bir dəm gözü könlüm mənim,
Ey gözü könlüm mənim, sən açılaydın kaş ki.

Cövr daim olsa yekdir lütfi-biəncamdan,
Gözləməzsən çün məni, gözdən salaydın kaş ki.

Dustlər yanında ölməkdən betərdir xarlıq,
Könlümi çün almadın, canım alaydın kaş ki.

Ta görəydin kim, nələr hicran gətirmiş başıma,
Ey sitəmkar, getdigin saət gələydin kaş ki.

Cam əlindən çəkmədin, hərçənd çəkdin damənin,
Munca can çəkmək nədir, Qövsi, öləydin kaş ki.

* * *

Üz verəli üzündəki xalü xətin nəzarəsi,
Gözlərimin biri-birə qarışır ağü qarəsi.

Sinəm evi sipənddir, şəm`i-xəyalın ayü gün,
Qanlı dügünlərim anın hər biri bir sitarəsi.

Mən necə yarəb, anlayım qaş ilə göz dilini kim,
Ol sənəmin çəkər məni min yana hər işarəsi.

Min güli-əşk saçdı göz bir güli-vəsl dərmədi,
Oldu bahari-ömrümün laləsi, qanlı parəsi.

Çərx kiminə ayinə, kiminə qarə daşdır,
Kövkəbü mehrü mah anın cövhərivü şərarəsi.

Eşqdə ta mən etmədim sinə sipər bəlalərə,
Daği-çırağı yanmadı, işləmədi sitarəsi.

Qövsiyə çarə, düşmənin daği-nihanın anladın,
Çarə nədir, təbib, əgər bitməli olsa yarəsi.

* * *

İstədim hərgah lə`lin vəslini səhba kimi,
Bağrımı qan eylədin bir al ilə mina kimi.

Nameyi-e`malim əzbəs doldu vəsfi-zülf ilə
Baş çıxarmaz hiç kim andan xəti-tərsa kimi.

Ahənü fuladı od sərkeşligilə yumşadır,
Xubları ram eyləməz yalvarmaq istiğna kimi.

Kimsə sağər tək baş endirməz xəti-fərmanına,
Pakdamənlər ayağın öpməsə mina kimi.

Sinəni çox dağlara qarşı sipər qılmaq gərək,

Ta səninlə ülfət ahular tuta səhra kimi.

Qanı qaynar badə tək ol lə`li-sirabın sənə,
Gər sən odlu kürələrdə qaynasan mina kimi.

Munca hər daşdan daşa seylab tək dəgməz başın,
Gər ayağın yığsan öz damanına dərya kimi.

Yetməyən söz suzinə şurin nə bilsin mə`nisin,
Ağzı şirin eyləməz həlva demək həlva kimi.

Göz yumub açınca gövhərlə tutar dünya üzün,
Hər xəsü xarə təhəmmül eyləyən dərya kimi.

Mən kimi, Qövsi, yetərdi ərşə bülbül naləsi,
Olsa idi şaxi-gül ol qaməti-rə`na kimi.

* * *

Zəncir həlqəsi mənə divanələr kimi,
Yegdir ki xəlq söhbəti fərzanələr kimi.

Zülf ilə kakilindən anın əl götürmənəm,
Yüz yerdə yarsalar cigərim şanələr kimi.

Gər şəm`i-bəzmim olsa daxi sərvi-qamətin,
Taqət gərək dolanmağa pərvanələr kimi.

Zahirdə gərçi olmamışam aşina sənə,
Mə`nidə baxma kəm mənə biganələr kimi.

Hərçənd rəşki-bütkədədir könlü Qövsinin,
Min nəqş yoxdur onda sənəmxanələr kimi.

* * *

Bir zaman al könlümü, ey dildar, başın sədqəsi,
Gəl ki, əldən getdi ol bimar, başın sədqəsi.

Zəf`i-ruzəfzun məni, saqi, zəmingir eylədi,
Tut əlimdən ta ayağın var, başın sədqəsi.

Ol qədər saət ki, çeşmim şəm`ini rövşən qılam,
Durginən, ey atəşinrüxsar, başın sədqəsi.

Bir daxi yaxşı degil yıxmaq fələk yıxmışları,
Bax ayağın altına, ey yar, başın sədqəsi.

Əbri-gövhərbar tək çün sayə saldın başimə,
Keçmə tez, ey tiği-ləngərdar, başın sədqəsi.

Durginən sən bir zəman, sən daxi bir dəm getginən,
Yar, başın sədqəsi, əğyar, başın sədqəsi.

İntizarın çəkmişəm bir ömr, ey heyrət, anın,
Olma bir dəm pərdeyi-didar, başın sədqəsi.

Ey təbib, ol cani-şirin olmaya, dilgir ola,
Eyləmə dərdim ana izhar, başın sədqəsi,

Ol zəman kim, məndən ol sərvi-səhibala ötər,
Çəkmə baş, ey ahi-atəşbar, başın sədqəsi.

Çəksə qeyrət gül ayağından məni səhralərə,
Damənimdən tutginən, ey xar, başın sədqəsi.

Naseha, verməz təsəlli böylə sözlər aşiqə,
Var, başımdan savul, ey biar, başın sədqəsi.

Bir gecə gər olsa, Qövsi, şəm`i-balinin təbib,
Etmə çox təlvasə, ey bimar, başın sədqəsi.

* * *

Xub yetişdin, yaxşı aldın könlümü, ey yar, hey,
Ey dolanım başına, ey nazənin dildar, hey.

Abu-heyvan, ruhi-qüdsi, ya Məsihasən, nəsən,
Hər nəsən, canım fəda olsun sənə, ey yar, hey.

Cavidan yansın çırağı-dövlətin xurşid tək,
Rövşən etdin çeşmimi, ey atəşinrüxsar, hey.

Çəkmədin əbri-baharın minnətin, rəhmət sənə,
Səbz qıldın danəmi, ey bərqi-bizinhar, hey.

Ağız açıb qönçə tək etdin gözü könlüm mənim,
Öz sözün tək aşiqi heç yerdən etdin var, hey.

Bəhri-rəhmət mövcə gəldi, ələtəş bəsdir, könül,
Abi-kövsər başdan aşdı, mürği-atəşxar, hey.

Qanımı mey, bağrımı qan, könlümü etdin kəbab,
Çeşm hey, nəzzarə hey, ey şö`leyi-rüxsar, hey.

Sərvi qıldın paybəndü bülbülü lal eylədin,
Şiveyi-rəftar, hey, ey ləhceyi-göftar, hey.

Gərçi min yol şəmtək öldüm, dirildim şərmdən,
Yaxşı girdin qanıma, ey taqəti-didar, hey.

Fariğ etdin mərgdən Xızrü Məsiha tək məni,
Ey həyati-cavidan sərçeşməsi göftar, hey.

Düst öldürdü məni, ey düşmən, ölmək çağıdır,
Yar yandırdı məni, yan indi, ey əğyar, hey.

Mən unutsam aşiqəm, əmma unutmun siz məni,
Kə`bə hey, bütxanə hey, təsbih hey, zünnar, hey.

Gər sağalmaq könli dərdin, Qövsi, olmaz, olmasın,
Çün təbibin qarşı gəldi, bəsdir, ey bimar, hey.

* * *

Əğyar tutdu çevrəmi, canan, haray, hay,
Aldı bu dərdlər məni, dərman, haray, hay.

Bitab ikən dolanmağa başına Qövsinin,

Saldı ayaqdan məni dövran, haray, hay.

Zinhar ta dilim tutarü gözlərim görər,
Bir dəm yetiş hərayimə, canan, haray, hay.

Ey sərv, həsrət ilə kəman oldu qamətim,
Bir qatla olmadım sənə qurban, haray, hay.

Hicrü xümarü mədrəsə künci əsiriyəm,
Saqivü camü səhni-gülüstan, haray, hay.

Zağü zəğəndən oldu çəmən təng qönçəyə,
Gülbangi-əndəlibi-xoşəlhan, haray, hay.

Kafərdir ol, əgərçi müsəlman uşağıdır,
Tərsa, haray, hay, müsəlman, haray, hay.

Könlüm tutuldu xaki-vətəndən yəman mənim,
Ey məşhədi-qəribi-Xorasan, haray, hay.

Zəngari-qəm göz ayinəsin tutdu Qövsinin,
Ey xaki-sürməxizi-Sifahan, haray, hay.

* * *

İstər gözüm ki, göstərə dildarə könlümi,
Kimdir ki, bir yerə yığa sədparə könlümi.

Nə tabi var vüsalə, nə hicranə taqəti,
Saldı fələk nə odlara biçarə könlümi.

Bilməm ki, harda buldu sənin məst gözlərin,
Meyxanələr səbukeşi avarə könlümi.

Ey şəm, sən ki, məhrəmi-bəzmi-vüsalsən,
Zinhar, bir sifariş ilə yarə könlümi.

İmdad qara günlilərə yaxşıdır , səba,
Ol kakil arasında mənim arə könlümi.

Rəhm eylə, girmə qanına ol qanla dolmuşun,
Ey xal, vermə qəmzeyi-xunxarə könlümi.

Qövsi, şikayət özgə əlindən rəva degil
Kim, saldı öz gözüm mənim odlarə könlümi.

* * *

Bağrımın qönçəsini həsrət ilə qan qılıcı,
Nola gər qanım ilə etsə gül əfşan qılıcı.

Qaralır göz, ürəgim titrərü qanım qaynar,
Ələ qanlı qılıcın çün ala ol qan qılıcı.

Nə rig əbri-bahar olsa, gərək kim eylər,
Qanımın qətrələrin gövhəri-qəltan qılıcı.

Bülbülü gülrəvişi şəbnəmü xurşid kimi,
Dideyi-heyrət olubdur məni heyran qılıcı.

Əməgin eyləmə zaye, özünə rəhm eylə,
Ey mənə rəhm eləyib dərdimə dərman qılıcı.

Ey qoyan bülbüli peyvəstə qəfəs qeydində,
Neçə dilbilməz ilə seyri-gülüstan qılıcı.

Öylə qurban məni kuyində ki bulmaz bu şərəf,
İldə bir qoç-quzunu Kə`bədə qurban qılıcı.

Bənzəməz tiği-zəban zəxmi qılıc yarəsinə,
Yaxar öldürdügüni şəm`i-şəbistan qılıcı.

Hiç iş dəhrdə biməsləhət olmaz, Qövsi,
Etmiş abad cəhanı məni viran qılıcı.

* * *

Əsasi-tövbeyi-mey üstuvar böylə qalırmı,
Bizə müdam südai-xümar böylə qalırmı.

Gəlir bir özgə zəmanə, dönər fələk, dolanar gün,
Rəqibə başərəfi-e`tibar böylə qalırmı.

Şərab nirxinə, ey bağban ki, sirkə satırsan,
Çəmən həmişə baharü bahar böylə qalırmı.

Dönə-dönə içirirsə bəsirət əhlinə qanlar,
Sipəhrə həm bu qərarü mədar böylə qalırmı.

Libasü surətə məğrur olub təğafül edənlər,

Sizə bu dövləti-napaydar böylə qalırmı.

Keçər təğafül edib yar naz ilə sənə, Qövsi,
Keçər bu bir neçə gün, ruzgar böylə qalırmı.

* * *

Gəl öz əlinlə rövşən elə şəm`i-dağımı,
Ey aftab, bir gecə yandır çırağımı.

Həmçeşmlər xəcaləti, saqi, yəman olur,
Mey gər yox isə, qan ilə doldur əyağımı.

Gümnam qıldı bəs ki, məni-xaksarı eşq,
Ənqayi-binişandan alırlar sorağımı.

Çıxmaz nəvayi-çəng kimi pərdədən səsim,
Ustadi-eşq bəs ki, burubdur qulağımı.

Ta dağ qanlı zəxminə kül basdı lalənin,
Rəşk atəşi qavurdu, sızıldatdı dağımı.

Oldu füzun gözüm işığı ahü əşkdən,
Yandırdı qönçə kim yelü su çırağımı.

Sərçeşməyə bulanmağı suyun dəlildir,
Hali-dilim sorunca görün göz bulağımı.

Bir bəzmdə ki, fərq oluna sədrü asitan
Zənciri-zülf bağlaya bilməz ayağımı.

Qövsi, yaxardı misli-qəmi cavidan məni,
Yandırmasaydı misrei-rəngin çırağımı.

* * *

Gər behşitə mail olsam, kuyi-yarım bəs degilmi,
Duzəxə gər qail olsam, intizarım bəs degilmi.

Dəştü kuhə gər cünunum olmadisə rəhnümunum,
Şahidi-suzi-dərunum, ahü zarım bəs degilmi.

İstəsəm bağü bahari, cuybari, laləzari,
Səbzxəttim, sərvqəddim, gül`üzarım bəs degilmi.

Neçə bir namehribanlıq, bivəfalıq, sərgiranlıq,
Gər səzavari-cəfayəm, ruzigarım bəs degilmi.

Şadü fariğ çağlamışsan, kinəmə bel bağlamışsan,
Ey sipəhri-bimürüvvət, mənə yarım bəs degilmi.

Gər anın yanında zarəm, itlər ilə sazkarəm,
Bu qədər kuyində yarın e`tibarım bəs degilmi.

Kam bulmaz söhbətindən, fariğ olmaz möhnətindən,
Qövsiyə əğyar cövri, qəmküsarım, bəs degilmi.

* * *

Fələk kim idi, əgər yar yarım olsaydı,
Nə qəm çəkərdim əgər qəmküsarım olsaydı.

Bu gün ki, eylədi xarü zəlil eşq məni,
Qapunda yaxşı idi e`tibarım olsaydı.

Məni yaxar gecə pərvanə rəşk oduna, vəli
Mənim də bir günümü ruzgarım olsaydı.

Bu il sənə içirirdim nə qanlar, ey bülbül,
Əgər mənim daxi bir novbaharım olsaydı.

Əgərçi rüxsəti-izhar dərdi-dil verməz,
Nolardı gər bu günümdə düçarım olsaydı.

Bir özgə rahü rəviş ixtiyar edərdim mən,
Əlimdə bir-iki gün ixtiyarım olsaydı.

Anın qərarın əlindən alardı təmkinim,
Əgər sipəndcə, Qövsi, qərarım olsaydı.

* * *

Şirin edər ləbin belə xəttin kinayəsi,
Şaninə gögdən endimi ol rəhmət ayəsi.

Məhşər günü şəhidlərə sayə salmanam,
Bir gün məzarım üstə anın düşsə sayəsi.

Ağzın vücudini edər isbat sözlərin,

Var olanın yoxa nə əcəb yetsə vayəsi.

Məcnun cünun binasını gər möhkəm eylədi,
Əmma mənim kəmalim ilə artdı payəsi.

Qövsi gələndə şəm kimi yandın, ağladın,
Gəldi məgər sipahi-cünunin təlayəsi.

* * *

Hər qədər yandın özün, rəşk ilə yandırdın məni,
Ey sipənd, ol şəm`i-məhfildə utandırdın məni.

Bilməz idim kim, bilirsən dərdi-bidərmanımı,
Lütf qıldın, canımı aldın, inandırdın məni.

Etmədin rövşən sərayim bir gecə ol şəm ilə,
Yanəsən, ey əxtəri-tale ki, yandırdın məni.

İmdi dönmək çağıdır ol kəckülahın başına,
Ey fələk, öz başıma bəsdir dolandırdın məni.

Sən ki, ey göz, qılmadın bəxti-siyahim çarəsin,
Lalətək al qanlara neyçün dolandırdın məni.

Tanrı yandırsın çırağın cavidan xurşid tək
Kim, onun bəzmində, ey pərvanə, andırdın məni.

Bir-birindən fərqi yoxdur canu cananın, könül,

Yoxsa söylərdim ki, canımdan usandırdın məni.

Oldu, Qövsi, peykərim bir qətrə su şəbnəm kimi,
Bəs ki, ol xurşidi-məhşərdən utandırdın məni.

* * *

Mənə Məcnun deyən ol ahuyi-rə`nayi görsəydi,
Məni qan ağladan ol nərgisi-şeydayi görsəydi.

Mənə hər daş bağırlı kim, gülər giryan görən saət,
Əlində saqinin cami-meyü minayi-görsəydi.

İlahi, ol büti-nazafərin kim, qan edər bağrım,
Bir özi kimi dilbilməzdən istiğnayi görsəydi.

Mənim göz yumduğum iki cəhanda mən` edən naseh,
Yumub açınca göz kaş ol güli-rə`nayi görsəydi.

Neçə bidərd ilə gül yaprağı tək qavuşan, yarəb,
Gözi şəbnəm kimi yolda məni-tənhayi görsəydi.

Mənim tək ayinə bağlardı min zünnar cövhərdən,
Üzündə həlqə-həlqə ol xəti-tərsayi görsəydi.

Olardı həlqeyi-girdabdən sərgəştətər dərya,
Belində piçü tabi-zülfi-ənbərsayi görsəydi.

Çıxıb səhralərə ahuları ram eyləyən Məcnun,
Bu ahular kəməndində məni-şeydayi görsəydi.

Daxi məhşər günün, Qövsi, gözüm görməzdi heyrətdən,
Qiyamətdə əgər ol qaməti-rə`nayi görsəydi.

* * *

Atəşin rüxsarımın hərcayidir nəzzarəsi,
Bu səbəbdən bülhəvəs ilə yegindir arəsi.

Mən kimi, yarəb, kimin var sən tək atəşparəsi,
Hiç kimin varmı sənin tək mən kimi biçarəsi.

Ey təbibi-bimürüvvət, qoyma mərhəm kim, mənim
Könlümün əgləncəsidir dağü bağrım parəsi.

Raziyəm hərgiz mənə gər etməz isə iltifat,
Kaş yarın düşməsin əğyarə həm nəzzarəsi.

Kimdir ol bibak bağrın qan edən Leylilərin,
Mən kiməm, Məcnun kimi mülki-cünun avarəsi.

Bir fələkdir sinəmü onda xəyalın ayü gün,
Qanlı-qanlı dağlərdir sabitü səyyarəsi.

Xalın axır tazələtdi köhnə dağın Qövsinin,
Ah kim, nasur olur ahuyi-mişkin yarəsi.

* * *

Lütf ilə, ey atəşin rüxsar, ab etdin məni,
Bəs ki, üz verdin, bu üzdən həm kəbab etdin məni.

Bu nə sirdir kim, meyi-gülgun əlindən içmədən,
Ey könül əgləncəsi, saqi, xərab etdin məni.

Karvani-eşq içində zərreyi-gümnam ikən,
Mehr ilən, ey mahi-Kən`an, aftab etdin məni.

Payi-busun həsrətindən ey dolanım başına,
Kakilin tək vari sərfi-piçü tab etdin məni.

Üz yaşırma məndən, ey gənci-məlahət, çünki sən,
Cilveyi-məstanə seylindən xərab etdin məni.

Aldın əldən günbəgün səbrü qərarü tabımı,
Layiqi-zənciri-zülfi-nimtab etdin məni.

Qövsiyi-xəmgəşteyi-sərgəşteyi-avarə tək,
Həlqeyi-girdabi-bəhri-iztirab etdin məni.

* * *

Gedə-gedə aralıqdan götürmüşəm özümi
Ki, xaki-payinə yarın yetirmişəm özümi.

Ölüm bu həsrət ilə, görməyim cəmalın əgər,
Səni görəndə, gözüm nuri, görmüşəm özümi.

Fəğan ki, axtarıram, tapmanam qiyamətədin,

Bu növ kim, məni-heyran itirmişəm özümi.

Gəl imdi et məni-məxmuri bixəbər, saqi
Ki, sən aparmaq üçün mən itirmişəm özümi.

Sözüm özüm kimi gər namülayim olsa nola,
İtirmişəm sözümi, çün itirmişəm özümi.

Vüsul kuyinə mümkün degil xəyal ilə həm,
Düşüb, durub, yügürüb bəs ki, yormuşam özümi.

Yetərmi gərdimə baziçə ilə pərvanə
Ki, mən lövün-lövün odlarə urmuşam özümi.

Ayağ, başin üçün, tutma, ey hərif, mənə
Kim, öz ayağım ilə mən itirmişəm özümi.

Sən indi get rəhi-namüsü nəng tut, Qövsi,
Ki, mən bu mərhələlərdən ötürmüşəm özümi.

* * *

Zəifü zərd elədi rəngi-səbzi-yar məni,
Xəzan müsəvvədəsi etdi novbahar məni.

Tərəhhüm et, səri-kuyinə, ey nəsim, yetir,
Bu gün ki, bir pəri-kah etdi intizar məni.

Gözüm tək öylə cigər qanı ilə mö`tadəm
Ki, düşməsə əlimə, öldürər xümar məni.

Bir-iki gün daxi mehmanınam sənin, saqi,
Rəvamıdır ki, ayaqdan sala xümar məni.

Əgərçi sel aparar gərdü xarü xaşaki,
Qübari-xatir etər çeşmi-əşkbar məni.

Qəbuli-ami-bəladır, nə çarə eylər idim,
Gər etməsəydi fələk xəlqə nagüvar məni.

Bu xaksarlığa razı eyləmiş, Qövsi,
Dənaəti-həvəs, övci-e`tibar məni.

* * *

Hiç yaxmaz öz əlilə sinəmdə şəm`i-dağı,
Yandırdı ol məni kim, yansın anın çırağı.

Bir yol eşitməz ol mah əfğanımı, nə sözdür
Kim, güllərin həmişə bülbüldədir qulağı.

Məğlubi-hüsndür eşq gər Rüstəmi-zəmandır,
Fərhadı çapdı Şirin, Fərhad çapdı dağı.

Xəti-ləşgərinə çox həm üz vermə, ey gözəl kim,
Bir daxi yox onun tək sultani-hüsnə yağı.

Şami-fəraqi-halin hicran təlafisində,
Bir sübhdəm sual et, ey gözlərim çırağı.

Mən eşq vadisində sərgəştə olmayımmı
Kim, bu çölün görünməz hiç bir ucu, bucağı.

Hər kimə dövri-gərdun ya badə verdi, ya xun,
Bir-bir mənim başımda sındırdı boş çanağı.

Aldanma versə gərdun tacü külahi-dövlət
Kim, bu hərif oynar peyvəstə dağı-dağı.

Qəsdinə bir inandır leylü nəhari-aləm,
Hər kim ki, fərq eylər, Qövsi, qaradan ağı.

* * *

Nola ol gül bilsə mən tək binəvalər qədrini
Kim, bilir bimüddəa bimüddəalər qədrini.

Qara daş ilə göhər birdir, xiridar olmasa,
Padşahim, bilginən mən tək gədalər qədrini.

Mən hərifi-durbinəm, kimsə bilməz mən kimi,
Şiveyi-tərzi-təmaşavü ədalər qədrini.

Padşəhlər sərf edərlər sədqə üçün gənclər,
Bilginən, dövlətli sultanım, gədalər qədrini.

Həmnəfəslər qədrini hicran günü məndən sorun,
Düşməyən dəryayə bilməz naxudalər qədrini.

Şəkvə həm bir işvədir eşq əhli üçün, yoxsa kim,
Bilməyən, aşiq degil cövrü cəfalər qədrini.

Nola vaiz dönməyə kuyində itlər başinə,
Ol sözün bilməz nə bilsin aşinalər qədrini.

Xaki-rahindən, gözüm, zöhd əhli eylər ictinab,
Kuri-madərzad bilməz tutiyalər qədrini.

Sərvqədlər eşqinin zövqini məndən qıl sual,
Yeg bilirlər pirlər, Qövsi, əsalər qədrini.

* * *

Təzəllümdən usandım, zülmdən dildar usanmazmı,
Gəfavü cövrdən əğyar usandı, yar usanmazmı.

Usandı badeyi-gülrəngdən meyxanə ovbaşi,
Məgər məzlumlər qanından ol xunxar usanmazmı.

Tutuşdu şəm\`i-könlüm dəmbədəm pərvanə yaxmaqdan,
Bu mə\`nidən məgər ol atəşinrüxsar usanmazmı.

Sipəhri-ahənindil atəşin ahimlə mum oldu,
Sənin könlün sitəmdən axır, ey dildar, usanmazmı.

Çəməndə canə yetdi bağban bülbül nəvasından,
Mənim fəryadü ahimdən məgər əğyar usanmazmı.

Olur axır mükəddər gər həyati-cavidan olsa,

Bu biəncam işdən aşiqi-biar usanmazmı.

Yuxu aləmlərə təlx oldu Qövsinin fəğanından,
Bu aciz naləlikdən, yarəb, ol bimar usanmazmı.

* * *

Könül adlı səba kuyində bir divanə gördünmü,
Onun bəzmində bir bibalü pər pərvanə gördünmü.

İtirdim özümü, hiç kimsə məndən bir xəbər verməz,
Sən, ey ahu, bu səhralərdə bir divanə gördünmü.

Alıbdır baş, veribdir könlümi səhrayə bir ahu,
Sən ey seylab, bizinhar bir seylab gördünmü.

Mənim tək böylə bitabanə hərgiz şəm`ə yandırdın,
Məgər ol şö`leyi-rüxsarı, ey pərvanə, gördünmü.

Yəman düşdün ayaqdan, bilmənəm, Qövsi, sənə noldu,
Məgər ol sərvdən bir cilveyi-məstanə gördünmü.

* * *

Yarəb, kim ola surəti-bican edən məni,
Hər gün bir özgə müinə heyran edən məni.

Seylab tək özi daxi bilməz nə işdədir,
Əzbəs ötər şitab ilə viran edən məni.

Əczami daxi eyləyə bilməz yüz ildə cəm,
Bir göz yumub açınca pərişan edən məni.

Bilməm bu ev sənəmkədə, ya Kə`bədir, nədir
Kim, gözlərimi bağladı qurban edən məni.

Bilmiş ki, hiç əldə daxi tutmanam qərar
Kim, hiçə satdı gövhəri-qəltan edən məni.

Hərgah bilsə hansı çəmən laləzariyəm,
Salmaz ayaqlara cigərim qan edən məni.

Verməz daxi fişar, əgər bilsə bismiləm,
Qövsi, şikari-pənceyi-müjgan edən məni.

* * *

Yıxılmış çünki bir seylabdən viranələr vari,
Bu mə`nidən sevərlər bir-birin divanələr vari.

Məni bir yerdə kim, ol şö`leyi-rüxsar yandırdı,
Mənimçün bircə-bircə yandılar pərvanlər vari.

Sual etmə məni-sərgəştədən Məcnunin əhvalin
Ki, könlümdən fəramuş oldu ol əfsanələr vari.

Necə olsun bərabər arizinlə şəm`i-məhfil kim,
Bu oddan bir şərər həm olmaz atəşxanələr vari.

Verib hərçənd keyfiyyət şərabi-laləRəng, əmma
Gözün bir yanə, saqi, bir yanə meyxanlər vari.

Edərlər eşqdə bülbüllərü pərvanlər də`vi,
Sanırlar özlərini aşina biganələr vari.

Mənim könlümdə həm hiç arzu yoxdurmu, ey dərya
Ki, əbr rəhmətindən gövhər oldu danələr vari.

Nə bağlarsan könül viranəyə, ey cüğdi-qafil kim,
Qonaqdırlar fəna dünyadə sahibxanələr vari.

Könül ol mə`niyi-biganədir agah yanında
Ki, bir surətdir ondan Kə`bələr, bütxanələr vari.

Əgər sərxeyl Məcnundur, vəli piri-cünunəm mən,
Uşaqlar tək mənim ardımcadır divanlər vari.

Sızıldar bir tərəfdə bülbülü bir yanda ney, Qövsi,
Mənim balü pərimdir naleyi-məstanələr vari.

* * *

Böylə gər surətdə barik ol nihal eylər məni,
Zə`fdən hər kim görər mə`ni xəyal eylər məni.

İstərəm hərgah halım söyləyim cananimə,
Bilmənəm, yarəb, nə mə`nidir ki, lal eylər məni.

Hiç aqil öz-özün divanə izhar eyləməz,

Çöllərin sərgəştəsi ol novqəzal eylər məni.

Hər qədər kim, yengi aylar bədr olar xurşiddən,
Ol qədər xurşidi-tabanım hilal eylər məni.

Gözdən ağlar xəlq, əmma mən könüldən ağlaram,
Paymal ol qətreyi-dəryamisal eylər məni.

Sən özün hökm et ki, mən, ey naləfərma, neyləyim,
Xəlqə rüsva naleyi-bie`tidal eylər məni.

Böylə gər sevdayi-zülfün cismim eylər natəvan,
Varə-varə ol kəmər tək bir xəyal eylər məni.

Qönçə tək, bülbül, mənə badi-səba hacət degil
Kim, nəsimi-nalə həm aşüftəhal eylər məni.

Ol qəzəldəndir bu, Qövsi, kim, Füzuli söyləmiş:
"Sayə tək sevdayi-zülfün paymal eylər məni".

* * *

Ey odlu nalə, kuçəvü bazar əmanəti,
Ey ahu-atəşin, dərü divar əmanəti.

Ey hər kimə bir özgə əlac eyləyən təbib,
Can işi səhldir dili-bimar əmanəti.

Gül kimi könli nazik olur binəvalərin,

Ey şaxi-gül, bu mürği-giriftar əmanəti.

Ömrüm nə gündə keçsə  mənim qəm degil, vəli
Ey kambəxş, sübhi-əzəl yar əmanəti.

Məcnuni-eşq ayağını zəncir bağlamaz,
Ey piri-deyr, riştəyi-zünnar əmanəti.

Gülzari-eşq rövzeyi-rizvanə bənzəməz,
Ey bağban, bu bağdə hər xar əmanəti.
Sinəmdə qaldı təşnə əgər, qanlı dağlar,
Ey əbri-novbahar,bu gülzar əmanəti.

Kimdir deyən təbibimə bir özgə rəng ilə
Kim, Qövsiyi-şikəsteyi-bimar əmanəti.

* * *

Eşqində ol pərinin əfsanə olmayımmı,
Zəncir üzməyimmi, divanə olmayımmı.

Öz rütbəsincə hər kim zillət çəkər cəhanda,
Mən gənci-rayiganəm, viranə olmayımmı.

Mən özgədən, özümdən, öz könlümü gözümdən,
Ol aşinadən ötrü biganə olmayımmı.

Ol cilvə salmasınmı bir gün məni ayaqdan,
Bir böylə seyl önündə viranə olmayımmı.

Ey gülbüni-nəzakət, hərçənd bülbüləm mən,
Sən şəm`i-məhfil olsan, pərvanə olmayımmı.

Çöllərdə varmayımmı Məcnun ilə sərasər,
Divanəyəm, onunla həmxanə olmayımmı.

Leylalənir ol ahu tədric birlə, Qövsi,
Mən daxi varə-varə divanə olmayımmı.

* * *

Natəvanlıqlar məni, saqi, zəmingir eylədi,
Dideyi-heyran məni həmçeşmi-təsvir eylədi.

Can nisar etməkdə təqsir etmin, ey üşşaq kim,
Yetmədi məqsudinə hər kim ki, təqsir eylədi.

Sökdi peykan tək cigəraghim mənim hər kiprigi,
Ol kəmanəbru nigahin çün mənə tir eylədi.

Ayü gün tək hüsn mə`nisin sən etdin aşkar,
Gərçi hər Yusif onu bir rəng tə`bir eylədi.

Gah zülfün piçü tabim verdi, gahi kakilin,
Eşq bir divanəni yüz yerdə zəncir eylədi.

Mən mükərrər canımı cananıma tapşırmağa,
Eylədim iqbal, əmma bəxt təqsir eylədi.

Mən bərabər bilmənəm, toprağilə öz qanımı,
Xuni-dil toprağımı hərçənd iksir eylədi,

Çox mənə, ey sərvi-xoşqamət, rüunət satma kim,
Çoxları Qövsi tək ol rə`na igit pir eylədi.

* * *

Könül, ol sərvi-səbükseyr xüraman oldu,
Müjdə, ey kəştiyi-təslim ki, tufan oldu.

Aləmi-nurdan icad olalı sübhi-vüsal,
Yığılıb zülməti-aləm şəbi-hicran oldu.

Dili-bitabə əzəldən bu gümanım yox idi,
Varə-varə bu şərər atəşi-suzan oldu.

Məndə yoxdur könül, ey didə ki, sən gördüyün ev,
Tapdı bir rəxnəvü tədricilə viran oldu.

Bu degil məshəfi-övraq ki, şirazə edim
Cəm olmaz dəxi hər dil ki, pərişan oldu.

Dəhənin nisbəti heç qönçəyə, ey dil, yoxdur,
Qönçə hər xarilə açıldıvü xəndan oldu.

Girdi əbr altına xurşid üzün şərmindən,
Gözümün nuri kimi pərdəydə pünhan oldu.

Dəmi-şəmşir ilə açıldı tutulmuş könlüm,

Şükr-lillah mənə ol qönçə gülüstan oldu.

Vəslinə təşnətər oldu səni gördükcə gözüm,
Badə ol kaseyi-varunda dönüb qan oldu.

Hansı dağın mən edib şükrini hansı dil ilə
Ki, anın hər biri bir dərdimə dərman oldu.

Məndə məscid kimi təklifü təvazö yoxdur,
Oldu ev sahibi hər kim, mənə mehman oldu.

Odlara, közlərə, Qövsi, su səpirkən saqi,
Yetişincə mənə bir atəşi-suzan oldu.

*   *   *

Dilər bütxanəni tərsavü istər Kə`bəni hacı,
Səri-kuyindir, ey rə`na, dili-bitab me`racı.

Deməz hiç kimsəyə hərçənd eşq anlar dilin hüsnün,
Bəli, pərvanələrdir şəm`i-bəzməfruz dilmacı.

Çanağ ilə verir hərçənd könlüm qan, gözüm doymaz,
Müsəlmanlar, iraq olsun, bəladır qonşunun acı.

Nə rə`na qamətin vardır ki, iqbalın bülənd olsun,
Nə şirindir sözün, saqi ki, ağzın olmasın acı.

Həman istər ki, başın astanın daşinə qoysun,
Əgər qəndil ərşi-ə`zəm olsa aşiqin tacı.

Dəmi-ruhülqüds, ya abi-heyvan qeyrə ərzani
Ki, bimarın sənin olmaz Məsihü Xızr möhtacı.

Məni bülbül görəndə qönçə tək xamuş gülşəndə,
Nola gər etməsə iqbal kim, tox tanımaz acı.

Nə yaxşı söyləmiş, Qövsi, Vəhidi-aləmi-mə`ni:
"Nigahi-biməhabadır dili-bitab dilmacı".

* * *

Qədrini bildim sənin, ey dil, nisar etdim səni,
Aləmin varü yoxundan ixtiyar etdim səni.

Səndə yandırdım, könül, öz mətləbimcə dağlar,
Ey zəmini-sadə, axır laləzar etdim səni.

Başladım bir nalə, ey gərdun, səni məhv eylədim,
Axır, ey dəryayi-atəş, bir şərar etdim səni.

Sən həman məğrursan, ey nəfs, atəşsən, nəsən,
Ta əlimdən gəldi, zalim, xaksar etdim səni.

Ta eşitdi naləmi ol şaxi-gül bülbül kimi,
Nalə ilə, ey xəzan, fəsli-xəzan etdim səni.

Sən həman gövhər nisar etdin mənim toprağimə,
Hər qədər, ey əbri-rəhmət, şö`ləbar etdim səni.

Qövsi, asdım yayini taqi-büləndi-çərxdən,
Ta əsiri-guşeyi-əbruyi-yar etdim səni.

* * *

Aparmaz hiç kim əldən məni dildardən qeyri,
Özümdən özgə nəm var, ya kimim var, yardən qeyri.

Əgər tiksəm könül bağında yüz min nəxli-baravər,
Biri səbz olmaz ol sərvi-səbükrəftardən qeyri.

Nə ərz eylərsən, ey pərvanə, şəm`i-məclisəfruzə,
Məni kim yandırar ol atəşinrüxsardən qeyri.

Nə bizinharsan, ey dərdi-bidərmani-hicran kim,
Eşitməz kimsə məndən hiç söz zinhardən qeyri.

Şəbi-hicran mənim hərçənd dağım var, çırağım var,
Çırağım yandıran yox ahi-atəşbardən qeyri.

Bu bir həmdərd əlindən canə yetdim, ah, neylərdim,
Əgər bir kimsəm olsaydı dili-bimardən qeyri.

Dolanmaq başına pərvanələr tək yanmağü ölmək,
Əlimdən vari mümkündür gələ gövtardən qeyri.

Mənimlə kuhkən dağlarda gər həmkardır, əmma
Həmavazım bulunmaz seyl tək kuhsardən qeyri.

Bəladır özgəni həmxanə görmək yar ilən, Qövsi,

Bihəmdüllah, gözü könlümdə yoxdur yardən qeyri.

* * *

Olmayınca şərhə-şərhə qanlı bağrım gül kimi,
Hiç kim tutmaz qulaq əfğanına bülbül kimi.

Qoy dolanım başına, ey səngdil, kakül kimi,
Sən ki, çərxi-piçü tab etdin məni sünbül kimi.

Yaxşı Məcnunlar görübdür könlüm, ey Leyla, mənim,
Olmaq olmaz aləmi-insafdə bu çöl kim.

Ötsə salik badi-sərsərdən yetişməz mənzilə,
Hər ayaq altında pamal olmayınca yol kimi.

Axtarıb xurşidi-rüxsarın nəsimi-ah ilə,
Xərmənin gərduni-xunxarin savurdum kül kimi.

Öylə könlüm seyri-çeşm etmiş məni-dəryakəşi
Kim, gəlir dəryayi-əxzər çeşmimə bir gül kimi.

Gərçi zənciri-cünun Məcnun ayağın bağladı,
Olmaz əmma Qövsini zəncir edən kakül kimi.

* * *

Aşiqəm, aləmdə bir aşiq bulunmaz mən kimi,
Çünki surət bağlamaz mə`nidə bir büt sən kimi.

Emənəm əndişə çərxi-səngdildən, çün mənim,
Tə`nə daşımdan gögərmiş peykərim cövşən kimi.

Dustsən, ey düst, əmma çeşmi-xunxarın sənin,
Tiği-müjganilə doğrar bağrımı düşmən kimi.

Çərx urar başban-başa hərçənd fəryad eylərəm,
Qarlı dağlar içrə seylab eyləyən şivən kimi.

Gərçi könlüm badbanü sinə qan dəryasıdır,
Hər həvadən bir yana meyl eyləməz yelkən kimi.

Gər sən iqbal etsən, ey Yüsif, iraqlıqdan, nə qəm,
Öz işin işlər məhəbbət buyi-pirahən kimi.

Qoymadın əldən inanım, ta dolanım başına.
Dustlər hərgiz yol urmazlar, gözüm, düşmən kimi.

Boynum olmuş qıl kimi, yarəb, neçün zəncirdən,
Çünki incitməz bu ahən bəndi-pirahən kimi.

Pərdeyi-çeşmidə aram etsə ol xurşidvəş,
Bəs ki məhv olmuş könül, görməz gözüm rovzən kimi.

Olma bir dəm çərx ilə, ey tiri-ahim, rubəru
Kim, üzü ol dilsiyahin bərkdir ahən kimi.

Mən daxi bir nalə imdad eylərəm bülbüllərə,
Tirədil kəc nəğmələr lal olsalar susən kimi.

Qövsi, ol rə`na qəzalidir Füzulinin bu kim:
"Gəh əl öpmək astin tək, gəh ayaq damən kimi".

* * *

Əritdi bağrımı həsrət nəzarə, hay, haray,
Haray, hay təbəssüm, işarə, hay, haray.

Yetişdi saqiyi-nazafərin yəman sərxoş,
Kəbab olan cigəri-parə-parə, hay, haray.

Yanıb sipənd, məni rəşk dağı yandırdı,
Nə rahət ilə yatıbsan sitarə, hay, haray.

Anın kimi ki, alırlar arayə bimarı,
Əhatə etdi məni dərd, çarə, hay, haray.

Yetişdi bir neçə pərvanənin hərayinə şəm,
Mənim də xərmənimə bir şərarə, hay, haray.

Mənim səfinəmə girdabi-dilnişin oldu,
Bu bəhrdən yetişənlər kənarə, hay, haray.

Fəğan ki, olmaz imiş hiç vəch ilən, Qövsi,
Əlaci-naleyi-biixtiyar, hay, haray.

* * *

Fələkpeymalığı, ey Nuh, tufan məndən ögrəndi,

Giran ləngərligi dəryayi-ümman məndən ögrəndi.

Mənim hər müşt xakim seyr edər bir özgə aləmdə,
Bu sərgərdanlığı gərduni-gərdan məndən ögrəndi.

Girib bütxanəyə asan degil zünnarə qurşanmaq,
Dua təkbiri var kim, piri-Sən`an məndən ögrəndi.

Şəbi-tarikdən rəngi-küdurət bağlamaz könlüm
Ki, seyqəlgərligi xurşidi-rəxşan məndən ögrəndi.

Pərü balim görənlər qönçələnmiş sənsiz, ey novgül,
Nə bilsinlər ki, gül çaki-giriban məndən ögrəndi.

Mənə yol başlayan gülzarə, ey sərvi-rəvan sənsiz,
Nə bilsin kim, səba rahi-gülüstan məndən ögrəndi.

Qədi-xəmgəştə ilə nola gər olsam ələm, Qövsi
Ki, öz namü nişanın taqi-nisyan məndən ögrəndi.

* * *

Kənar tutmağı divanə məndən ögrəndi,
Yanıb dolanmağı pərvanə məndən ögrəndi.

Tərанə satma mənə, ey sipənd kim, bülbül,
Nəvayi-naleyi-məstanə məndən ögrəndi.

Əgərçi çərxi-zəmingir qıldı toprağım,
Sipəhr cilveyi-məstanə məndən ögrəndi.

Qəmi-nihanimi zinhar, dustlər, sormun
Ki, gənc hifzini viranə məndən ögrəndi.

Fəğan ki, başına bir yol dolanmadım, saqi,
Əgərçi gərdişi peymanə məndən ögrəndi.

Füsun yetər, yeri başımdan, əl götür, naseh
Ki, yüz sənin kimi əfsanə məndən ögrəndi.

Mənə nəsihət edən zöhd əhli həm, Qövsi,
Təmiz məscidü meyxanə məndən ögrəndi.

* * *

Rüunət şaxi-gül, ey sərvi-bala, səndən ögrəndi,
Xüram, ey nazənin, ahuyi-rə`na səndən ögrəndi.

Mənə bimar çeşmin sədqəsiçün bir nigah eylə
Ki, dərman etməgi yüz min Məsiha səndən ögrəndi.

Nə yüzdəndir məni gül qönçəsi tək bizəban qoyma
Ki, bülbül naləni, ey naləfərma, səndən ögrəndi.

Mənim tək şəm`siz pərvanədən pərtöv diriğ etmə
Ki, seyrü dövri-mahi-aləmara səndən ögrəndi.

Bu surətxanədə gər mə`niyi-biganədir, Qövsi,
Vəfadə aşinalıq rəsmin əmma səndən ögrəndi.

*   *   *

Könül, gər ömri-cavidan dilərsən, yar yetməzmi,
Bahari-bixəzan istərsən, ol rüxsar yetməzmi.

Nə lazım lalə tək xuni-dil içmək, dağ yandırmaq,
Sənə ol abü rəngü şö`leyi-rüxsar yetməzmi.

Qərəz gər cami-malamaldan bihüş düşməkdir,
Nigahi-nimməsti-saqiyi-xunxar yetməzmi.

Əgər bülbül kimi əldən-ayaqdan getmək istərsən,
Nə hacət şaxi-gül, ol sərvi-xoşrəftar yetməzmi.

Büti-Çin bəndəpərvərlik təriqin məndən ögrəndi,
Bu sözdə şahidi-halim özi dildar yetməzmi.

Yəman toz basmış, ey viranə, rüxsarın, nədir halın,
Məgər zinharına seylabi-bizinhar yetməzmi.

Gül ilən cuş urarsan, daxi, ey bülbül, nə sızlarsan,
Qulaq verməzmi gül fəryadına, gülzar yetməzmi.

Təbü tabim mənim, faş etməgə, ey dil, nə sızlarsan,
Ləbi-təbxalə çuşü ahi-atəşbar yetməzmi.

Əgər həqdən göz örtüb qətlimi inkar edər qaşın,
Təbibim, çeşmi-məstin etdigi iqrar yetməzmi.

Desəm pərvanəyəm, Qövsi, degilmi şahidim halim,
Desəm şəm`əm, güvahim dideyi-xunxar yetməzmi.

* * *

Zahid gərək bu gün görə ol sərvi-qaməti,
Hər bibəsir ki, danla inanmaz qiyaməti.

Nolur ki, şərhi-hüsnə ola dil vərəq-vərəq,
Qur`anda səbtdir məhi-Kən`an hekayəti.

Hər dəm bir özgə şaxi-gülün xarü zar edər,
Bülbül məzacinin yox imiş istiqaməti.

Gəlməz giran fəğanim ana bilsə yar əgər
Kim, şükrdür libasdə aşiq şikayəti.

Min sərvnaz nazi anın qamətindədir,
Vardır yüzündə yüz güli-rə`na nəzakəti.

Gülbangi-əndəlib alır əldən inan, vəli
Bəndindədir nəvayi-neyin huş qarəti.

Mən başladım ilan sözi tək kakilin sözin,
Hərçənd bilmişəm ki, bulunmaz nəhayəti.

Tovfiqi-nalə ver mənə, yarəb ki, sə`bdir,
Zağü zəğən şəmaməti, bülbül xəcaləti.

Qövsi, əgərçi cani-mühəqqər zəifdir,

Bidərd, kimsə böyləmi saxlar əmanəti.

* * *

Ey ki, hicranında aramü qərarım qalmadı,
Gəl ki, səbrim getdi əldən, ixtiyarım qalmadı.

Əql başdan, könlüm əldən getdi, canım cismdən,
Neylədim, yarəb ki, əsbabi-nisarım qalmadı.

Sən yetir kuyinə yarın bir avuc toprağımı,
Ey nəsimi-nalə, səndən qeyri yarım qalmadı.

Meyvə üçün nəxli eylərlər uşaqlar səngsar,
Saxla, ey gərdun əlim kim, bərgü barım qalmadı.

Qaniq almazsan gözüm meyxanələrdən şükr kim,
Gərdişi-çeşminlə məst oldum, xümarım qalmadı.

Gözlərim çox çəkdi xaki-payinə həsrət, vəli
Canımı tapşırdım axır, intizarım qalmadı.

Varə-varə getdi əldən, düşdü dildən, ah kim,
Qövsidən hiç bir əsər, ey gül`üzarım qalmadı.

* * *

İkidir gərçi pəriçöhrələrin göftarı,
Bir imiş bunların iqrarı ilə inkarı.

Fikr tə`mirə könül bağlamayan viranə,
Çəkməz əndişə əgər sel aparır me`marı.

Qəfəsi guşeyi-cənnət bilir ol bülbül kim,
Doludur səbzeyi-biganə ilə gülzarı.

Şəbü ruzum nola yeksan ola bir mülkdə kim,
İmtiyaz olmaya yarından anın əğyarı.

Bizə tuş gəlmədi bir Yüsifi-pakizəgöhər,
Ömrlərdir ki, əbəs bəkləmişiz bazarı.

Dərdi–dil şərhinə bir dərd bilən yar gərək,
Çün səvad əhli bulunmaz, nə açım tumarı.

Qövsi, bu ol ki, Füzuli demiş öz halinə kim:
“Müştəri yox, necə bir bəkləyəlim bazarı”.

* * *

Ey xoş ol günlər ki, könlüm tək hisarım var idi,
Əqli-hərcayi kimi darül-qərarım var idi.

Ey xoş ol günlər ki, bir namüsü arım var idi,
Əqlü huşü səbrü aramü qərarım var idi.

Ərz qıl məndən səgi-kuyinə sananın, səba
Kim, mənim həm onda bir gün e`tibarım var idi.

Var idi xuni-dil içməklərdə səbrim, taqətim,
Hər qədər dərya idim, əmma kənarım var idi.

Şişeyi-çərx ol meyi-pürzurə dözməz, ah kim,
Saqiyi-bidil sanır kim, ixtiyarım var idi.

Ey cünun, yoxdurmu qeyrət səndə, nəng olsun sənə,
Əql əlində bir günüm, bir ruzigarım var idi.

Yandı suzi-sinədən köksümdə bir-bir ahlər,
Getdi ol günlər ki, ahi-şöləbarım var idi.

Yollar üstə bəs ki, pamal olmuşam, hiç olmuşam.
Hanı ol günlər ki, bir avuc qübarım var idi.

Şaxü balım noldu, Qövsi, yarəb, ol günlər hanı
Kim, nihali-dərd idim, min bərgü barım var idi.

* * *

Mənim şuxi-sitəmkarım təğafüldən usanmazmı,
Fəramüş olmayan yarım məni bir qatla anmazmı.

Meyi-gülfam içən məhvəş, edən azar, dərdi kəş,
Şərabi-safiyi-biqəş məgər bir gün bulanmazmı.

Hərayimdən sipehri-dun, tökər əncüm gözündən xun,
Usandı cövrdən gərdun, hənuz ol mah usanmazmı.

Təbibi-fariğülbalim ki, sındırmış pərü balim,

Mənim bilməzmi əhvalim, desəm, yarəb, inanmazmı.

Dilindən bülbüli-zarın rəvadır vəsfi gülzarın
Görəndə arizin yarın yüzi-yüzdən utanmazmı.

Gəlib ol sərvi-naz ötdi, dili-bitabi məhv etdi,
Qiyamət gəldüvü getdi, bu qafil hiç oyanmazmı.

Nədir təqsirim, ey kafir, sözü neyrəng, özü sahir,
Bu Qövsi başına axir dolanarmı, dolanmazmı.

* * *

Hicabi-şö`leyi-rüxsarın etdi ab məni,
Fəğan ki, pərdədə yandırdı aftab məni.

Hənuz kakili-pürtabin olmamışdı kəmənd
Kim, etdi muyi-miyan sərfi-piçü tab məni.

Mənə zərur degil şö`lə-şö`lə od, saqi
Ki, mən kəbab oluram, etməsin kəbab məni.

Nəsimi-nalə ki, arambəxşi-aşiqdir,
Qılır səfineyi-dəryayi-iztirab məni.

Fəğan ki, itmiş ikən yaxşılar arasında,
Qəmi-zəmanə yəman qıldı inticab məni.

Səni görəndə sənə yaxşımı deyər, nə deyər,

Görən bu rəng ilə, ey xanəman, xərab məni.

Çəməndə qətreyi-şəbnəmdən əskigəm, Qövsi,
Yerindədir ki, salır gözdən aftab məni.

* * *

Ümmidvar qılmış ikən bərgü bər məni,
Cuşi-bahar eylədi zirü zəbər məni.

Yüz yerdə yardı bağrımı almasi-imtəhan,
Ol gün ki, etdi xazini-hikmətgöhər məni.

Nalәm yetirdi göylərə cisim qübarini,
Ahü fəğan ki, etdi əsər biəsər məni.

Saqi, əyağa qanımı gər tökmək istəsən,
Bari şərabi-nab ilə et bixəbər məni.

Bir ömr ona kəbabi-sərəncam vermişəm,
Sərxoş gözün hənuz sanır bicigər məni.

Aşiqdə əqlü huş gərəkdir nisar üçün,
Çox daxi etmə bixəbər, ey bixəbər məni.

Dövri-zəmanü gərdişi-əflak neyləsin,
Qövsi, salıbdır öz nəzərim dərbədər məni.

* * *

Təbibim bir zəman, yarəb, məni-bimarə yetsəydi,
Bu möhlik dərd əlində ölməmişkən çarə yetsəydi.

Bu oddan kim məni pərvanə tək yandırdı, ey bülbül,
Nolaydı bir şərər ol şəm`i-gülrüxsarə yetsəydi.

Yanardı ömrlər, hərçənd bibakü sitəmgərdir,
Əgər əhvalimin bir şəmməsi dildarə yetsəydi.

Mənimçün qan içərdi, gərçi daşdır bağrı minanın,
Xümarım sərgüzəşti saqiyi-xünxarə yetsəydi.

Onu ya namə, ya peyğam ilə agah edərdim mən,
Əgər badi-səba ol sərvi-xoşrəftarə yetsəydi.

Edərdim cür`əti-izharü dərdü nalə başlardım,
Gər ol bidadgər suz qövr edib zinharə yetsəydi.

Dili-sədparəmin hər parəsin bir daşə çalmazdı,
Əgər fəryadıma ol səngdil bir parə yetsəydi.

Mənə rəhm eyləyib əhvalıma ağlardı qan, Qövsi,
Fəğanım ol firəngi-kafəri-xunxarə yetsəydi.

* * *

Məndə yoxdur hiç can, olsaydı yüz can kaş ki,
Hər birin bir rəngilə alsaydı canan kaş ki.

Razıyam yansın vücudi-bivücudim xərməni,
Ötməsin biiltifat ol bərqi-cövlan kaş ki.

Gər xümaralud qalsam, qalmasam mən, səhldir,
Saqiya, dönsün sənin rə`yinlə dövran kaş ki.

Xatirin cəm oldu, ta oldum pərişan xatirin,
Olmasın, yarəb, sənin könlün pərişan kaş ki.

Olsa gər könlüm evi viran, təbibim, qəm degil,
Qalmasın dərdin sənin bixanü biman kaş ki.

Ta olaydım bəlkə öz kamimcə pamalın sənin,
Xaki-rah olsaydım, ey sərvi-xüraman, kaş ki.

Hər nə ki, sən istəməzsən, istəməz könlüm mənim,
İstəsəydin dinü dil, ey namüsəlman, kaş ki.

Düşdüm ol gün kim, sənin zənciri-zülfün qeydinə,
Yarəb, olsaydım əsiri-kafəristan kaş ki.

Sinəmə gər düşsə yüz min rəxnə, üz döndərmənəm,
Dönməsin peykanın, ey bərgəştə müjgan kaş ki.

Ol zəman kim, var idi cismində bir can Qövsinin,
Ey kəmanəbrusinə olsaydı qurban kaş ki.

* * *

Bülbül mənim harayimə yetsəydi kaş ki,

Yüz qanlı yarəmin biri bitsəydi kaş ki.

Bir qönçə ilə ömrüm ötər əndəlib tək,
Bir əhli-dil hərayim eşitsəydi kaş ki.

Ləbtəşnə danəmi mənim əbri-şərərfəşan,
Yarəb, bu sərzəmində unutsaydı kaş ki.

Yalquz salıb məni gözü könlümdən ol pəri,
Getmiş özi, xəyali də getsəydi kaş ki.

Naqis ümiddən yeg olur naümidlik,
Sərriştə çün bulunmadı, itsəydi kaş ki.

Bibərgü barlıq mənim əgdi nihalimi,
Əyyami-novbahar tez ötsəydi kaş ki.

Hərçənd anlamaz dilini kimsə Qövsinin,
İzhari-dərd üçün dili tutsaydı kaş ki.

* * *

Səbr eylə aqibət mey olur qan dedikləri,
Sübhi-vüsal olur şəbi-hicran dedikləri.

Ta mən eşitmədim, dili-bitabə bilmədim
Kim, gənc imiş libasdə viran dedikləri.

Ərşi-bərin qübarın onun tutiya qılır,
Hərçənd müşti-xakdir insan dedikləri.

Bişur sanma aşiq əgər aramidədir
Kim, qönçədir bu qətrədə tufan dedikləri.

Lə`lində camü badə kimi cəm`dir sənin,
Abi-həyatü atəşi-suzan dedikləri.

Bəzm içrə başladın yenə bir odlu nalə kim,
Pərvanələndi şəm`i-şəbistan dedikləri.

Qövsi, gərək ki, Kə`bə deyib iqtida qıla,
Təbriz qülləsinə Sifahan dedikləri.

* * *

Ömrlərdir seydi navək xürdiyəm, səyyad, hey,
Nimbismil qoyma, başınçün məni, cəllad, hey.

Nəqşimi kəm tutma, dadımdan mənim göz yumma kim,
Mən hərifi-pakbazəm, sadəyəm, nərrad, hey.

Bimürüvvət, bihəqiqət yar əlindən, dustlər,
Ahü fəryadü fəğan hey, dad hey, bidad hey.

Əşki-şur ilə əbəs təlx eyləmə əyyamini,
Xublərdən kami-Şirin olmaz, ey Fərhad, hey.

Hər qədər, Qövsi, fəğanü naləvü ah eylərəm,
Hiç kim yetməz mənim fəryadimə, fəryad hey.

*  *  *

Əgər sən böylə bəklərsən bu rüxsar ilə bazarı,
Xəridaranə Yusif axtarır, tapmaz xəridarı.

Tutum kim, anlamazsan, dərd, ya dərman əsirgərsən,
Gəlib bir xoş dil ilə sorginən barı bu bimarı.

Daxi məhşər günü görməz gözi tüğyani-heyrətdən,
Mənim çeşmimlə hər kim görsə ol ayinərüxsarı.

Onun bəzmində həm biintəhasız intizarım var,
Gözüm əzbəs ki, adət eyləmiş axtarmağa yarı.

Çəmən seyrinə əzm etmişmi ol gül pirəhən, yarəb
Ki, bülbül naləden qan ağladır əbri-göhərbarı.

Ana bir göz yumunca canını verdim, gərçi müşkildir,
Bəli, asan edər tovfiq iqbal etsə, düşvarı.

Mənə ol səngdil rəhm etmədi, hərçənd mən, Qövsi,
Gətirdim nalədən seylab tək fəryadə kuhsarı.

*  *  *

Aqibət yavuncıdır yüz min dil ilə dil məni,
Axır ol bidərdə yalvardar bu layəqil məni.

Qanı çıxmaz zəxmimin yüz xəncəri-bidad ilə,

Həsrət ilə bəs ki, qan ağlatdın, ey qatil, məni.

Bəs ki, yadin pərdeyi-heyrət çəkibdir çeşmimə,
Ah kim, səndən yavuqdur eyləyə qafil məni.

Bəhri-rəhmət seyli-əşki-laləgun bəndindədir,
Etmə ondan binəsib, ey çeşmi-dəryadil, məni.

Ah kim, bihasiləm hərçənd bərgü bar üçün,
Etdi dehqani-əzəl məşğuli-abü gil məni.

Tişeyi-Fərhad tək xəm buldu, Qövsi, qamətim,
Bəs ki, daşdan-daşə çaldı çərxi-səngindil məni.

* * *

Gözüm çırağısan, ağlatma zar-zar məni
Ki, yollar üstə çox ağlatdı intizar məni.

İmami-şəhrə uyub e`tiqad etməz ikən,
Fəğan ki, eşq firəng ilə etdi yar məni.

Boyun bəlasın alım, gündə bir xüram mənə
Qərar ver özünə, eylə biqərar məni.

Qübarı-rahinilə rövşən oldu didələrim,
Yetirdi mənzili-məqsudə intizar məni.

Sənin xəyalin ilə çox unutmuşam özümü,

Unutma guşeyi-üzlətdə zinhar məni.

Fəğan ki, zər kimi rəngim saraldı həsrətdən,
Hənuz ayağına yar eyləməz nisar məni.

Qaşın hilalinə Qövsi tək uymuşam ta mən,
Xəmidə qədd ilə taq etdi ruzgar məni.

* * *

Nə getdin əldən-ayaqdan, dili-fikarım, hey,
Sənə nə oldu, mənim külli-ixtiyarım, hey.

Bəlavü möhnətə hərçənd mən səzavarəm,
Vəli mədəd günüdür dövri-ruzigarım, hey.

Məni hərarəti-xurşidi-eşq yandırdı,
Sitadəlik çağıdır, əbri-novbaharım, hey.

Mənim peyamımı, ey peyk, əşki-yarə yetir
Ki, intizar yetər, çeşmi-intizarım, hey.

Məni bu hal ilə gör, kimsəyə könül vermə,
Qərarü səbrim alan səbrimü qərarım, hey.

Anın əlacını etməzsən, ey təbib, əmma,
Deyə-deyə qalasan Qövsiyi-fikarım, hey.

* * *

Keçmə məndən, saqiya, sərvi-rəvanın sədqəsi,
Çəkmə başımdan əyağın, asitanın sədqəsi.

Görginən çeşmin zəkatı rəngimi, əhvalimi,
Var isə rəhmin, mənə rəhm eylə, canın sədqəsi.

Aşiyansız quşların əhvalinə, ey bağban,
Gah-gahi iltifat et, xanəmanın sədqəsi.

Xəstədil, biçarə, bibərgü nəva bülbülləri,
Yad edib an bir gül ilə, gülsitanın sədqəsi.

Ötmə qafil, qafil olma piçü tabimdən mənim,
Üzmə canım riştəsin, muyi-miyanın sədqəsi.

Bizəbanlardan sual etməkdə təqsir eyləmə,
Ol ləbi-canbəxşdən, şirin zəbanın sədqəsi.

Çox məni, Qövsi, anın yanında rüsvay eyləmə,
Olma biaram, ol arami-canın sədqəsi.

* * *

Eylədi sərgəştə Məcnundan betər səhra məni.
Hiç fərqim yoxdur ondan, ha onu gör, ha məni.

Vəh ki, sərgərdan edib başımdakı sevda məni,
Eylədi pərgar tək kuyində pabərca məni.

Ey büti-xunxar, neyçün tanımazsan sən hənuz
Kim, bilir bu şəhrdə hər kafərü tərsa məni.

Başına dönməkdə bitabəm, nədir tədbir kim,
Eyləmiş sərgəştə ol kakildəki sevda məni.

Zülfi-zəncir ilə yüz yerdən dili-sədparəmi,
Bir yerə yığdın, pərişan eylədin əmma məni.

Böylə kim, aləmdə binamü nişanəm, dustlər,
Gər mən itsəm zə`fdən, kimdir qılan peyda məni.

Bibəsirətlər xəridar axtarırkən dəhrdə,
Aldı məndən hiçə, Qövsi, yari-bipərva məni.

* * *

Çeşmi-məstin hiç kimdə dinü iman qoymadı,
Dəhrdə ol namüsəlman bir müsəlman qoymadı.

Məndə canan, dustlər, dil qoymadı, can qoymadı,
Gah əgər rəhm üstə canan gəldi, dövran qoymadı.

Vəsl, yarəb, ta nola kim, və`deyi-didar ilə,
Arzu könlümdə ol sərvi-xüraman qoymadı.

Gəh təğafül, gah ülfət, hər zəman bir rəng ilə,
Hansı gün ol namüsəlman bağrıma qan qoymadı.

Könlümü ol sahiri-tərdəsti-nirəngafərin,

Gündə yüz yol yıxdı, əmma yapdı, viran qoymadı.

Varə-varə yığdı yüz yandan dili-sədparəmi,
Kakilin sərgəştələr cəm`in pərişan qoymadı.

Qövsiyə iqbal et, ey kim, əbri-ehsanın sənin,
Kimsəni aləmdə toprağilə yeksan qoymadı.

* * *

Nola gər lütf eyləyib sormazsa bir gün halımı
Kim, özümdən yeg bilir canan mənim əhvalımı.

Öyləyəm kim, Leyli etməz bir-birindən imtiyaz,
Çəksələr bir səfhədə Məcnun ilə timsalımı.

Ey güli-rə`na, mənə sənsiz nədir tədbir kim,
Təngnayi-gülsitan sındırdı şaxü balımı.

Gər yanarsa odlara pərvanə, şəm ilən yanar,
Yanaram mən şəm`sizlikdən, görün əhvalımı.

Tab vermiş mubəmu əzbəs ki, çərxi-pir ona,
Gər yüz il çəksin, üzülməz rişteyi-amalımı.

Can nisar etməkdə tə`xir olsa, fürsət gözlərəm,
Məndə yoxdur səbr, sanmın səbrdən ehmalımı.

Sanma, Qövsi, qövlimi kirdarsız, tə`sirsiz
Kim, tutarlar əhli-dil hal ilə yeksan qalımı.

* * *

Əlindən canə yetdim könlümün, dildar yetməzmi,
Bu viran olmuşun imdadinə me`mar yetməzmi.

Güvahi-hal üçün çıxmazsa peykanın cərahətdən,
Mənim qətlimdə çeşmtn etdigi iqrar yetməzmi.

Hənuz insaf edib cövrü cəfadən əl götürməzsən,
Bu hamı etdigin, ey çərxi-kəcrəftar, yetməzmi.

Bu gün məndən saralmış rəngimin vəchin soran qafil,
Əgər bina isən, ol şö`leyi-rüxsar yetməzmi.

Nə lazım hər yetən bidərdə, ey göz, dərd izharı,
Əgər həmdərd istərsən, dili-bimar yetməzmi.

Bu hamı bö`d ilə zinharə gəldi çərxi-səngindil.
Sənə fəryadım, ey xunxarı-bizinhar, yetməzmi,

Tutubsan yengi başdan eşqdə Məcnun yolun, Qövsi,
Sənə bir ömr ol bazicə, ey biar, yetməzmi.

* * *

Bahar əyyamı əbr dudi-ahim şö`ləbar etdi,
Nəsimi-nalə çeşmim püdi tarin tarümar etdi.

Fələkdən bəs ki, etdim dəmbədəm bica şikayətlər,
Məni bir kafəri-birəhmə, ol zalim düçar etdi.

Neçün üşşaqə ol gül pirəhən lütf eyləməz, yarəb
Ki, gül bülbüllərə gülşəndə öz nəqdin nisar etdi.

Fəğan kim, eşqini bazicə sanmışkən anın başdan,
Məhəbbət varə-varə qətrəni seyli-bahar etdi.

Mənimçün qanlı bağrı dağ olub əbri-göhərbarın,
Cəhanı sərbəsər göz yaşı ilə laləzar etdi.

Kəsin, ey Kə`bəru yoldaşlər, məndən rəfaqət kim,
Bu çöllərdə məni bir ahuyi-rə`na şikar etdi.

Deyirdim kim, bahar əyyamı, Qövsi, açılar könlüm,
Fəğan kim, bülbülün fəryadı bir dərdi həzar etdi.

* * *

Nə xoşdur, nə xüruş bahardır, hey, hey.
Nə yaxşı il, nə gözəl ruzgardır, hey, hey.

Cəhanı eylədi sirabi-əşk gülgunim,
Nə didədir, bu nə əbri-bahardır, hey, hey.

Nə gül, nə səbzə, nə abü həva, nə bülbüldür,
Nə nalədir, nə simi-bahardır, hey, hey.

Arayə aldı məni çar mövcə dörd yandan,

Buna hənuz deyirlər kənardır, hey, hey.

Yavuqdur eləyə meyli-şərab zahidi-xüşk,
Nə abü tablı əbri-bahardır, hey, hey.

Əgərçi mən tələbində ayaqdan düşdüm,
Vəli gələn öz ayağilə yardır, hey, hey.

Sipəhr saxlaya bilməz anın önin, Qövsi,
Nə odlu naleyi-biixtiyardır, hey, hey.

* * *

Başım üstündən, təbibim, getmə canın, sədqəsi,
Üzmə canım riştəsi, muyi-miyanın sədqəsi.

Ta ayaqdan salmamışdır zə`fi-ruzəfzun məni,
Qoy dolanım başına, sərvi-rəvanın sədqəsi.

Balü pərsiz, aşiyansız əndəlibəm, bağban,
Çox da məndən qafil olma, xanəmanın sədqəsi.

Anginən bir dəsteyi-gül birlə öz bimarini,
Bağü bostanın zəkatı, gülsitanın sədqəsi.

Guşeyi-üzlətdə gümnamın fəramuş eyləmə,
İsmü rəsmü şöhrətü namü nişanın sədqəsi.

Hər nə etsən könlüm ilə, eylə kim, mən qılmışam,

Ol bir avuc qanı xaki-asitanın sədqəsi.

Eydi-qurban gəldi, sən həm nimbəsmil Qövsini,
Kə`beyi-kuyində qurban eylə, canın sədqəsi.

* * *

Rişteyi-canım mənim muyi-miyandır doğrusi,
Piçü tab ol riştədə arami-candır doğrusi.

Ey məni sərməstü bipərva görən, rəşk eyləyən,
Badeyi-gülgun degil camimdə, qandır doğrusi.

Dəmbədəm qeyrətdən, ey həmçeşmlər, hicran günü,
Eylərəm izhari-tab, əmma yalandır doğrusi.

Gərçi yüz dərü bəla avlağıdır kuyin sənin,
Aşiqi-bitab üçün darüləmandır doğrusi.

Qeyr tək zahirdə mən həm tutmuşam üz Kə`bəyə,
Qibleyi-ərbabi-dil ol asitandır doğrusi.

Bir-birindən aləmi-surətdə gər biganədir,
Kəbəvü bütxanə, zahid, tovəmandir doğrusi.

Xublər eşqində, Qövsi, dərdi-sər çoxdur, vəli
Yaxşıdan qət`i-nəzər qılmaq yəmandır doğrusi.

* * *

Mənə mümkün degil məqal dili,
Ah, əgər olsa idi hal dili.

Pərdəyə məhrəm olmayan nə bilir
Ki, nə dildir neyin bu lal dili.

Məhv olub vəsfin etməgə qaşın,
Nola gər lal ola hilal dili.

Gərçi sehr olsa, eyləməz tə`sir,
Hiyləvü şidü məkrü al dili.

Etməz izhar razi-kamili-eşq,
Leyk qəmmaz olar kəmal dili.

Bərgi-güldür özü dil anlayana,
Əndəlibi-şikəstəbal dili.

Biri yüz dil bilir, vəli birdir,
Qaş ilə göz, xət ilə xal dili.

Dilinə afərin edərdi əgər,
Qönçənin olmasaydı lal dili.

Surətin mə`ni etginən yarəb,
Qövsiyə dil ver, ondan al dili.

* * *

Nola, yarəb, əgər gələ sevdigim, silə əşki-şərarə fəşanımı
Görə rəngimi, sora hailmi, verə dərdini, ala canımı.

Nə xocəstə məkan ola ol məkan ki, yetincə şövq təmam ilə,
Ura damin belə qatilim, çəkə tiğini, tökə qanımı.

Gözilə həlakiyəm ol qaşın, necə bir gözün, necə bir qaşın,
Ata bülhəvəslərə navəkin, dələ bağrımı, tuta yanımı,

Qədi-pürxəm ilə nəfəs-nəfəs alıram bəlasını qamətin,
Ola kim baharə bədəl edə bu nihali-tazə xəzanımı.

Nə çıxar səsi, nə rəvan olar, elə bəs ki, heyrət edər durar,
Görər olsa seyli-bahar onun yolu üstə əşki-rəvanımı,

Sənə ahü naləsi aşiqin əsər eyləməz, əsirin olum,
Kimə yalvarım, kimə əzc edim, sənə verdi eşqin inanımı.

Həvəsində qaşın hilalının mənəm ol qapundakı Qövsi kim,
Yorular qolu, bükülər beli, çəkər olsa sipəhr kəmanımı.

* * *

Bəs ki, sərməst etdi vəsl əyyamı dövranın məni,
Saqiya, mən bixəbər, yandırdı hicranın məni.

Gündə min söz eylərəm məşqü vəli yetcək sənə,
Bir söz ilə aldadır çeşmi-süxəndanın məni.

Hər həvadən bir həvayi-tazə saldı başıma,

Eylədi axır şərabi əbri-ehsanın məni.

Gün çıxıb, aləm görür tək xoş çıxartdı pərdədən
Axır, ey gülpirəhən, çaki-giribanın məni.

Sən də daşdan–daşə çalma kim, urubdur ömrlər,
Sayə tək yerdən-yerə sərvi-xüramanın məni.

Bilmənəm məqbulü mərdud olduğun dağım ki, eşq
Başına çevrilməmişkən etdi qurbanın məni.

Cəm olur dörd yanıma əhbab bəs kim, şəm tək,
Güldürürkən ağladır gülbərgi-xəndanın məni.

Afəti-candır bəlayi, xanəmandır, bad dəst,
Gəh yığar, gəh dağıdar zülfi-pərişanın məni.

Qaşların yanına sən kim, sədqə etdin Qövsini,
Eylədi başın sədqəsi, zinhar qurbanın məni.

* * *

Ağlamaqda şəm tək hərçənd ehmal olmadı,
Rəngi-zərdim əşki-gülgun kimi həm al olmadı.

Oldu ondan aqibət rəngin nigarın əllərin,
Şükr kim, gər qanımı tökdünsə, pamal olmadı.

Eşq qeydi var aləmlərcə, əmma dəhrdə,
Hiç kim aşiqdən özgə fariqülbal olmadı.

Təxtü tacə baş əgərmi himmətim kim, fəqrdə
Ətləsi-gərdun ki, derlərdi mənə şal olmadı.

Şəm tək xamuş isəm bəzmində heyrətdən, nola
Kim səni ol çöhrə ilə gördü kim, lal olmadı.

Türk nəzmi, farsi ləfzi ilə sözlər söylədim,
Ah kim, bir şəmmə, Qövsi, şərhi-əhval olmadı.

* * *

Ol kəbabım kim, məni yandırmamış köz qalmadı,
Zəxmi-xunəfşanimə sərf olmamış duz qalmadı.

Ahulər Məcnun ilə ram oldular, fəryad kim,
Kimsə bu çöllərdə məndən qeyri yalquz qalmadı.

Ərzi-hal etmək dilərdim, ah kim yetgəc, təbib,
Dərdlər bir-bir fəramuş olduvü söz qalmadı.

Ta sən, ey xurşidi-taban, rövşən etdin yer üzün,
Düşdi gərdunin gözindən, kögdə ulduz qalmadı.

Eşq başdan qalibi-əfsurdəmi xak eylədi,
Varə-varə öylə bərbad etdi kim, toz qalmadı.

Bəs ki, bitəqrib sənsiz nalə çəkdim, ağladım,
Məndə, ey göz mərdümi, göz qalmadı, söz qalmadı.

Gah vəslindən, təbibim, gəh xəyalindən sənin,
Hiç yerdə Qövsiyi-dilxəstə yalquz qalmadı.

* * *

Kəbab ikən məni, saqi, xümar yandırdı,
Qavurdı bağrımı hicr, intizar yandırdı.

Nəfəs-nəfəs nə yəman, yanmağa mühəyyayəm
Ki, lalə tək məni badi-bahar yandırdı.

Fəğan ki, dözməz ikən iztirabə vəsl günü,
Fəraq odunda məni intizar yandırdı.

Mürur ilə nola nasur ola ki, dağ üstə,
Bu tazə daği-xəti-müşkbar yandırdı.

Dedim sipənddən öz könlümin nişatin alım,
Yanə-yanə məni ol biqərar yandırdı.

Fəğan ki, tövbəm evin iztirab edib bərbad,
Qalanca, hövsələmi intizar yandırdı.

Füruği-hüsni-cəhansuz eşq odundandır,
Ki, gül çırağını, Qövsi, həzar yandırdı.

* * *

## TƏRKİBBƏNDLƏR

### 1

Ey vay ki, əldən gedərəm yar gəlincə,
Dildən düşərəm, başimə dildar gəlincə.
Fəryad ki, seylabi-səbükseyri-həvadis,
Dağıtdı məni üstümə memar gəlincə.
Pərvanə kimi günlərim əzbəs ki, qaradır,

Ömrüm yetər əncamə şəbi-tar gəlincə.
Yarəb, bu qədər yol ki, məni zə`f aparıbdır,
Gəlsəydi təbibim məni-bimar gəlincə.
Güllər düşəcəkdir gözümə xuni-cigərdən,
Gül seyrinə ol, novgüli-bixar gəlincə.
Torpağımı hicran odu bərbad edəcəkdir,
Bir gün yol azıb əbri-göhərbar gəlincə.
Əfsus ki, həsrət məni əldən alacaqdır,
Bazarıma ol aricə dinar gəlincə.
Hərçənd ki, heyrət məni dildən salacaqdır,
Ol nuşləbü ayineyi-ruxsar gəlincə.
Fəryad edərəm, kimsə əgər dadıma yetsə,
Naləm səbəbin sorsavü fəryadıma yetsə.

Ol naşi təbibin ələ düşməzsə dəvası,
Bəsdir mənə, yüz mən kimiyə dərdü bəlası.
Sövdayi edibdir, məni sərgəştə qılıbdır,
Başımdakı ol kakili-pürtab havası.
Hansı üz ilən arizinə qarşı durum kim,
Gün güzgüsü həm olmaz onun ruynüması.
Yarəb, bu nə qəddir, bu nə rəftar kim, olmuş
Hər cilvəsi yüz aşiqi-bitab bəhası.
Ol şaxi-gülün yadi ilə ah edərəm mən,
Çün övc tutar bülbüli-bibərg nəvası.
Meydir ləbi, əmma bu meyin nəşəsi cavid,
Güldür üzü, əmma bu gülün var bəqası.
Gər baxmasa əhvalıma canan, nə sözüm var,
Kim mən kimi çoxdur səri-kuyində gədası.
Kiyində əgər əşkilə ahim belə artar,
Gər bağü baharın bu isə abü həvası:

Ey hay ki, bülbül yenə nalan olacaqdır,
Aləm hamı bir qit`ə gülüstan olacaqdır.

Nola mənə gər verməsə xəmyazə baharım,
Kim nəşə verir badeyi-şirazə baharım.
Aşiq gözünə qaməti-rəna işin işlər,
Bəs kim, gətirər sərv ağacın nazə baharim.
Gül nüsxəsi tək balu pərim oldu pərişan,
Ta qönçə kimi eyləyə şirazə baharim.
Bir qönçələbin bülbülüyəm mən, əcəb olmaz,
Gəl adımı gül dəftərinə yazə baharim.
Mən qanda bu viranədə, ol qanda məgər kim,
Nagah səbatək yolunu azə baharim.
Sanman mənəm ahəng tutan kim, gətiribdir
Məcnuni-zəifin sümüyün sazə baharim.
Mən bilmənəm əhvalımı, hər rəngilə bilsə,
Ərz eyləsin ol novgüli-tənnazə baharim.
Hərçənd deyir aşiqi-bitab dilindən,
Bülbül təhi-dildən deyir, ey tazə baharim:
Yüz böylə çəmən qönçeyi-xəndanına qurban,
Min şaxi-gül ol sərvi-xüramanına qurban.

Ey ayinəru, aşiqi-heyranə nəzər qıl,
Xəndan ləb ilə giryeyi-giryanə nəzər qıl.
Sən kim meyi-gülrəngə gözüm razı degilsən,
Camimdə mənim başin üçün qanə nəzər qıl.
Hər nemətə bir şükr gərək, qılma təğafül,
Bir özünə bax, bir dəxi dörd yanə nəzər qıl.

Sor halımı, amma əlinə ayinə həm al,

Gör dərdi-dilim, zülfi-pərişanə nəzər qıl.
Gülşəndə qədin yadı ilə naləm eşitsən,
Başinə dönüm, sərvi-xüramanə nəzər qıl.
Bülbül kimi gül yüz lövün odlarə düşübdür,
Öz arizinə baxma, gülüstanə nəzər qıl.
Ey kövhəri-qəltan, gözü könlümdə məqam et,
Gör qətreyi-sərgəştəni, ümmanə nəzər qıl.
Ta rövşən ola daği-mükafat nə oddur,
Pərvanə ilə şəm`i-şəbistanə nəzər qıl.
Yandırma mənim canımı, öz canına rəhm et,
Su səp oduma, şəm`i-şəbistanına rəhm et.

Qurbanım olum, Qövsiyi-məhcur sənindir,
Şirin söz ilə xəlqə salan şur sənindir,
Aşiq ki, zəif olsa, onu yazıya salma,
Hərçənd Süleyman olasan, mur sənindir.
Məst olsamü dursam, dolanıb başına dönsəm,
Təqsirimə qalma, meyi-pürzur sənindir.
Gər öldürər olsan, əgər əhya edər olsan,
Öz istədiyin eylə ki, dəstur sənindir.
Yadınla gözüm mərdümüdür qətreyi-əşkim,
Gər var çırağımda mənim nur, sənindir.
Ey gənci-rəvan, guşeyi-bituşədən ötmə,
Kəlgil ki, bu gəncineyi-gəncur sənindir.
Hərçənd ki, hər guşədə, hər bağda, ey gül,
Bülbül mənəmü qönçeyi-məstur sənindir.
Mən eyləmənəm tərzi-təmənna, sözüm anla,
Dindirmə məni, dilsizəm, amma sözüm anla.

## 2

Əyyami-bahar oldu, fəğan başladı bülbül,
Bir növ` ki, gülbanginə məhv oldu onun gül.
Qəm kişvəri könlüm kimi zirü zəbər olmuş,
Ta oldu tərəb ləşkərinə səbzə qaravul.
Gər əbri-kərəm böylə yağar səbzələr üstə,
Seylabə gedər xarü xəsü səbrü təhəmmül.
Mina kimi qaldırdı ələm şaxi-gül, əmma.
Qəlbinə salır tövbənin ol rəngi-təzəlzül.
Kim naleyi-məstaneyi-mütrib əsərindən,
Yüz yerdən edər qönçeyi-sirab qədəh gül.
Bir böylə bahar ayı ki, həngami-tərəbdir—
Saqi, dolanım başinə, ey bəhri-təğafül,
Sən badeyi-gülrəng yetir, ta xəbərim var
Kim huş aparır kakili-müşkin kimi sünbül:
Pəh-pəh, bu nə bağü bu nə gülşən, bu nə güldür
Kim, şəbnəmi göz, qönçeyi-sirabi könüldür.

Səhba qızarır gül kimi sünbüllərə qarşı,
Sünbül gögərir səbzə kimi güllərə qarşı.
İsar üçün açmış girehin qönçeyi-pürzər
Kim, ərzi-təhəmmül qıla bülbüllərə qarşı.
Rəşk atəşi dağ etdi məni, lalə sifət kim,
Nərgis neçün açmış gözünü yollara qarşı.
Ol gül məni gər qönçə kimi salmasa dildən,

Görmək gərək ahəngimi bülbüllərə qarşı.
Meyxanə yolun başladılar el, sanasan kim,
Pərvaz qılırlar sonalar göllərə qarşı.
Saqi, dolanım başına, ey şuxi-sitəmkər,
Gör iczü niyazim bu təğafüllərə qarşı.
Dur, lalə kimi qoymaya gör əldən ayağı
Kim yeg görünür sağəri-mey güllərə qarşı:
Pəh-pəh, bu nə abü bu nə tabü nə çəməndir
Kim, xari onun gül, xəsü xaşaki səməndir.
Ey hüsnü firəngi, ərəbi xalları hindu,
Rəftarı dilara, özi nazik, qədi dilcu.
Yarəb, bu nə navək, bu nə müjgani-rəsadır,
Vəh bu nə kamandır, bu nə əbru, bu nə bazu?
Sərgəştə qılıbdır məni ol dəsteyi-kakil,
Girdabə salıbdır məni ol həlqeyi-geysu.
Məcnun ilə Fərhad mənim girdimə yetməz,
Ey ləbləri Şirin, sözü Leyli, gözü ahu.
Ol çeşmi-siyəhməst mənim əqlim apardı,
Məzurəm əgər eyləmişəm cam ilə yekru.
Hərçənd ki, cami-meyü gül huşrübadır,
Saqi, dolanım başına, ey gözləri ahu.
Əmma necə əhvalimi səndən yaşırım kim,
Divanə edibdir məni ol nərgisi-cadu.
Pəh-pəh, bu nə sahir, bu nə nərgis, bu nə gözdür
Kim, hər müjəsi bir dilü nəzzarəsi sözdür.

Yarəb, nola gər dərdimi cananə desinlər,
Əhvalimi ol zülfi-pərişanə desinlər.
Sərkəştəligi vəsfini bir muri-zəifin,
Ərdabi-kərəm nola Süleymanə desinlər.

Ol Leyliyə qurban oluram mən təhi-dildən,
Qoy bir neçə bitəh mənə divanə desinlər.
Pərvanələr ögrəndi dönüb yanmağı məndən,
Razı deiyləm kim, mənə pərvanə desinlər.
Onlar ki, deyirlər bu nə fəryadü fəğandır,
Barı bu sözü ol güli-xəndanə desinlər.
Saqi, dolanım başına, ey hövsələ düşmən,
Ta el sənə gəncü mənə viranə desinlər.
Hər yerdə ola tut meyü qoy zahidü vaiz
Deyrü hərəmü məscidü, meyxanə desinlər.
Pəh-pəh,bu nə məhfil, bu nə meyxanə, nə meydir
Kim, abidi mütribdir onun, vaizi neydir.

Gülzardə yüz min dil ilə bülbüli-xoşxan
Təkrar qılır midhəti-nəvvab Zaman xan.
Gəncüri-hünərdir, xirədü məxzəni-daniş,
Dəryayi-kərəm, bəhri-səxa, mənbəyi-ehsan.
Xülqi-həsəni bəzm günü əbri-göhərbar,
Mövci-qəzəbi rəzm günü atəşi-suzan.
Vəsfindən onun acizəm, əmma diləram kim,
Ta dair ola daireyi-aləmi-imkan.
Öz istədigincə ola ol ərş cənabın,
Seyri-fələkü dövri-zaman, gərdişi dövran.
Hərçənd tünük hövsələvü məstü xümarəm,
Saqi, dolanım başına, ey sərvi-xüraman.
Öz başin üçün dur bir əyağ ilə əlim tut,
Kim əldən apardı məni ol mürği-xoşəlhan:
Pəh-pəh, bu nə bülbül, bu nə əfğan, nə nəvadır,
Kim şəddi dubaladır onun, məddi rəsadır.

Ey kim, utanır çərx sənin şanını görgəc,
Keyvan əgilir rif`əti-eyvanını görgəc.
Gər tövsəni-gərdun səbükseyr yegindir,
Heyrətdə qalır sahəti-meydanını görgəc.
Gizlənsə əgər bəhr hübab içrə rəvadır,
Dəryayi-mühit gər kəfi-ehsanını görgəc.
Od tutsa səba girdi-rəhindən əcəb olmaz
Kim bərq ərir atəşi-cövlanını görgəc.
Kimdir ki meyü saqiyü səhba həvəs etməz,
Eyşü tərəbü bəzmini, dövranını görgəc.
Saqi, dolanım başına, ey məsti-güzarə,
Hərçənd ötərsən məni-nalanını görgəc.
Əmma məni gör kim, nə qədər getsə ayağım,
Əldən gedərəm sərvi-xüramanımı görgəc.
Pəh-pəh, nə gözəl sərvi-rəvandır, bu nə qəddir,
Kim, sayəsi candır, səməri ömri, əbəddir.

Hərçənd siyəh məstdir ol nərgisi-şəhla,
Kəsməz nəzərin Qövsiyi-kəmzərfdən əmma?
Ayineyi-sirabın açar hüsn niqabın,
Gər təşneyi-eşq abi-həyat etsə təmənna,
Fəryad ki, bir vadiyə düşmüş güzərim kim,
Şurindən onun qönçələnir qətreyi-dərya.
Yarəb, bu nə aləm, nə tərəşşöh, nə həvadır,
Bilməm bu nə məhfil, bu nə meydir, bu nə mina.
Yüz şükr kim, etmiş nəzəri-saqiyi-kövsər
Tovfiq müyəssər bizə əsbab mühəyya.
Bir yarü kababü meyi-gülgünü mənü sən

Saqi, dolanım başına, ey ahuyi-rəna.
Bir böylə gözəl fəsl ki, ləbrizi-cünundur
Gəl başin üçün, gəl tutalım daməni səhra:
Pəh-pəh, bu nə səhra, bu nə firdovsi-bərindir
Kim avı bəşər, avçıları ahuyi-Çindir.

* * *

## TƏRCİBƏNDLƏR

---

### 1

Ey hay kim, açıldı yenə ey həzar, gül,

Çeşmi-tərimdən eylədi əbri-bahar gül.
Əzbəs ki, abü tab ilə ləbrizdir çəmən
Sanmın qərib əgər ola hər növki-xar gül
Gər lalə-lalə göz yaşıma baxmasan nola,
Kim öz-özün ayağinə eylər nisar gül.
Şəbnəm tək üz yaşırmaq üçün nə`li oddadır,
Bəs kim üzündən oldu sənin şərmsar gül.
Ta olmuşam xəyalinə, ey rəşki-novbahar,
Ta məhvəm abu renginə, ey abdar gül.
Eylərmi qönçətək məni bidar əndəlib,
Bülbül kimi qılırmı məni biqərar gül.
Dövri-fələk bu sür`ət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Gül birlə etdi aləmi ləbrizi-zər bahar,
Hər bağ küncün eylədi gənci-gönər bahar.
Abi-rəvani eylədi simin şükufədən,
Torpağı qıldı səbzə ilə müşktər bahar.
Bidəstü pa qoyarmı məni ol nigar kim,
Gül bərgin etdi bülbül üçün balü pər bahar.
Ol gül`üzarə qarşı məgər könlüm açıla,
Verməz təsəlli aşiqi-bitabə hər bahar.
Məhvi-nəzarə olsa gözüm eyb görmə kim,
Ondan mənə xəbər verir, ey bixəbər, bahar,
Vaiz, yetər fəsanə ki, ta fərşdir çəmən,
Mütrüb, çox etmə nalə ki, ta cuş urar bahar.
Dövri-fələk bu sür`ət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Hər kim ki, ol sitəmkər ilə yar edər məni,

Əhya verə mənə, yox ikən var edər məni.
Şərmi-nəzareyi-güli-ruyin nəfəs-nəfəs
Gəl gör nə abü rəngli gülzar edər məni.
Bəs kim çəməndə yadin ilə əşk tökmüşəm
Hər gül xəyali-əbri-göhərbar edər məni.
Hərgah bir göz açmağa ahəng edər könül,
Heyrəngi-tazə surəti-divar edər məni.
Ayinətək sərasər bazari-dəhrdə
Heyrət bu hamı şüğl ilə bikar edər məni.
Əbri-baharü naleyi-bülbül, nəsimi-sübh
Hərçənd ləhzə-ləhzə xəbərdar elər məni.
Dövri-fələk bu sür`ət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Üşşaqə vaizini nəfəsindən nə faidə?
Mənzildə karvan cərəsindən nə faidə?
İki cahanda zahidə çün mey həram imiş,
Cənnət həvasinin həvəsindən nə faidə?
Naseh müdam tövbəyə tərğib edər məni,
Yarəb, ona bu mültəməsindən nə faidə?
Bikardır bədən dili-pürşur olmasa,
Çün əndəlib yox, qəfəsindən nə faidə?
Zülfün nə lazım eyləyə zəncir könlümü,
Ol seydi-bəsməlin mərəsindən nə faidə?
Ey həmsəfər, mənim kimi bir tiflməşrəbə,
Bidərdə təbli-köç səsindən nə faidə?
Dövri-fələk bu sür`ət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

Saqi, gətir şərab, içəlim hay-hay ilən,

Keçsin baharımız necə bir ahü vay ilən.
Öz sinəm etmişəm sipərü qarşı durmuşam,
Bir gözləri hərami ilən, qaşı yay ilən.
Üşşaq gün görərmi bu dövrənda kim, çıxar
Ol aftab gah il ilən, gah ay ilən.
Bir əhli-dil bilir nə çəkər didədən könül,
Kim qonşu olmuş ola gözü ac gəda ilən.
Baxmazsan əşki-alimə, ey səngdil ki, mən
Dəryayə rəxnə salmışam ol qanlı çay ilən.
Mətləb məni oyatmaq isə, bir usanginən
Ağrıtma xəlq başini, Qövsi, haray ilən.
Dövri-fələk bu sür`ət ilə nənnidir mənə,
Seylab naləsi tənəna-tənnidir mənə.

**2**

Zahid, dolu camimdəki ləbriz səfadır,
Dürdi-meyi-gülrəng deyil, abi-bəqadır.
Təsbihimi, zünnarımı gizlətmənəm eldən
Kim, tərki-riya aləmi-mənidə riyadır.
Şəbnəm kimi bir gün gözün aç, gör bu çəməndə
Ömr öylə ötər kim, sanasan badi-səbadır.
Ərz etdi təbibi-dili-bimarə mükərrər,
Əhvalimi saqivü dedi: badə dəvadır.
Gülşəndə ki, hər lalə dolu sağərə bənzər
Kafər, necə məxmur gəzim, gör nə həvadır!
Hərçənd şəbi-cüm`ə gərək taətə məxsus,
Hərçənd ki, adına günü ruzi-duadır:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,

Öz başin üçün qoymaya gör əldən əyağı!

Saqi ki, yegin qəddü rəsa qaməti vardır,
Ol qaməti-rənayə görə himməti vardır.
Hərçənd ləbin hər kimi öldürsə dirildir,
Öldürmədə üşşaqi əcəb rəğbəti vardır.
Əşkim göhərin badə kimi tökmə əyağə,
Ey zalım, onun qədrini bil, qiyməti vardır.

Hər bitəhü bidərd könül qədrini bilməz,
Al saxla bu yaquti ki, xasiyyəti vardır.
Sinəmdə könül badeyi-gülrəngçün oynar,
Qan içməyə hərçənd onun adəti vardır.
Hərçənd deyirlər ramazan ayı yavuqdur,
Hərçənd ki, mahi-rəcəbin hörməti vardır:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Əzbəs ki, bu məhfildə fəğan eylədi mütrib,
Ayinəmizi abi-rəvan eylədi mütrib.
Bəzm əhlini yandırdı, sızıldatdı, qavurdu,
Yaxşı oxudu, leyk yəman eylədi mütrib.
Ömr etsinü pir olsunü tapsın məzəyi-ömr
Kim, pirləi vari cavan eylədi mütrib.
Bir rəng təmam etdi səmaiyi-rəvani
Kim, cismimizi ruhi-rəvan eylədi mütrib.
Mən həm elə ahəng ilə fəryad elədim kim,
Yavıncıdı, yalvardı, aman eylədi mütrib.
Çün nəğmeyi-tər etdi vücudum bir avuc su,
Çün nalə ilə bağrımı qan eylədi mütrib.

Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ta könlümü asan aparub müşkülə saldın,
Dildən məni saldın, məni dildən-dilə saldın.
Saqi, dolu minani, məni-xanəxərabi
Neyrəngilə sındırdın, ayaqdan belə saldın.
Əglənmiş ikən rövzeyi-rizvan arasında,
Yarəb, nədən ötrü məni abu gilə saldın.
Yüz həlqə edib zülfi-pərişanını çin-çin,
Bir həlqə ilə boynuma bir silsilə saldın.
Ol badəni kim, əqlimi başdan aparıbdır,
Sundun mənə, mən sadədili işgilə saldın.
Hərçənd tünük hövsələyəm bəzmi-bəladə,
Hərçənd ayaqdan məni bir cam ilə saldın:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ol bağda ki, eylədi Mirzə onu zahir,
Mirza ki, onun həqq ləqəbin eylədi Tahir.
Ol bağda kim, ayineyi-dövr nümadır,
Firdövs onunla ola rif`ətdə nə qadir.
Təsvir edə bilməz onu yüz rəng ilə Mani,
Təqlid edə bilməz onu neyrəng ilə sahir.
Heç fərqi onun rövzeyi-rizvanilə yoxdur,
Ol cənnəti-qaibdirü bu cənnəti-hazır.
Dünyadə bu rif`ətdə məqam kim eşidibdir
Kim, aləmi-mənzur olavü aləmə nazir.
Bir vəqtdə ki, əbri-bahar ola göhərbar,
Ol bağdə kim, badə çəkər möminü kafir:

Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ol bağdə kim, eylədi Təbrizi gülüstan,
Ol bağ ki, bir guşəsidir rövzeyi-rizvan.
Bir həddi Səhənd olmuş, o bir həddi Urumi,
İki yanı Sürxabdır ol kuhi-Bədəxşan.
Fəvvarələri çeşmeyi-xurşidə tökər su,
Dəryaçələri rəşkilə dəryayə verir qan.
Minayi-meyü laləvü xaşxaşü şəqaiq,
Bir rəng bular etdilər ol baği çırağan.
Kim, pərtövi-xurşid kimi bağ füruği,
Etdi fələyin sabitü səyyarini pünhan.
Ol bağdə kim, göllər olar bəhri-göhərxiz,
Bir vəqtdə kim, əbri-bahar ola dürəfşan:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Ol bağdə kim, qəl`əsi əflakə çəkib sər,
Ol qəl`ədə kim, dari-sünehr ilə bərabər.
Cövşi-gülü nərgisü rəyahinü qərənfil,
Dünya üzünü eylədi rənginü müəttər.
Pəh-pəh, nə gözəl sərvləri var bu bağın
Kim, faxtəsi kərkəsi-gərdun ilə oynar.
Gül butələri dilkəşü ər`ərləri mövzun,
Cənnət yoludur çar xiyabani sərasər.
Axır necə hüşyar oturum mən bu çəməndə
Kim, qönçəsi mina kimidir, laləsi sağər.
Ol qəl`ədə kim, bağ kənarına düşübdür,

Dörd canibi bişübhə səkkiz cənnətə bənzər:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Mütrib, belə gülzari-tərəbxanə gərəkdir,
Mey nuş elə kim, naleyi-məstanə gərəkdir.
Həm məbədi, həm meykədəsi var bu bağın
Kim, özgəyə məscid, bizə meyxanə gərəkdir.
Hər qönçə bu gülzardə bir Leyliyə bənzər,
Hər kimsə ki, Məcnun ola, divanə gərəkdir.
Bu abi-havadan ki, verir aşiqə əhya,
Var canımız, əmma bizə cananə gərəkdir.
Ol bağdə mən sinəmi sədçak edərdim,
Sünbüllərinin kakilinə şahə gərəkdir.
Bir fəsldə kim, səbzə silər zəng könüldən,
Ol bağdə kim, bülbüli-pərvanə gərəkdir.
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

Hicran sitəmi bağrımı qan eylədi, ey vay,
Ey dilbəri-hərcayiyü xunxar, mədəd hay.
Qövsi necə dursun xəmi-əbrulərə qarşı,
Ol baziyü pürzurilə netsin bu sınıq yay.
Əzbəs ki, ərindim ləbi-ləlin həvəsindən,
Dəryayi-mühit oldu gözüm, didələrim çay.
Mina kimi, nolur, bu sınıq könlümü alsan,
Bir sağəri-ləbriz ilə, ey kafəri-xudray.
Gəl-gəl ki, içib mey döşənək bərgi-xəzan tək,
Hər bağdə kim, badi-bahar ola səmənsay.
Mehmanlara var saf suyun özgə səfası,

Derlər ki, yavuqdur ola on dörd gecəlik ay:
Hey-hey dolanım başına, ey saqiyi-yağı,
Öz başin üçün qoymaya gör əldən əyağı!

**3**

Gətir, saqi, qədəh kim, novbahari-eyşü işrətdir,
Bu gündən böylə cuşi-eşqü tüğyani-məhəbbətdir.
Bu gün kim, camü güldən bangi-nuşanuş urar bülbül,
Meyi-gülrəngdən hər kim ki, qafil, məsti-qəflətdir.
Verir badi-bahar əmvatə əhya sübhdəm sən həm
Oyaq ol, fürsəti fövt etmə kim, fürsət qənimətdir.
Nola gər cami-minadan düşərsə aləmə qovğa
Ki, bu xurşidi-məşhər, ol qiyam etmiş qiyamətdir.
Gətir səhba ki, baqidir səlahü tövbənin çağı,
Bu beş gün kim, qələm yoxdur bizə, əyyami-möhlətdir.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, xaki-rəhgüzarı sürmeyi-çeşmi-bəsirətdir.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir, saqi, şərabı ver mənə, əmvatə əhya tək,
Ləbi-canbəxşini məndən diriğ etmə Məsiha tək.
Nə xoş güllər düşübdür çeşmimə gülzardən sənsiz,
Əcaib dağlar var lalədən sinəmdə səhra tək.
Məni mə`zur tut, gər olmuşam məst, istərəm səndən
Vəfa kim, adı var, yoxdur özü aləmdə ənqa tək.

Nola gər rəşkdən bülbül töküb göz yaşı qan ağlar

Ki, məhv olmuş gülə şəbnəm bieynih çeşmi-bina tək.
Mənim tək nola gər məstanə söylər bülbülü qumru
Ki, gəl cami-meyi-gülgun kimidir sərvi-mina tək.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, daniş gövhərilə var mala-mal dərya tək.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir, saqi, qədəh kim, arizu bağrım kəbab etmiş,
Meyi-gülrəng tək qeyrü məni həsrət xərab etmiş.
Mənim göz yaşımı zinhar ğur et, sərgiran baxma
Ki, suzi-dil onun hər qətrəsin bir ləli-nab etmiş.
Mənim hər misreyi-ahim urar divan ilən pəhlu
Ki, divani-qiyamından məni eşq intixab etmiş.
O günlər kim, keçibdir tövəbvü zöhdü vərə` birlə
Fəğan kim, xameyi-təqdir ömrümdən hesab etmiş.
Bahar əyyami olma naleyi-məstanədən qafil
Ki, rəhmət naləsin məstin duayi-müstəcab etmiş.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, hər bir zərrəni şəfqət gözüylə aftab etmiş:
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir, saqi, şərabi-nab kim, ömrün həzar olsun,
Açılsın qönçələr tək xatirin daim bahar olsun.
Ayaqdan düşmüşəm, tutsan əlimdən bir ayağ ilə,
İlahi başədin əyyami-eyşin paydar olsun.
Mənə müşkül keçir dövran, qədəh seyrilə asan et,
Binayi-xatiri-müşkilpəsəndin üstüvar olsun.

Qara dünlərdə qət`i-rah edərkən tövsəni-ömrüm,
Gətir gülgun meyi kim, əbr tək gərdunsuvar olsun.
Kəməndi-piçü tabi rişteyi-saz olmadan mütrib
Mahali-əqldir ol ahuyi-müşkin şikar olsun.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, olsun dövlətilə cavidan ta ruzigar olsun.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

Gətir saqi, qədəh ver kim, bu dövran yaxşı dövrandır,
Könüllər qönçəsi açılmağa aləm gülüstandır.
Peyapey tut əyağın sədqəsi, tez keçmə məndən kim,
Həyat onsuz mənə müşkil gəlir, gəl qeyrə asandır.
Behşiti-nəqd olubdur gərçi aləm laləvü güldən
Vəli səhbayi-gülgun olmayınca bəndü zindandır.
Nola Təbrizi gər Qövsi behiştə ixtiyar etsə
Kim, anun xak-payi sürmeyi-çeşmi-Sifahandır.
Həvayi-Gəncə, ol firdovsi-sani var başımda,
Fəğan kim, natəvanlıq maneü cəm`im pərişandır.
Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, biz onun qulu, ol bəndeyi-Sultan Süleymandır.
Bihəmdüllah ki, dudi-ahimiz əbri-bahar oldu,
Qaradan çıxdı, dağü bağü səhra, laləzar oldu.

## MÜSƏDDƏS-TƏRCİBƏND

Gəlin, ey əhli-vərə`, aşqü xümmar olalım,
Hamı bir müqbəcə yanında giriftar olalım,
Ney kimi nalə çəkib, çəng kimi zar olalım,
Necə kim böylə gözəl fəsldə hüşyar olalım.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Camlər zəhrilə məmlü şəbi-hicran içdik,
Eylədik tövbə əgər göz görə, pünhan içdik,
Hər nə kim verdi bizə saqiyi-dövran içdik,
Bu fəna dərhdə bəsdir bu qədər qan içdik.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Necə bir şamü səhər xabü xəyal ilə ötə,
Necə kim əxtəri-məs`ud zəval ilə ötə,
Yüz nişat ilə gəlib ömr, məlal ilə ötə,

Heyfdir böylə bahar ayı bu hal ilə ötə.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Xublər vari çəmən seyrinə zinhar gəlin,
Cəm` olun qönçə kimi, gül kimi bir dəm açılın,
Eşidin bülbülün ahəngini, qədrini bilin,
Dustlər mövsümi-gül getmədən əldən yığılın.
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Yarə can eylədik isar, budur niyyətimiz,
Tutarıq damənini yar ola gər dövlətimiz,
Biz onun bəndəsiyik, səcdəsidir taətimiz,
Ömr əgər möhlətimiz versə, fələk fürsətimiz:
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Fariğ olman fələki-mübrimin ibramından,
Hiç kim sə`y ilə qurtulmaz onun damından,
Dustlər, dövri-zaman gərdişi-əyyamından
Etəməmişkən bizi bihuş əcəl camından:
İçəlim bir neçə gün badəvü sərşar olalım,
Bizə yar olmasa saqi, biz ona yar olalım.

Nola gər çərx ilə yekru qıluram mən Qövsi,
Dust gər yar ola neylər mənə düşmən, Qövsi,
Büt ilə xəlvət edən yerdə bərəhmən Qövsi,
Gəl ki, bir guşədə saqiyü mənü sən Qövsi:
İçəlim bir neçə gün badəvü sərşar olalım,

Bizə yar olmasa saqi, biz ona yar olalım.

* * *

## MÜXƏMMƏSLƏR

### 1

Məni hicr eyləmiş zirü zəbər, vallah-billah,
Könül abü kəbab olmuş cigər, vallah-billah,
Məhəbbət qoymamış məndən əsər, vallah-billah,
Deyin məndən ona, dustlər, vallah-billah.
Yetər, zalim, yetər, kafər, yetər, vallah-billah.

Gülün peyvəsteyi-könli açılur fəryadi-bülbüldən

Ki könli qönçə olsun bülbüli mən` eyləyən güldən,
Yıxıbdır səbr evin eşqü ötübdür iş təhəmmüldən,
Sənə məqsud əgər üşşaqi yıxmaqdır təğafüldən,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Bu kim, könlümdə od, köz pərdəsində təhbətəh qandır,
Səninlə içdigim meydir ki, adı abi-heyvandır,
Əgərçi aşiqə məşuqdən hər dərd dərmandır,
Cəfa səndən vəfadır, cövr səndən gərçi ehsandır,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Səni kim, durbinlər eşq ilə sərgiran derlər,
Bu zahir zülmə heç bilməm nəçün lütfi-nihan derlər,
Vəli əğyar ilə var cuşeyi-çeşmin yəman derlər,
Nigahın sədqəsi kim, fitneyi-axırzəman derlər
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Məgər görməzmi halim çərx, fəryadim eşitməzmi,
Tərəhhüm eyləyib bidadın axır axır etməzmi,
Gəlib sübhü vüsalü şami-xunaşam getməzmi,
Mənim naləm ki, yetməz kuyinə, əflakə yetməzmi,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Bilir mən tək gəzən Məcnuni-bipərva libasında
Ki, Leyli cilvə eylər ahuyi-rəna libasında,
Bu məndən şükrdür, gər şikveyi-bica libasında,
Bu səndən lütfdür, hərçənd istiğna libasında,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

Mənə hərçənd bidad eylərü imdadıma yetməz,

Əgər çərxin binasın sel aparsa, yadıma yetməz,
Sipehri-səngdil beş gün əgər fəryadıma yetməz,
Sanırsan Qövsinin fəryadı bir gün dadıma yetməz,
Yetər zalim, yetər, kafər, yetər, vallah-billah.

**2**

Ey şami-qəmim zülfi-pərişanına qurban,
Sübhi-tərəbim çaki-giribanına qurban,
Sevdazədə başım xəti-fərmanına qurban,
Ey nəqdi-həyatım ləbi-xəndanına qurban,
Şirin sözünə, lə`li dürəfşanına qurban.

Bax bir nəzəri-lüftilə sinəmdəki dağə,
Rəhm eylə mənə, qəmzən oxun atma qırağə,
Ey hiçə satan bülbüli-xoşləhzəni zağə,
Yarəb, ola bir gün kim olam başdan-ayağə,
Başdan-ayağa sərvi-xüramanına qurban.

Ey başım iyəsi, olayım başına sədqə,
Həm özünə, həm yarına, yoldaşına sədqə,
Ey ahuyi-Çin, dağınavü daşına sədqə,
Ey əqlimü huşum gözünə, qaşına sədqə,
Xalu xətinə, çahi-zənəxdanına qurban.

Hərçənd qərib etdi məni eşq vətəndə,
Bir sən kimi novgül bulunur hansı çəməndə,

Bihudə degil bəslər isəm canı bədəndə,
Ey kaş ki, tük baş isə bir can ola məndə
Ta bir-bir ola navəki-müjganına qurban.

Hərçənd verib dərd, dəvanı unudursan,
Qövsi kimi bir süxteyi-canı unudursan,
Ol aşiqi-binamü nişanı unudursan,
Hərçənd ki, tez mehrü vəfanı unudursan,
Ey bağrı bütün əhdinə, peymanına qurban.

**3**

Daneyi- ləbtəşnəyəm, ey əbri-gövhərbar hey!
Aşiyansız bülbüləm, ey şəm`i-gülrüxsar hey!
Yüz qəmü dərdü bəla pamalıyam, qəmxar hey!
Canə yetdim piçü tabü eşqdən, ey yar, hey!
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Əhli-dil kim, çeşmi-tərdən qan qatarlar aşıma,
Əşkimə seylabi-xunü pül demişlər qaşıma,
Sən ki, şəm`i-bəzm tək rəhm eyləyib göz yaşıma,
Ol qədi-rə`na ilə hər gah gəldin başıma
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Başımı ta şəm` tək sevda oduyla dağladım,
Cahi bitəqrib güldüm, gahi bica ağladım,
Hər nə tutdum dəstimə damani-fürsət çağladım,
Ta ki, durdum qulluğunda əl-əl üstə bağladım,
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Ey xoş ol saət ki, şəm`i-bəzmim ol rüxsar idi,
Bülbülü pərvanədən məclis dolu əğyar idi,
Ol nəfəs ki, guşeyi-çeşmin mənimlə yar idi,
Sən əlim tutdun, vəli mən ta ayağım var idi.
Getdim əldən, ey dolanım başına, dildar, hey!

Xəstədir Qövsi, təbibim, dərd bilmək çağıdır,
Çarə qılmaq, kam vermək, könlün almaq çağıdır,
Çünki gəlmək, çeşmi-eyvanında qalmaq çağıdır,
İntizarın çəkdümü gördüm ki, gəlmək çağıdır,
Getdim əldən, ey dolanım başına, dildar, hey!

**4**

İstərəm ləli-göhərbarına qurban olum,
Dilinə, ağzına, göftarına qurban olum,
Qədi-mövzuninə, rəftarına qurban olum,
Nərgisi-məsti-füsunkarına qurban olum,
Xətinə, xalına, rüxsarına qurban olum.

Ey həvayi-səri-zülfün mənə balü pər edən,
Eşq oduna pərimi, balımı xakistər edən,
Dili-sədparəmi qan eyləyənü gövhər edən,
Məni bu qülzümi-xunxardə biləngər edən,
Nə göhərsən ki, xiridarına qurban olum.

Nola gər əl verə, ey sərvqəd: siməndam,
Dolanıb başına öpmək ayağın, almaq kam,
Ey ki, olmuş iki zülfün hər iki aləmə dam,
Ey mənim şamimi sübh eyləyənü sübhümi şam,
Mən sənin türreyi-tərrarına qurban olum.

Ol ki, bidərdlərin dərdinə timar etmiş,
Məni bu rəng ilə yüz dərdə giriftar etmiş,
Ey səba, söylə ona kim, məni əfkar etmiş,
Ol ki, adını təbibi-dili-bimar etmiş
Ki, sənin nərgisi-bimarına qurban olum.

Sərvqədlər sənə, ey sərvi-rəvanım, sədəqə,
Sənə, ey sərvi-rəvan, ruhi-rəvanım sədəqə,
Adına, yadına nam ilə nişanım sədəqə,
Xal olan daneyi-təsbihinə canım sədəqə,
Zülf olan həlqeyi-zünnarına qurban olum.

Dili-divaneyi-bibakımı gözdən qoyma,
Şölə çəkmiş xəsü xaşakımı gözdən qoyma,
Eşq bərbad qılan xakimi gözdən qoyma,
Sən mənim sineyi-sədçakimi gözdən qoyma,
Mən sənin navəki-xunxarına qurban olum.

Ey ki, hüsn ilə yetirdin məhi-Kən`anə nəsəb,
Bu nə sözdür, nə dəhandır, bu nə dişdir, bu nə ləb,
Nə çəməndir, bu nə şəbnəm, bu nə gövhər, yarəb
Ki, sənin əbri-göhərbarına qurban olum.

Bağban bağınavü rənc aparmış əlinə,
Nəxlinə, hasilinə, sərvinəvü sünbülünə,
Dəsti-gülçininə, cibü bəğəli-pürgülünə,
Lütfünə, qəhrinəvü zağınavü bülbülünə,
Gülünə, gülşəninə, xarına qurban olum.

Sənü şirindilü Qövsivü bəsi rəngin söz,
Gah od yandıranü gah verən təskin söz,
Ah, əgər ləlin ona eyləməyə təlqin söz,
Şur ilə aləmi ləbriz qılan şirin söz,
Nə nəməksən ki, nəməkzarına qurban olum.

**5**

Məni saldın ayaqdan, ey səbükcövlan, günahım nə?
Əlimdən tutmadın, ey saqiyi-dövran, günahım, nə?
Əzəldən mey verib axır verirsən qan, günahım nə?
Vüsal əyyamın eylərsən şəbi-hicran, günahım nə?
Günahım nə, dolanım başına, canan, günahım nə?

Təhi-minada ta mey var, ola bağrımdakı qan tək,
Nə lazım xuni-dil vermək məni-məxmurə dövran tək,
Mükərrər tarü pudim dağıdıb zülfi-pərişan tək,
Vəfa qanununun tarını üzdün rişteyi-can tək,
Günahım nə, dolanım başına, canan, günahım nə?

Bir-iki gün mənimlə bitəkəllüf durdun, oturdun,
Dönüb toprağımi bidad ilə əflakə sovurdun,

Məlamət tiğini çəkdin, təğafül yayını qurdun,
Nə bir gün rəngimi gördün, nə bir gün halımı sordun,
Günahım nə, dolanım başına, canan, günahım nə?

Özün sən yaxşısan, əmma yamandır böylə, başinçün,
Cəfavü cövr səndən eybdir, tərk eylə, başinçün,
Neçin viranimi, yarəb, verirsən seylə, başinçün,
Əgər var isə cürmüm, bilməzəm, sən söylə, başinçün,
Günahım nə, dolanım başına, canan, günahım nə?

Məni çün aqibət Qövsi kimi candan usandırdın,
Əzəl başdan neçin bəs canımı aldın, inandırdın,
Qılırkən saf, döndüm, çeşmeyi-çeşmim bulandırdın,
Çırağım yandırarkən qəm oduna dağ yandırdın,
Günahım nə, dolanım başına, canan, günahım nə?

## MÜRƏBBE

Könlüm istər kim, ola ol atəşin rüxsarü mən,
Fürsəti-ərzi-niyazü xəlvəti-didarü mən,
Növbaharü əndəlibü guşeyi-gülzarü mən,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

İkimiz ol məhvəş ilə bir qədəhdən məst olaq,
Bir nihalın sayəsində əylənib pabəst olaq,
Bağlarıq gərdun əlin gər bir nəfəs həmdəst olaq,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Ol mənə mənzur, ona seyri-çəmən mənzur ola,
Əngəlü biganə napeydavü məhrəm dur ola,
Mütribi-xoşləhcəvü çəngü neyü tənbur ola,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Biz diyari-eşqdə çeşmi-çırağİ-aləmik,
Bir cahan ənduh ilə bibakü rindü biqəmik,
Saxlasın tanrı yaman gözdən ki, yaxşı həmdəmik:
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Bərgü bar ilə mühəyyadır baharın tuşəsi,
Bir tərəf gül xərməni, bir yanda sünbül xuşəsi,
Künci-deyrü bərəhmən, zöhhadü məscid guşəsi
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Biz kimiz, surətdəvü mənidə layiq dustlər,
Dustluq dəvasını etməkdə sadiq dustlər,
Bir-birilə az düşər biztək müvafiq dustlər,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Ey xoş ol saət ki, bizdən gərm ola bazari-eşq,
Adımızdan sikkeyi-rayic bula dinari-eşq,
Qövsivü təkrari-şeri-halivü izhari-eşq,
Əbri-gövhərbarü saqiyü şərabü yarü mən.

Ey eşq əmanətində sirdaşım, gəl,
Gəl, ey dəlilikdə yarü yoldaşım, gəl,
Məcnunə yetirsən, söylə, ey badi-səba,
Qövsi dedi: ey oxşama qardaşım gəl,

## MÜNDƏRİCAT

# K İ T A B I N   İ Ç İ N D Ə K İ L Ə R



**Qəzəllər**

Zəxmi cunəfşanım, ey bülbül, güli-tərdir mana
Kimi can etdi, kimi könlünü dildarə fəda
İstərəm peyvəstə, ey rə`na, dolanım başına
Ey qaşların duaçılara qibleyi-dua
Gər iltifat etməyə badi-səba mana
Məndən, səba, filanə ki, qurban olum sana
Ruhi-qübsisən, nəsən, ey mən dolanım başına
Mən ol gün eylədim öz canımı nisar sana
Ta visalın məni dildən sala, hicran nə rəva
Gülzari ömr qönçeyi-xəndanına fəda
Ey mayeyi-həyat, dilü can fəda sana
Can nədir, kimsə onu etməyə canana fəda
Rövzeyi-rizvan fəzayi-kuyi-dilbərdir mana
Ta nigahim nərgisi-yarilə olmuş aşina
Ləbinlə dilləşə bilməz nə gül, nə qönçeyi-həmra
Hüsn eşq ilə bərabərdir giriftar olmasa
Mənimlə saqiyi-gülçöhrə yar ola, nə ola,
Əsərsiz ahimə sən verginən əsər, yarəb
Mənimlə bundan artıq yarimi yar etginən, yarəb
Dilər könlüm ki, yar əğyar ilə yar olmasın, yarəb
Dustlər, könlüm diyarın etdi viran iztirab
Saqiya, sunmuş mana nəzzarədən ol göz şərab
Şişəmi, gər çalsa daşdan-daşə ol rə`na igit
Mey içüb çıxmış şəlayin evdən ol rə`na igit
Təngsərfəm, məni saqi, əlindən gəlsə hüşyar et
Canə yetdim dərdi-dil zəbtindən, ey dildar, eşit
Gətir, saqi şərabi-nab, mütrib, sazını saz et
Hüsnündən özgə neylər, zülfündə tab bais
Mənə deyən ki, nədir bunca yanmağa bais
Əldən gedirəm sərvi-xüramanını görgəc

İç şərabi-nab özün, saqi, mənə məstanə bax
Gərçi gün kimi olur paknəzərlər küstax
Qəmzeyi-xunxarına cür`əti-nəzzarə yox
Var ümidim ki, genə eyləyə çeşmin məni yad
Gəlir bahar, açılıb gül həzar edər fəryad
Könüldə qönçələnibdir cəhan-cəhan fəryad
Mənə cahanı qara eyləmiş sipəhri-kəbud
Əvvəl ləbin şərab verir, sonra qan tutar
Qubari-cism biaram düşsə, candan artıqdır
Nə sərkəş şölədir bu, vəh, bu nə qəddü, nə qamətdir
Düşən kuyindən ayrı naleyi-ərşaşina neylər
Bu sərzəminə xansı çəməndən səba yetər
Könlüm almaq qəsdinə çün şux tənnazım keçər
Hərçənd gül lətif ola, rüxsarın özgədir
Aləmi məhv qılan ağzıvü şirin sözüdür
Kim ki, bu aləmdə ömrün sərf edib yar axtarır
Ey çeşmi-əşkbar, cigər böyləmi olur
Dövründə arizin xəti-müşkin qəribdir
Dərdi-sər çəkməz əgər zahid riyalərdən keçər
Təğafül eyləmə, saqi ki, novbahar keçər
Dil munca arizu ilə bimüddəalənür
Üşşaqi-binəvayə qulaq tut, nəvayi gör
Qətlimə bel bağlamış ol cahilü nadanı gör
Qönçeyi-gül ta gülüstanın çırağın yandırır
İlahi, nola gər lal olsalar şeydayi bülbüllər
Əflak könlümün quşuna aşiyanədir
Nəzzareyi-gül ilə dərdi-yar tazələnür
Nola gər bağrımı qan, çeşmimi giryan eylər
Bu rəsmlə əgər əbruyi-yar işarələnür
Könül almaq rəvişin ol güli-xəndan nə bilir

Bir yol demədin kim, könül, ey yar, kimindir
Öylə kim, dərman sənindir, dərdi-bidərman sənindir
Çırağì-dağ ilə könlüm vüsali-yar istər
Gərçi hər aşiqə hicran qatı müşkil görünür
Var isə cəm`iyyəti-xatir, pərişanlıqdadır
Nə sözdür bu ki, sən bərqi-bəla, dünya neyistandır
Anınçün mən sənə yalvarmanam kim, yalvaran çoxdur
Səba, səlamımı lütf ilə ol diyarə yetir
Ləbi-meynuş, saqi, özgədir, mey gərçi rəngindir
Mənim gözüm ki, nə gülbün, nə yasəmin yeridir
Könül əvvəl gəlir gözdən, gözüm hərgah giryandır
Könlümü almaq haçan ol sərvi-baladən gəlir
Odlu dağimdən dəmadəm pənbeyi-mərhəm yanar
Sanmın muradım əhli-həvəs tək nəzarədir
Ey şəm, eşit gör ki, nə əfsanələrim var
Mən ki, əldən getdim, ol sərvi-səbükcövlan gəlir
Vəsldən göz yaşı, ey dideyi-əhbab, artar
Böylə əldən getdigim gər bilsə yar, əldən gedər
Hər dəm əldən məni ol pənceyi-müjgan aparır
Ey xəyalın həmdəmim, adın mənə yalquz yetər
Bu rəng mənim bağrım əgər qan olacaqdır
Mən təbibəm hər kimin kim, dərdi-bidərmanı var
Əgər min dağ yandırsam, könül bir ayrı dağ istər
Gərçi xublar möhnətin hər aşiqi-heyran çəkər
Biəsərdir nalə ta ney tək, əsər bəndindədir
Qeyr birlə gülsitan səhnində yarın seyri var
Qibləgahim, səfheyi-hüsnündə xalın seyri var
Məni ol atəşin rüxsar çün yandırmağa başlar
Əgər tuba, əgər sərv ol, qədi-rənayə rəşk eylər
Yandırmışam könüldə çəpü rast dağlar

Şikvə nə üçün, cəfa sənindir
Aşiqə hərçənd dərdü dağü möhnət yaxşıdır
Sərv qəddin kim, qiyamət misrəin mövzun edər
Eşqdir kim, səni Leyli, məni Məcnun edər
Deyər zahid ki, zahirdir qiyamətdən əlamətlər
Mən istəmənəm dərdimi canənə desinlər
Hərçənd sərgiran ola dildar yeg bilir
Piçü tabim yollar üstə həlqeyi-zəncir olur
Əgərçi ol güli-rə`na iki dünya ilən başlar
Əzbəski göz ol atəşi-rüxsar dağıdır
Dilim fəğan iləvü didə qan ilən doludur
Qübar badi-payi-yar üçün kim, tutiyamızdır
Ləli-nabın bilmənəm, ruhi-rəvandır, ya nədir
Qanımı içmək dilər saqi, gözündən bəllidir
Əhli-həvəs anın gözü qaşu yüzün sevər
Hər guşədə min aşiqi-xunincigərin var
Göz bəyazi rəngi-alından boyanmaq çağıdır
Əgər göz yumsa vüs`ətdən könül damani-səhradır
Rüxsarın abü tabını heyran olan bilir
Çərxi-fələk dönər, bili-bitab ta dönər
Lə`li-nabin özgədir, çahi-zənəxdan özgədir
Bu yetməzmi ki, seylabi-bəla başımdən aşıbdır
Əgər sitəm sənə hicrandan, ey həzar, yetər
Parə-parə cigərim sineyi-suzanda yanar
Mən özüm bilmənəm əhvalımı, dildar bilir
Çərxi-gərdun, dövri-dövran dövlətü din yaridir
Daşə salmaq rəxnələr ol növki-müjgandan gəlir
Zahid öz təsbihini, küfr əhli zünnarın sevər
Çün xəyalın handa kim var, aşiqin yanıncadır
Şirin təbəssümün sözə ruhi-rəvan verir

Hərçənd xəlq qanını çeşmin əyan içər
Tufani-seyli-əşk göz açıb yumuncadır
Xurşidü mah cilvəsi bir göz görüncədir
Tutar ahəng mütrib, çün dili-püriztirab oynar
Qədin ki, sərvi-xuraman ilən bərabərdir
Bu nə gözdür ki, sənin var, nə bəla məddi-nəzərdir
Səbr ilə hansı dərdə təbibim dəva verir
Mahi-Kən`anın gözü şahi-zənəxdanındadır
Bizim hərçənd üşşaq arasında adımız yoxdur
Bülbüli-şeyda gülün, pərvanə şəm`in dağıdır
Əgərçi naləm ilən naləsin həzar unudubdur
Könül gər ram ola, dövlət rəfiqü bəxt yarımdır
Mənə mənzurdu hüsnündən, ey şirinzəban, gözlər
Şaxi-gül, ey bağban, hərçənd gülgun camədir
Sipəndi biqərarız biz, vəli fəryadımız yoxdur
Demə bitab könül gövhəri-qəltaqə dəgər
Deyin Fərhadü Məcnun xabi-qəflətdən oyansunlar
Fəğan ki, bilmənəm öz könlümün bəlası nədir
Fariğ olsam giryədən könlüm evi viran olur
Məni-bitab əgər çəksəm nəfəs, bülbül fəğan başlar
Gözümdə lütf edib əglənməsən, gözüm yoxdur
Aşiqi-bitab üçün arami-candır novbahar
Mənim canım ki, bir dərd anlayan canənə layiqdir
Bülbül kimi baharü xəzan bilmənəm nədir
Heç şəm ilə ram olmaz, pərvanələriz bizlər
Ey şəm, bu günlərdə mənim halımı gər gör
Dəhr heç beş gündə bir atəşinan meydanıdır
Yarəb, bu il nə növ gəlib, keçdi novbahar
Biz kimüz kuyində yarın, bir bölük avarələr
Ol gün ki, zülfün ol sənəmin şanə qıldılar

Yüz min qəm ilə xatirimi şad qıldılar
Ey ki, hüsnün aşiqin xurşidi-aləmtabidir
Ey ki, çeşimi həlqeyi-zülfi-pərişanındadır
Nola gər könlümdə eşq naləfərma gizlənir
Hər kimə ol səngdil səhba verir, qan ağladır
Aftabi var sipehrin, ana qarşı ayı var
Aşiqəm, binəvalığım vardım
Ah kim, səbrim binasin etdi viran intizar
Fəğan ki, söz deməyə doğru sözlü yar azdır
Şö`leyi-ataş ki, derlər çöhreyi-cananədir
Ey fələk, canə yetirdim məni, cananə yetir
Səba, durub yola düş, var ana, səlam yetir
Kuyində peyki-badi-səba hiçkarədir
Fəğan ki, anlamanam söz nədir, nəzarə nədir
Can piçü tabi cismdə canan yetincədir
Hər dəm könüldə cilveyi-cananə yaxşıdır
Sinəmdə könül mürği-giriftar ilə birdir
Bəzmi-vüsalə baxma, dili-biqərari gör
Aləmdə bu gün aşiqi-xunincigər azdır
Nizami-dərdişi leylü nəhar bir dəmdir
Səba, təqsirimi, zinhar, ol bidadgərdən sor
Desəm nəzzarə qıl rüxsarını, məndən nihan eylər
Qətrəni hərçənd derlər kövhər eylər novbahar
Əndəlib ilə gülü hərçənd yar eylər bahar
Əgər bir namə məndən dustlər dildarə yazsınlar
Etməmişdir, dustum, bağrın sənin qan intizar
Qərəz könüldür əgər sinəm üzrə dağ yanar
Eşq baladəstü hicran lazımü məlzumdur
Mən ki, təslimən sana, bəs dəxi istiğna nədir
Gözümdə qönçələnmiş könlümü canan yolun gözlər

Həvasın ol pərinin mən kimi divanələrdən sor
Naləm ilə bəski bülbüllər səsi ahəng olur
Niyazimdir nəmazım, qibləgahim əbruyi-xəmdir
Ol səsi-kuy mənə vəsldən, ey yar, yetər
Mənim gözümdə qiyamət gün ilə toəmdir
Rəfiqəm kim ki, üşşaq içrə tərki-xaniman eylər
Gözlərin nərgisi-məxmur, özü xümmar özüdür
Axır bu dərdü dağə təbibim dəva qılar
Bir-birinin təbarikidir rüzigarlər
Anın zülfin əsiri-həlqeyi-zünnar olandan sor
Olmuşam dilgir özümdən, qəmküsarım qandadır
Badeyi-vəhdət içən aləmi-meyxanə bilir
Mənü məhəbbətü yüz rəng binəvalıqlar
Qəradır rüzigarım, rüzigarım handadır sənsiz
Günüm gecəm kimi peyvəstə qarədir sənsiz
Zə`f ilə gərçi qönçələnibdir sitarəmiz
Hərçənd qəmi-eşqi nihan eyləmək olmaz
Arizin ayineyi-giytinümadən saxlamaz
Əgərçi şəm kimi şö`lə-şö`lə od yemək olmaz
Şikəstə könlümü sübhi-vüsali-yar açmaz
Möhnətimdən mənim ol məst xəbərdar olmaz
Hansı gündür kim, təğafül bağrımı qan eyləməz
Ərşdən ötdü, eyləməz yarə əsər fəğanımız
Yan eşqlə kim, eşqdə nəqsü zərər olmaz
Ney kimi kirdarimiz bəndindədir göftarımız
Olur hərçənd can şirin, vəli canan yerin tutmaz
Səndən nə gündür, ey məh, mehrin çırağı yanmaz
Deyərlər kim, əlaci-dərdi-pünhan eyləmək olmaz
Yerdən məni hər sərvi-xüraman edə bilməz
Fəğan kim, məddi-ahim nəxli səbz olmaz, səmər verməz

Xət mənim qətlimdə gər yüz tutsa, tə`xir eyləməz
Mənim hərçənd bir gün halımı ol bixəbər sormaz
Yüz hüsn dilü dideyi-heyranə yetişməz
Aldı məndən aqibət can nəqdin ol əyyar göz
Görmənəm bir həmnəfəs, ta eyləyim, izhar söz
Üşşaq nərgisindən onun can əsirgəməz
Ta gözüm var, könlüm əglənməz mənim dildarsız
Ömrlərdir sədri-əshabi-məhəbbət bəslərsiz
Aldı hicran canımı, canan məgər can istəməz
Bəzmi-vüsal rövzeyi-rizvanə bənzəməz
Kə`bədən xəlq ötdülər, səhranəvərdəm mən hənuz
Nə yalquz məndən ol sərvi-rəvan ötgəc, rəvan qalmaz
Gərçi qoymaz çəkməgə kamimcə dövran bir nəfəs
Lə`lin verir həyat, alır can nəfəs-nəfəs
Cəmalindən sənin, ey şəm, heyranlıq mənə qalmış
Ol ki, cənnətdir adı, guşeyi-meyxanə imiş
Fəğan ki, dəhrdə bir aşina bulunmaz imiş
Dili-bitab əritmiş bağrımı, gözdən rəvan etmiş
Ol ki, hüsnündən sənin dünyanı gülzar eyləmiş
Məgər zənciri-zülfün şanələnmiş
Rövzeyi-rizvan ki, derlər, arizi-canan imiş
Bəzmi-mey sənsiz, həmana, bənd imiş, zindan imiş,
Vəslin əgər bulunmasa, gözdən nədir qərəz
Aşiqə nə ne`məti-əlvan, nə cənnətdir qərəz
İçib mey qanə-qanə bağrımı qan etdi ol novxət
Sinədə könlüm sərayin rövşən eylər şəm`i-dağ
Aldı məndən yarə layiq canı hicran, heyf-heyf
Yoxdur səbati fəsli-gülün ey həzar, heyf
Hüsn əgər ayinə olsa, ona cövhərdir eşq
Nə hərzə möhnətü dərdü qəmi-bəladadır eşq

Dönər pərvanətək mə`şuqinin başinə hər aşiq
Nə bülbüldür, nə gül, nə şəm, nə pərvanədir aşiq
Ey səba, tanrıyçün et bir dəm mənimlə yarlıq
Xoş şüğli-dilnişindir əhbabə mehribanlıq
Ey məlahət gənci, bil qədrini viran könlümün
Şəm tək, ey əşki-xunin, məndə sən göz qoymadın
Mənə bidərd səhba verməsin, dərd əhli qan versin
Əlimdən aldı gözüm, saqi, ixtiyar gözün
Könlümün halın mənim ol sərvi-baladan sorun
Zə`fdən düşdüm ayaqdan məni-sərgərdanın
Ey deyən Məcnun hanı, Məcnun mənəm, Leyli gərək
Əzabi-çeşminəm, ey məsti-bixümar, sənin
Aşiqlərə nə şəm kimi tacı-zər gərək
Hərçənd yetməsə mənə dövranı saqinin
Varın, ey sərvlər, ol şiveyi-rəftarı görün
Niqab aç, vaizin bağla dükanın, şöhrətin, getsin,
Düşmədin dildən, könül, dildarə yalvarmaq gərək
Yaxşı eyşim var, oxun zəxminə gər can çıxmasın
Bilməz idim kim, can dağı-hicranın sənin
Nola, ey saqiyi-xunxar, əgər qaynar mənə qanın
İstərəm rayincə olsun dövri-dövran saqinin
Nə şirindir sözün kim, tanrı ondan göz qulağ olsun
Yerli-yerdən siz, ey ərbabi-tərəb, vari durun
Nalə ilə sızlaram hərgah musiqar tək
Abi-heyvandır ləbi-ləm-dürəfşanın sənin
Ömrə yoxdur e`tibar, ey can, nisar olmağ gərək
Könlümü, saqi, kəbabü dağü büryan eylədin
Nola gər təlxkam olsam məni-yekrəng səhba tək
Xarü zəlilü zarü pərişanınam sənin
Abru əzbəs ki, rüxsarində peydadır sənin

Eşq dəryadil mənim könlümdə pünhan olsa yeg
Navəkin sinəmdə, ey əbrukəman, xəm bolmasın
Gər nalə çəkməsin dili-bimar, neyləsin
Əsiri-eşq olana daim odlu dağ gərək
Ey kəməndi-zülfi-canan kim, rəsadır himmətin
Eşqində tərki-sər qılıram, neyləmək gərək
Neçün məndən yüzün döndərdinü əbruyə çin urdun
Ey nalə, yəman könlünə yarın əsər etdin
Gərçi şövq etmiş məni atəşinan seylab tək
Bağrımı yüz yerdə artıq dəldi müjganın sənin
Xoş abü tablıdır əbri-novbahar bu il
Saqiya, bağrım meyi-gülgun üçün qan oldu, gəl
Aşiqə sübhi-ümidü-şami-hicrandır xəyal
Çərxi sərgərdan ilə dəstü giribandır könül
Xəndeyi-zirləbi üçün olma xunindil, könül
Kuyində Xızr, dideyi-bidardır könül
Salıbdır odlara ta şəm`i-rüxsarın məni, ey gül
Əgərçi xoşnəsimü tazə pürtab olur sünbül
Əgərçi kəmsüxənü binəvayəm, ey bülbül
Baği-cənnətdən əgər göz yumsa Adəm, qəm degil
Zəxmi-tiğin xəlqdən bihudə yaşırmış könül
Mən imtiyazi-məscidü meyxanə bilmənəm
Vəslini peyvəstə, ey aşubi-dövran, istərəm
Həmişə şəm kimi, sərfi-piçü tab oldum
Piçü tab cövhəri-tə`sirdən biganəyəm
Bağdan, gül sənin, ol şöleyi-rüxar mənim
Yıxdın məni, ey saqiyi-dövran, neləmişdim
Neylərdim əgər bağrımı qan eyləməsəydim
Necə bir, yarəb, səhiqamətlərə heyran olum
Çox Kə`bədə sə`y etdim, meyxanəyə tuş gəldim

Ey ki, hərgiz səhv birlə etmədin yadım mənim
Xətti-yaquti-ləbindən baş çıxarmaz hiç kim
Fəraqindən sənin, ey novgül, əfğan etməyim, neylim
Sənə nəzzarə girandır, boyun bəlasın alim
Hərçənd rəşkdən məni-biçarə yanıram
Gecə şəm`i-rüxün yad eləyib məhtabə yalvardım
Dün kuyinə yarın dəli vardım, dolu gəldim
Tərəhhümi etmədi, hərçənd yandım, yarə yalvardım
Handa bir dərd əhli var, bağü baharımdır mənim
Mən məst idim, ol məst ilə axır belə düşdüm
Sanma kim, Məcnun kimi ahulərin dustaqiyəm
Hərçənd keçdi, bülbül, yüz rəng ilə baharım
Xəzan fəslində girdim bağə, yadi-novbahar etdim
Mən axır könlümü çün zülfünə, ey yar, bağlardım
Ney kimi çün binəvalər naləsin yad eylərəm
Yox özümdən xəbərim, ney kimi ta var əsərim
Öylə kim, mən olmuşam sərməst, hüşyar olmanam
Ayaqdan gərçi fərq olmaz mənim xurşid tək başım
Etmədin əndişə, ey gərdun, fəğanımdan mənim
Nə bir gün rahətim vardır, nə bir dəm səbrü aramım
Natəvanlıqlar mənim əzbəs əritmiş peykərim
Ah, bilməm neyləyim kim, yardən ayrılmışam
Ömrlər bağrımı mina kimi qan eyləmişəm
Bu ağır dərdilə sərgəştəvü bisəbrü bitabəm
Bu səhralərdə gər xari-müğilandan cəfa gördüm
Aşiqəm, mən dövlətü malü mənali neylərəm
Sanma könlüm tək mənim dərd əhli çox var, ey həkim
Hərçənd bəzmi-vəsldə canənə yetmişəm
Anın qədin nihali-ömri-cavidanə bəzətdim
Məndə can olsaydı, ey qatil, nisar etməzmidim

Olmadın məsrur, ta mən zarü giryan olmadım
Hərçənd könüldən yetişür dərdi-giranım
Saqiya, pərvaneyi-şəmi-şəbi-hicranınam
Ömrlərdir yar üçün pamali-əğyar olmuşam
Əzəl başdan ki, nəqdi-canımı canana tapşırdım
Mən ki səndən nəzarə istərdim
Canə doydum, bilmənəm əğyar əlindən neyləyim
Gəlin, ey əhli-tərəb, sağəri-meynuş edəlim
Badeyi-nabi-güvara mənə olmaz, neylim
Ey xətinlə arizin reyhanü nəsrinim mənim
Müqimi-Kə`bəvü sərgəşteyi-bütxanədir könlüm
Ol sitəmgər dilbərin cövrincə ehsan görmüşəm
Eşqində gər yüz il yanar olsam ki, yanmanam
Cananımın rizasını mən candan istərəm
Sənin ta qaməti-mövzununa məhvi-nigah oldum
Sərgəştə könlümü iki dünyayə vermənəm
Saqiya, yeksan tut ağaz ilə əncamım mənim
Ey kaş eşqi əvvəl baziçə sanmasaydım
Əlindən içsə idim camü badə, qansa idim
Ömrlərdir yollar üstə zarü nalan qalmışam
Bir ömrdür ki, atəşi-hicranda qalmışam
Cismi-zarımdan mənim hicran nə istər, bilmənəm
Nalə ilə bəs ki, yəğmayi-dilü huş eylədim
Yarəb, ol bidərdi dərdimdən xəbərdar istərəm
Xətin səvadinə gahi nəzarə eyləmişəm
Bu gün dönə-dönə ana yalvara bilmənəm
Xanəxahi-fəqrəmü səhra otağımdır mənim
Xəzan əyyamı girdim bağə, yadi-novbahar etdim
Nihali-səbzbarın istərəm, neylim
İstərəm lə`li-şəkərbarına qurban olum

Xətti-səbzü ləbi-xəndanına qurban olum
Fikrara hərgah ağzın qönçəsin yad eylərəm
Əgər bir ömr cananın xəyalın canə tapşurdum
Eşqi-dəryadil xətərlərdə pənahimdir mənim
Məndə ey kaş ki, yüz can ola, qurbanın olum
Qoymaz əldən eşq damanını əqli var olan
Gədayi-kuyinəm, baş əgmənəm gərdunə nəxvətdən
Vəh ki, könül rəxnəsin bir-bir yaşurdum dağ ilən
Ey biqərar, sinədə neştərmisən, nəsən
İlahi, könlümi qurtar bu aləm macərasından
Ey əbri-atəşin, vərəqi-gülmisən, nəsən
Məni yalquzladı dərdü bəlayi-yar bir yandan
Ey mənə bağü baharı bəndü zindan eyləyən
Neçə gündür gözlərim məhrumdur didardən
Müsəlmanlar, mən nakam çəkdim yar hicranın
Gəh zülfini, gah kakilini şanə qılırsan
Sübhi-vüsal üçün gəzirəm şəm`i-dağ ilən
Kimdir ol bibak yəğmayi-dilü huş eyləyən
Gərçi bilməz zülfün əhvalim pərişan olduğun
Cəhanə şur salmış duzlu göftarin ədalərdən
Əgər götürsə mənim məhvəşim niqab üzündən
Nə qanlar ola ki, dil içməmiş üzarın əlindən
Saqiya, eylə mənim canımı pürxun, pürxun
Böylə məst olduğumu saqiyi-xunxar nə bilsin
Nəvayi-naləm ilə oldun, ey əsər, düşmən
Ey binayi-əhdi-bidad ilə bərbad eyləyən
Ey sünbüli-zülf, ol güli-rüxsarə düşərsən
Can sözün qurbanı, ey icadi-köftar eyləyən
Qoydum əldən iki aləmdə nə kim var ətəgin
Xəlil gülşəni içrə nihali-dilkəşsən

Aparmışdır məni bir yerdə ol sərvi-rəvan məndən
Səhldir təsxir qılmaq sərbəsər dünya yüzün
Eşq dəryasında orəngi-sipehri-bisütun
Saqiyi xunxar, kimdir bağrımı qan eyləyən
Saqiya, mey ver ki, bağrın mən kimi qan olmasın
Gözüm hərçənd qanlar tökdü çərxin odlu dağından
Könlümdəki müradim, ey yar, sən bilirsən
Gözlərin bimariyəm saqi ki, bimar olmasın
Hicran günü suzi-dilü tabi-cigərimdən
Cümleyi-aləm mənə əğyar olubdur yar üçün
Ey mənim zülm ilə könlüm kişvərin viran edən
Çıxanda cani-həzin cismi-natəvanımdan
Xəlq, yarəb, axirət daşını atmışlar neçün
Səbrü qərarım aldı bir arami-can bu gün
Gəl bu meydən, saqiya, iç bir nəfəs qan bir zəman
Aşiq oldum yeni başdan bir pərirüxsarə mən
Sızıldar üstüxanim, bilməm, ey can,sən nə sızlarsan
İlahi, könlümi ya badə, ya qan istərəm səndən
Bir sən kimi gül yoxdur bu güllər arasında
Nola gər fərq ola namərdlərdən mərd dünyadə
Hərçənd tiğ kimi qədin xəlqi doğrıya
Yetər mey rişteyi-can gövhəri-yeganəsinə
Bir ömr bağladım nəzərim məhliqalərə
Gər can dilərsə lə`li-ləbin, canım üstünə
Müyəssər oldu bu gün vəsli-yar kamımca
Sözüm yoxdur fələk gər baxmasa gözdən axan yaşə
Baxan kimdir gülü gülzarə ol rüxsar olan yerdə
Nəşati-mey qənimətdir qəmi-hicran olan yerdə
Bihəmdüllah, yatıbdım sinəm içrə dağ-dağ üstə
Sipəndi-bilsədayəm şöl`eyi-avaz olan yerdə

Təşneyi-gülzarə-daği-laləzarəm, ah, ah
Xəfifü xardır hərçənd bülbül xar yanında
Ağrımaz bülhəvəs eşq əhli xarü zar olan yerdə
Saldı ol sərvi-rəvan sayə həvaxahlərə
Kuyində yarın itlər yetməz mənə vəfadə
Hanı məndən deyən ol sərvi-səhi-balayə
Ey vay ki, əldən gedirəm yar gəlincə
Təbibim, başıma bir gün gəlir, vallah, billah
İstəməzmi ol sitəmkər kim, məni şad eyləyə
Mən ki, əldən getdim ol sərvi-rəvan, gəl görgilə
Fəğan ki, daği-dil əfsürdələndi yar gəlincə
Qan içmə, könül, saqiyi-xunxar gəlincə
Xəyali-arizin kim, vəsldir hicran libasında
Peyvəstə xar olur güli-xəndan ilən belə
Hüsn eşq ilə bərabərdir, giriftar olmasa
Səba, sən ərz qıl bir rəng ilə əhvalimi yarə
Mənimlə saqiyi-gülçöhrə yar ola, nə ola
Zinhar, atma sitəm daşını divanələrə
Ömürlər xuni-dil içdim, gül`üzarım, səndən ötrü
Dildən-dilə düşdüm dili-divanədən ötrü
Yıxır viranəmi gərdun, sanır kim, xanəmandır bu
Düşübdür xəstə könlüm məndənü mən yardan ayrı
Xəbərdar olginən mina degil, saqi, könüldür bu
İnanım aldılar əldən, dili-zar ayrı, yar ayrı
Şərabın bağrı qandır saqiyi-xunxardan ötrü
Heç bilmənəm nə ariz, yarəb, nə rəngdir bu
Dideyi-ümmid kim, didarın eylər arzu
Aşiq sən oldun, ey dili-şeyda, mən olmalı
Nə qəm gər hər nəfəs xuni-dil içsəm, adətimdir bu
Sanırsan xaki-rah, əmma mənim xakistərimdir bu

Nola bitəqrib əgər eylərsəm izhar arzu
Nə ləbdir, vəh nə ağızdır bu, yarəb, vəh nə sözdür bu
Gördüm yuxuda yari, əcəb yar imiş yuxu
Əsiri-eşq olanlar yetişdi yar haray
Bağrımı qan etdi dövran, naleyi-sərşar hey
Gözü könlüm kimi, saqi, sevirəm minanı
Ta övc tutdu bülbüli-dəstansəra səsi
Qurtar, ey heyrət, bəlayi-vəslü hicrandan məni
Bülbül mənim əfğanimə qatlanmadı uçdu
Kəc təğafül birlə məndən ey edən şeyda məni
Sən ki saldın çöllərə Məcnun tək, ey Leyla, məni
Hərçənd heçə satdı isə asiman məni
Zəxmi-qəmində ol kəmərin sorma halimi
Etdigin çövri mənə əmdən qılaydın kaş ki
Üz verəli üzündəki xalü xətin nəzarəsi
İstədim hərgah lə`lin vəslini səhba kimi
Zəncir həlqəsi mənə divanələr kimi
Bir zaman al könlüm, ey dildar, başın sədqəsi
Xub yetişdin, yaxşı aldın könlümü, ey yar, hey
Əğyar tutdu çevrəmi, canan, haray, hay
İstər gözüm ki, göstərə dildarə könlümi
Bağrımın qönçəsini həsrət ilə qan qılıcı
Əsasi-tövbeyi-mey üstuvar böylə qalırmı
Gəl öz əlinlə rövşən elə şəm`i-dağımı
Gər behiştə mail olsam, kuyi-yarım bəs degilmi
Fələk kim idi, əgər yar yarım olsaydı
Şirin edər ləbin belə xəttin kinayəsi
Hər qədər yandın özün, rəşk ilə yandırdın məni
Mənə Məcnun deyən ol ahuyi-rə`nayi görsəydi
Atəşin rüxsarımın hərcayidir nəzzarəsi

Lütf ilə, ey atəşinrüxsar, ab etdin məni
Gedə-gedə aralıqdan götürmüşəm özümi
Zəifü zərd elədi rəngi-səbzi-yar məni
Hiç yaxmaz öz əlilə sinəmdə şəm`i-dağı
Nola ol gül bilsə mən tək binəvalər qədrini
Təzəllümdən usandım, zülmdən dildar usanmazmı
Könül adlı səba kuyində bir divanə gördünmü
Yarəb, kim ola surəti-bican edən məni
Yıxılmış çünki bir seylabdən viranələr vari
Böylə gər surətdə barik ol nihal eylər məni
Ey odlu nalə, kuçəvü bazar əmanəti
Eşqində ol pərinin əfsanə olmayımmı
Natəvanlıqlar məni, saqi, zəmingir eylədi
Könül, ol sərvi-səbükseyr xüraman oldu
Dilər bütxanəni tərsavü istər Kə`bəni hacı
Qədrini bildim sənin, ey dil, nisar etdim səni
Aparmaz hiç kim əldən məni dildardən qeyri
Olmayınca şərhə-şərhə qanlı bağrım gül kimi
Aşiqəm, aləmdə bir aşiq bulunmaz mən kimi
Əritdi bağrımı həsrət nəzarə, hay, haray
Fələkpeymalığı, ey Nuh, tufan məndən ögrəndi
Kənar tutmağı divanə məndən ögrəndi
Rüunət şaxi-gül, ey sərvi-bala, səndən ögrəndi
Könül, gər ömri-cavidan dilərsən, yar yetməzmi
Zahid gərək bu gün görə ol sərvi-qaməti
Ey ki, hicranında aramü qərarım qalmadı
İkidir gərçi pəriçöhrələrin göftarı
Ey xoş ol günlər ki, könlüm tək hisarım var idi
Mənim şuxi-sitəmkarım təğafüldən usanmazmı
Hicabi-şö`leyi-rüxsarin ab etdi məni

Ümmidvar qılmış ikən bərgü bər məni
Təbibim bir zəman, yarəb, məni-bimarə yetsəydi
Məndə yoxdur hiç can, olsaydı yüz can kaş ki
Bülbül mənim hərayimə yetsəydi kaş ki
Səbr eylə aqibəti mey olur qan dedikləri
Ömrlərdir seydi-navək xürdiyəm, səyyad, hey
Əgər sən böylə bəklərsən bu rüxsar ilə bazarı
Aqibət yavuncıdır yüz min dil ilə dil məni
Gözüm çırağısan, ağlatma zar-zar məni
Nə getdin əldən-ayaqdan, dili-fikarım, hey
Keçmə məndən, saqiya, sərvi-rəvanın sədqəsi
Eylədi sərgəştə Məcnundan betər səhra məni
Çeşmi-məstin hiç kimdə dinü iman qoymadı
Nola gər lütf eyləyib sormazsa bir gün halımı
Əlindən canə yetdim könlümün, dildar yetməzmi
Bahar əyyamı əbr dudi-ahim şö`ləbar etdi
Nə xoşdur, nə xüruş bahardır, hey, hey
Başım üstündən, təbibim, getmə, canın sədqəsi
Rişteyi-canım mənim muyi-miyandır doğrusi
Mənə mümkün degil məqal dili
Nola, yarəb, əgər gələ sevdigim, silə əşki-şərarə fəşanımı
Bəs ki, sərməst etdi vəsl əyyamı dövranın məni
Ağlamaqda şəm tək hərçənd ehmal olmadı
Ol kəbabım kim, məni yandırmamış köz qalmadı
Kəbab ikən məni, saqi, xümar yandırdı

**Tərkibbəndlər**

Ey vay ki, əldən gedərəm yar gəlincə
Əyyami-bahar oldu, fəğan başladı bülbül

## Tərcibəndlər

Ey hay kim, açıldı genə ey həzar, gül
Zahid, dolu camimdəki ləbriz səfadır
Gətir, saqi, qədəh kim, novbahari-eyşü işrətdir

## Müsəddəs-tərcibənd

Gəlin, ey əhli-vərə`, aşqü xummar olalım

## Müxəmməslər

Məni hicr eyləmiş zirü zəbər, vallah-billah
Ey şami-qəmim zülfi-pərişanına qurban
Daneyi-ləbtəşnəyəm, ey əbri-göhərbar, hey!
İstərəm ləli-göhərbarına qurban olum
Məni saldın ayaqdan, ey səbükcövlan, günahım nə?

## Mürəbbe

Könlüm istər kim, ola ol atəşin rüxsarü mən

## Rübai

Ey eşq əmanətində sirdaşım, gəl